


ISSN 0134-3289 (Print)
ISSN 2617-8060 (Online)

# AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ

ELMİ-METODİK JURNAL

**2021, №1 / 267**

## TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE

SCIENTIFIC-METHODICAL JOURNAL

**AZƏRBAYCAN DİLİ və ƏDƏBİYYAT TƏDRİSİ**
Elmi-metodik jurnal. 1954-cü ildən nəşr olunur.
ISSN 0134-3289 (Print) ISSN 2617-8060 (Online)

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 5 may 1997-ci il tarixli Nizamnaməsi ilə təsdiq edilmiş, Azərbaycan Respublikası Mətbuat və İnformasiya Nazirliyində dövlət qeydiyyatına alınmışdır. Seriya AB № 022436, Qeydiyyat № B236

«Azərbaycan dili və ədəbiyyat tədrisi» jurnalı Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası, təbliği və tədqiqi problemlərini araşdırır, tədris prosesində Azərbaycan dili və ədəbiyyat müəllimlərinə elmi-metodik köməklik göstərir. Jurnal ildə dörd dəfə nəşr olunmaqla, Azərbaycan, rus, ingilis və türk dillərində orijinal məqalələrin dərcini həyata keçirir. Jurnal dilçilik və ədəbiyyatşünaslıq, metodika: təcrübə və nəzəriyyə, ümumtəhsil, orta ixtisas və ali məktəblərdə Azərbaycan dilinin və ədəbiyyatın tədrisi, eləcə də qədim, orta və yeni dövr Azərbaycan ədəbiyyatının tədqiqi, poeziya və mətnşünaslıq, ədəbi tənqid və dilçilik məsələlərini əhatə edən bölmələrdən ibarətdir. «Nəşrlər» bölməsində elmi-pedaqoji sahədə yeni nəşr edilən kitablar tanıdılır.

---



**TEACHING of AZERBAIJANI LANGUAGE and LITERATURE**
Scientific-methodical journal. Published since 1954.
ISSN 0134-3289 (Print) ISSN 2617-8060 (Online)

Approved by the Charter of the Ministry of Education of the Republic of Azerbaijan dated May 5, 1997, registered with the Ministry of Press and Information of the Republic of Azerbaijan. Series AB № 022436, Registration № B236

Teaching of Azerbaijani language and literature journal publishes articles consisting of research and practice materials that investigate the problems of teaching, promoting and researching the Azerbaijani language and literature, providing scientific and methodical support to teachers of these disciplines. The journal publishes original articles in Azerbaijani, Russian, English and Turkish. The journal consists of sections covering the topics of linguistics and literary criticism, methodology: pedagogy on practice and theory of Azerbaijani language and literature in comprehensive, secondary, vocational schools and universities, as well as research of ancient, medieval and modern Azerbaijan literature, poetry and linguistics, literary criticism. In the section «Book Review» are presented new books published in the scientific and pedagogical field.

---

# İÇİNDƏKİLƏR / №1, 2021

# CONTENTS / №1, 2021

## L I N G U I S T I C   I S S U E S



## A Z E R B A I J A N I   L I T E R A T U R E
## N I Z A M I   G A N J A V I – 880



## M E T H O D S

## CHILDREN'S LITERATURE



## AZERBAIJANI UNIVERSITIES



## PUBLICATIONS

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 10–22
https://dx.doi.org/10.48445/TAIIJ.2021.99.27.001

**DİLÇİLİK MƏSƏLƏLƏRİ**

# Azərbaycan dilində söyləm nitq vahidi kimi

***İsmayıl Kazımov***
Filologiya elmləri doktoru, professor, AMEA Nəsimi adına Dilçilik İnstitutu, Müasir Azərbaycan dili şöbəsi. Azərbaycan. E-mail: prof.ismayil.kazimov@gmail.com
https://orcid.org/0000-0002-4470-8786

**XÜLASƏ**
Söyləmlər formal cəhətdən nitqin tənzimlənmiş, müəyyən qaydalara tabe edilməmiş vahidləridir. Müasir Azərbaycan dilində söyləm nitq hərəkətinin nəticəsi kimi meydana çıxır. Söyləm cümlə komponentlərinin qrup formasında birləşməsindən yaranır və seqmentə görə cümləyə müvafiq gəlir. Söyləmin təşkili mexanizmi superseqment vasitələrin (intonasiya və söz sırası) iştirakı ilə formalaşır. Məqalədə söyləmin növlərini birləşdirən ümumi cəhətin onların emosionallıq keyfiyyəti bildirməsi də əsaslandırılır. Belə ki, nitqdə söyləmin ən müxtəlif növləri meydana çıxır. Söyləmə xas olan əlamət, yəni onların reaksiya bildirməsi, nitq stimulu olması nitqə məxsus başlıca cəhətdir. Söyləmlər struktur-semantik və məntiqi-praqmatik cəhətlərinə görə müxtəlif növlərə bölünür. Onların quruluşunda, mənasında müəyyən özünəməxsusluq və bir-birindən fərqlilik müşahidə olunur. Tədqiqatda müəyyənləşir ki, söyləm ünsiyyətdə danışığın aktuallaşmış ən kiçik vahididir.

**AÇAR SÖZLƏR**
Funksional-kommunikativ sintaksis, nitq vahidi, söyləm, söyləmin funksiyaları, konseptual-fuksional perspektiv

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 24.11.2020
qəbul edilib: 13.01.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 10–22
https://dx.doi.org/10.48445/TAIIJ.2021.99.27.001

LINGUISTIC ISSUES

# Phrase as a unit of speech in Azerbaijani

***Ismayil Kazimov***
Doctor of Philological Sciences, professor, Institute of Linguistics named after Nasimi of ANAS, Department of Modern Azerbaijani Language. Azerbaijan.
E-mail: prof.ismayil.kazimov@gmail.com
https://orcid.org/0000-0002-4470-8786

**ABSTRACT**
Phrases are formally regulated units of speech that are not subject to certain rules. Phrase appears as a result of speech act in modern Azerbaijani language. Phrase arises from the grouping of sentence components and cor-responds to the sentence by (according to) segment. The organization of phrase mechanism is formed in the presence of supersegment means (intonation and word order). The general aspect that unites the types of phrase in the article based their expression of emotionality feature. Thus, the most different types of phrase appear in speech. A characteristic feature of phrase, that is, their reaction, being a speech stimulus is a main aspect of speech. Phrases are divided into different types according to their structural-semantic and logical-pragmatic aspects. Certain originality and differences from each others are observed in their structure and meaning. Research show that phrase is the smallest actual unit of speaking in communication.

**KEYWORDS**
functional-communicative syntax, speech unit, phrase, function of phrase, conceptual-functional perspective

**ARTICLE HISTORY**
Received: 24.11.2020
Accepted: 13.01.2021

## Giriş / Introduction

XX yüzilin sonu XXI yüzilin əvvəllərində dildə əlverişli bir sistem və sintaktik səviyyədə vahidlərə funksional yanaşma özünü göstərir. Bu zaman həmin yanaşmaları gerçəkləşdirmək üçün effektli strategiyalar – paradiqmatik və sintaqmatik təhlillər aparılır. Bu təhlillər sırasında sistemsentrik və mətnsentrik istiqamətləri də fərqləndirmək lazım gəlir.

Funksional sintaksis dinamik (psixolinqvistik) bir sistemdir. Bu sintaksis iki baza vahidini əhatə edir:

1) sintaktik qayda və qanunlara riayət etmək;

2) əməliyyat aparmaq.

Bunlar bir-birilə qarşılıqlı əlaqədədir. Cümlə isə nəzəri əsas üçün funksional təsnifatda sintaktik qayda və qanundur. Kommunikativ sintaksisdə "söyləm" termini söz birləşməsi və cümlə anlayışlarını ehtiva edir.

Dil müəyyən vahidlər üzərində qurulur. Həmin vahidlərdən biri də sintaktik vahidlərdir. Bu vahidlər dil və nitq vahidləri olmaqla iki yerə ayrılır. Biz bu məqalədə nitq və anlaşma vahidi kimi söyləmdən bəhs edəcəyik.

Sintaksisdə dil və nitq vahidlərinin mənası və funksiyası arasında olan qarşılıqlı əlaqə əslində semantika ilə sintaksisin qarşılıqlı əlaqəsi kimi öyrənilir. Bu qarşılıqlı əlaqədə sintaktik vahidlərin nitq şəraitində funksional imkanları da müəyyənləşir [Zolotova G. Moskva, 1973].

Söyləm (söz birləşməsi) ünsiyyətin əsas fazası olan cümlə və mətnlərin qurulmasındakı rolu ilə də müəyyənləşir. Necə deyərlər, söyləmlər də "funksional dona girə bilir". "Funksionallaşma – bu həmişə dili və nitqi dəyişən dinamik prosesdir. Dil vahidlərinin funksionallaşma sferası – söyləm də mətnlə bağlı məsələdir" [5, s.136].

Qeyd edək ki, funksional sintaksis hazırda müasir linqvistikanın aparıcı istiqamətlərindən birinə çevrilmişdir.

Bəllidir ki, dil nitqin kommunikasiyasının qarşıya qoyduğu müəyyən məqsədə nail olunmasına xidmət edən vasitələr sistemidir. Hər hansı bir dilin funksional qrammatikasının tədqiqi zamanı bu dilin qrammatik formaları və sintaktik funksiyalarının nitqdə yerinə yetirdikləri vəzifələrə görə (semasioloji aspektdə) sistem şəklində ardıcıl təsviri verilir. Dilin, dil vahidlərinin funksional təsviri zamanı iki prinsipdən istifadə olunur:

1) ifadə formasından (vasitəsindən) funksiyalara prinsipi;

2) funksiyalardan ifadə formalarına (vasitələrinə) prinsipi.

Ümumiyyətlə, dil vahidlərinin funksional tərəfi nisbi səciyyəlidir, bu keyfiyyət sonrakı prosesdə meydana çıxır, ona kimi həmin vahidlərin qrammatik-semantik və başqa əlamətləri nəzərdən keçirilir. Müəyyən müddətdən sonra dil vahidləri nitqdə gerçəkləşir ki, bu zaman həmin vahidin funksional aspektlərindən danışmaq lazım gəlir [8, s.70-71].

Ümumi funksional qanunlar və qanunauyğunluqlar sırasına sintaktik vahidlərin nominativ-adlandırma, səciyyələndirmə, kommunikativ, mətnyaradıcı, psixolinqvistik və s. funksiyaları daxildir. Sintaktik vahidlərin funksional tərəfi bu və ya başqa funksiyaları yerinə yetirmə kriteriyaları ilə səciyyələnir.

Rus dilində *"vıskazıvanie"* termini söyləm cümlə olaraq məlumatvermə aktıdır. Söz birləşməsi formasında olan söyləmlər sintaktik nümunə kimi qrammatik əlaqə və sintaktik məna əsasında birləşmiş söz formalarından ibarətdir.

Müasir Azərbaycan dilində söyləmin geniş funksional aspektləri mövcuddur. Bu aspektləri funksional baxımdan öyrənmək üçün onların semantik quruluşunu, formal əlamətlərini, struktur-informativ, struktur-praqmatik əlamətlərini, cümlədəki sırasını, informativ-aktual üzvlənməni, baza modellərini və onların tiplər üzrə semantikasını və s. tədqiq etmək vacib bilinir.

Qeyd edək ki, funksional sintaksisin başlıca problemi çoxplanlı semasioloji relevant vahidlərin, məsələn, söyləmlərin nitq prosesindəki ifadəlilik və dərketmə potensiyasını tədqiq etməkdir. Bu ifadə imkanları açıq və gizli şəkildə olur. Onları axtarıb tapmaq və nitq çərçivəsində izah etmək funksional sintaksisin əsas vəzifələrindəndir.

Nitq söyləmləri dil sistemində – mətndə ən dərin prinsiplər əsasında meydana gəlir, prioritet mətnqurma strategiyaları yaranır. Müasir paradiqmatik (sistemsentrik) və sintaqmatik (mətnsentrik) strategiyalar məhz funksional sintaksisdə analiz olunur.

Söyləmlər dilin funksionallaşmasında iştirak edən mühüm sintaktik vahidlərdəndir. Söyləmin yerinə yetirdiyi vəzifə, onların rolu, nitqdə işlədilməsinin məqsədi və başlıca cəhətləri birləşmənin funksional imkanlarına aiddir. Söyləmin funksiyaları adı altında onların daxil olduğu ən böyük vahidlərin tərkibində oynadığı rol, vəzifə başa düşülməlidir. Söyləmin funksiyaları məna və ünsiyyətin dildənkənar məqsədini birləşdirir [3, s.12-13].

Söyləm müəyyən intonasiya cildinə malik olan, nitqə aid sintaktik vahiddir. Söyləm üçün intonasiya onun yeganə yaşama formasıdır, daha doğrusu, intonasiyanın köməyi olmadan söyləm sintaktik vahid kimi mövcud ola bilməz.

Söyləmə müxtəlif təriflər verilmişdir ki, onlardan ən geniş olanı budur: "Quruluşlarından asılı olmayaraq, söyləmlər aktual (kommunikativ, funksional)

sintaksis çərçivəsində ifadə etdikləri kommunikativ vəzifə, virtual modelin, xətti realizasiyası, dinamik mərkəzlərin bölgüsü, prosodik tərtibat, situativ mənalarla əlaqədar surətdə öyrənilən nitqin məlumat vahididir" [7, s.328].

Nitq məlumat vahidi olmaq etibarilə söyləmlər 5 cəhətlə əlaqədardır və həmin əlaqələr əsasında öyrənilir:

1) kommunikativ vəzifə;
2) virtual modelin xətti realizasiyası;
3) dinamik mərkəzlərin bölgüsü;
4) prosodik tərtibat;
5) situativ məna [1, s.159].

Söyləm minimal sintaktik vahidlərdəndir. Amma dilimizin funksional qrammatikası yazılmadığı üçün söyləmlərə də funksional yanaşma olmamışdır. Yəni bu cür yanaşma ilə söyləmlər hələ də lazımi səviyyədə öyrənilməmişdir.

Söyləmlər quruluşca yanaşı və aralı məsafədə ola bilir. Söyləm həmişə qrammatik modellərə malikdir. Onun komponentləri arasında qrammatik əlaqə ola da bilər, olmaya da.

Deskriptiv dilçilik söyləmlərin başlıca mahiyyətini və funksiyalarını müəyyənləşdirə bilməmişdir. Ona görə ki, söyləmlərə obyektiv arqumentlərdən yanaşılmamışdır.

İsveçrə alimi, dilçi F.de Sössür ilk dəfə söyləmlərin də işarələr sistemi olduğunu bildirərək, onun funksional mahiyyətinə və strukturunun özünəməxsusluğuna toxunmuşdur. Söyləmlər funksional fəaliyyət prosesində fəallaşır və konkretləşdirmə aktını bildirir [N.A.Baskakov].

Söyləmi səciyyələndirən xüsusiyyətlərdən biri budur: söyləm əşyalar arasında ifadə olunmuş keyfiyyət münasibətidir. Bu cəhətdən, o, iki qütbə bölünür: təyin və təyin olunan. Təyin həm isim, həm də feil ola bilər. Söyləm dilin "tikinti materialı"dır və o da söz kimi ümumi dil prosesində iştirak edir, mürəkkəb predmet, fakt və hadisələrin leksik-semantik funksiyasını yerinə yetirir.

**Faktları adlandıran söyləmlər**

Fakt həqiqətən olmuş hadisədir, əhvalatdır. Fəlsəfi anlamda fakt termini gerçəklik, reallıq, həqiqət, olub-bitmiş deməkdir. Məs.: sübut olunmuş fakt, inkaredilməz fakt, tam qələbə faktı, bir fakt, əsaslandırılmış fakt, hər bir fakt və s.

**Hadisəni adlandıran söyləmlər**

İctimai və ya şəxsi həyatda vaqe olan, baş verən hal; əhvalat, vaqiə; həyatın adi qaydasını, normal gedişini pozan iş, qəziyyə və s. Hadisələr müxtəlif olduğu kimi onların adları da rəngarəngdir. Söz kimi söyləmlər də mürəkkəb hadisələri adlandırmağa xidmət edir.

**Proses, gedişat, hərəkət, təsəvvür və s. bildirən söyləmlər**
**Prosesi adlandıran söyləmlər**

"Proses" latınca gediş mənasındadır. Hər hansı bir hadisənin gedişi söz birləşmələrində də öz ifadəsini tapır. Məs.: "bitkinin inkişaf prosesi". Bundan əlavə, söz birləşmələrində müəyyən nəticə əldə etmək məqsədilə görülən ardıcıl işlərin məcmusu da ifadə olunur. Bu zaman prosesi bildirən söz birləşmələri meydana gəlir. Məs.: texnoloji proses, neftçıxarma prosesi və s.

Dilimizdə, tibb elmində xəstəliyin aktiv inkişafını və gedişini özündə əks etdirən xeyli terminoloji birləşmələr formalaşmışdır. Məs.: iltihab prosesi, ilkin proses və s. Həmçinin məhkəmədə işlərə baxılma qaydası, mühakimə üsulu "mülki proses" adlı söz birləşməsinin yaranmasına səbəb olmuşdur.

**Gedişatı adlandıran söyləmlər**

Dilimizdə bir işin, hadisənin inkişafı, cərəyanı bir sıra söz birləşmələrinin yaranmasını şərtləndirmişdir. Məs.: hadisələrin gedişi, xəstəliyin gedişi, inqilabi hərəkatın gedişi, mübarizənin gedişi və s.

**Hərəkəti adlandıran söyləmlər**

"Hərəkət" ərəb mənşəli söz olub, bir şeyin və ya onun hissələrinin sabit bir nöqtəyə görə öz yerini və ya vəziyyətini dəyişməsidir. Bu sözlə bağlı dilimizdə bir sıra söz birləşmələri formalaşmışdır: ritmik hərəkət, dairəvi hərəkət, cismin hərəkəti, yol hərəkəti, hərəkətin proyeksiyası və s.

**Təsəvvürü adlandıran söyləmlər**

"Təsəvvür" ərəb sözü olub, xəyala gətirmə, xəyalən göz qabağına gətirmə mənasında işlənir. Bu məna çaları Azərbaycan dilində bir çox söz birləşmələrini

yaratmışdır. Məs.: oğlunun şəklini xəyalına gətirmək, meşəni təsəvvür etmək, anamın təsəvvürü, adi təsəvvür, qəhrəmanın təsəvvürü və s.

**Söyləmin məna və mənalandırma funksiyası** mahiyyət etibarilə adlandırma və səciyyələndirmə funksiyalarıdır. Burada mənanın təkcə məfhuma yox, eyni zamanda əşyaya münasibəti nəzərdə tutulur. Eyni söyləm şəraitdən asılı olaraq, gah seçilmə-adlandırma, gah da səciyyələndirmə-predikasiya funksiyalarında çıxış edə bilər.

Dilçi S.Katsnelson söyləmə yaxın olan sözün adlandırma funksiyasından belə bəhs edir: "Adlandırma funksiyasında söz müəyyən əşyanı ekstensional tərzdə bildirərək, başqa əşyalardan fərqləndirir. Səciyyələndirmə funksiyasında isə ad intensional işlənərək, məfhumun müəyyən cəhətlərini ayırır və başqa bir əşyaya aid edir [6, s.25-27].

İki söyləm birləşməni nəzərdən keçirək: *yırtıcı heyvan, yırtıcı adam.* Burada birləşmə şəklində olan məfhumun həm adlandırma, həm də səciyyələndirmə funksiyası özünə yer ala bilmişdir. Heyvan və insanın xarakterik cəhəti səciyyələndirmə funksiyası ilə açılır. *İti axan çay, durğun göl, dalğalı dən*iz söyləmlərindəki vəziyyət də eynidir.

**Söyləmin kommunikativ-praqmatik funksiyası**

Dil öz kommunikativ funksiyası ilə insanlara xidmət edir. Təkcə fikrin ifadəsi üçün yox, onların – insanların subyektiv münasibətlərini də, emosiyalarını da, hisslərini, arzu, istəklərini və s. ifadə edir. Belə ekspressiaları nitq zəncirində söz birləşməsi də yerinə yetirir. Daha doğrusu, bu kimi ekspressiyalar söz birləşməsi vasitəsilə də ötürülür. Söz birləşməsi ilə danışanın emosional durumu, onun subyektiv münasibətləri, bir-birinə təsir dərəcəsi, predmet və hadisələrə qiymət və s. verilir. Məs.: mənim fikrim, onun dünyagörüşü, Sevincin arzuları və s.

Yalnız cümlə daxilində və cümlə vasitəsilə söyləmlər dilin kommunikativ vasitələri sisteminə daxil olur. Bu isə onu göstərir ki, kommunikativ funksiya baxımından belə vahidlər "adi" frazeoloji söz birləşmələrindən daha əlverişli olub, danışıq aktında "daha hazır" şəkildə işlədilir.

Söyləmlərin kommunikativ funksiya kəsb etməsi üçün onların komponentləri arasında obyektiv-məntiqi əlaqənin olması zəruridir. Hər bir söz yığını birləşmə əmələ gətirə bilməz. Məs.: "çay çörəyi", "aş traktoru" və s. Bu birləşmələrdə düzgün qrammatik əlaqə olsa da, məntiqi əlaqə ciddi şəkildə pozulmuşdur.

Söyləm kommunikativ sintaksisin əsas anlayışlarından biridir. "Kommunikativ" termini bir neçə mənada işlənir: konkretləşdirici mənada, bu mənada kommunikativliyin kommunikativ-praqmatik və kommunikativ-sintaktik tipləri meydana çıxır.

Söyləmin kommunikativ aspekti, funksiyası nitq fəaliyyəti ilə birbaşa əlaqədardır. "Paradiqma" termini "iş", "hərəkət" mənasında işlənir. Kommunikativ aspekt – nitq aktından, nitq hərəkətindən ibarətdir. Nitq aktının aşağıdakı tipləri fərqləndirilir: konstatasiya, sual, xahiş, müraciət, emosional ifadə və s.

Söyləmin kommunikativ-sintaktik aspekti həm dil, həm də nitqə aiddir. Söyləm – kommunikativ sintaktik vahidi, nitqin kəsiyidir və nitqdə kommunikativ prosesi yerinə yetirir. Söyləmlər fərdi və situativ xarakter daşıyır və nitq aspektində rəngarəngdir. Kommunikativ sintaksis cümlə və söyləmlərin daxili quruluşunu, həmçinin, birləşməni təşkil edən sözlər arasında əlaqə və münasibətin tiplərini öyrənir. Demək olar ki, dil sistemində söyləmə yanaşma "aşağı" səviyyədədir. Konstruktiv sintaksisin ilkin obyekti də söz birləşməsi – söyləmdir. Söyləm yalnız cümlələrin tərkibində cümlə vasitəsi ilə nitqin kommunikativ kateqoriyasına çevrilir" [V.Vinogradov].

Mənanın açılışında kontekstin rolu inkaredilməzdir. Bu barədə dilçi-alim F.Veysəlli yazır: "Deyilənin mənasının başa düşülməsində kontekst mühüm rol oynayır. Kontekst deyəndə, müəyyən məkan və zaman daxilində danışan və dinləyənin söyləmləri, buna münasib etdikləri hərəkətlərində və onların söhbətlərində əks olunan hadisə və predmetlər başa düşülür. Söyləmdə onun aid olduğu məqamı göstərən deyktik elementlər olur. Bu deyktik elementlər situasiyanın müvafiq əlamətlərini əks etdirmirsə, söyləm başa düşülməz. Eyni zamanda, deyilənin başa düşülməsi üçün həmin məqamdan əvvəl olanlar haqqında danışan və dinləyənin müəyyən bilgisinin olması vacibdir.

Söyləmin mənasından o zaman söhbət gedə bilər ki, onun işlənməsi qəti şəkildə kontekstlə müəyyənləşsin. Seçilən imkan söyləmin ifadə etdiyi reallığa tam uyğun gəlir. Bu seçim onu göstərir ki, söyləmlər sözsüz (nonverbal) davranışla qarşılaşma yaradır (mimika, jest, susmaq və s.).

Hər bir cümlənin qarşılığı özü də susmaq, ya da səslənən söyləm şəklində ola bilər. Hətta onun konteksti də bərpa oluna bilər.

Mənalılıq söyləmlərin meydana gəlməsi ehtimalını müəyyənləşdirən kontekst komponentlərini tanımaq qabiliyyətindən asılıdır. Mətndə hər hansı bir elementin işlənməsi onun çox və ya az mənaya malik olub-olmamasından asılı deyil. Element konkret kontekstdə məna ilə yüklənir [4, s.214-217].

Cümlə və söyləm sintaksisin əsas kommunikativ (dinamik) vahididir. Canlı danışıq dili cümlələrdə dil modelləri ilə reallaşır. Ona görə də bir çox söyləm bir sıra əlamətləri ilə kommunikativ vahid kimi şifahi nitqlə sıx şəkildə bağlı olaraq, konkret məlumatları müəyyən mənada çatdırır. Məs.: "Tələbə getdi" cümləsi kommunikativ akt nəticəsində bir sıra sual və cavablar doğura bilər.

– Kim getdi? – Tələbə; – Tələbə getdi? – Getdi; – Nə yenilik var? – Tələbə getdi və s.

Sual və cavablar müxtəlif olur. Belə bir informasiyanın çatdırılmasında məlumatvermə, məntiqi vurğu, intonasiyanın müxtəlif tipləri (temp, melodiya, tembr və s.) əsas rol oynayır. Cümlənin aktual üzvlənməsi meydana çıxır. Ənənəvi sintaksisdən fərqli olaraq cümlədə – mətndə tema-rema ardıcıllığı meydana çıxır. Temanın funksiyası mübtəda ilə bağlı, remanın funksiyası isə xəbərlə bağlı yaranır.

Söyləmin başqa bir funksiyası kommunikativlikdir. O, yalnız cümlənin tərkibində kommunikativ funksiyanı yerinə yetirir və bir dil vahidi kimi cümlənin təşkili mexanizmində əsas rol oynayır. Bu funksiya kommunikativlik və ya tema-rema funksiyası da adlanır. Həmin funksiya aktual üzvlənmə nəzəriyyəsi ilə sıx şəkildə bağlıdır.

Söyləmin kommunikativ funksiyasına aktual sintaksisin nailiyyətləri baxımından yanaşılmalıdır. Burada söz birləşməsinin tərkibindəki söz sırası, məzmun elementləri (məlumat predmeti-müvafiq kommunikasiya vahidinin çıxış nöqtəsi olan element (məlumat əsası) və məlumatı inikas etdirən element, yeni məlumatı dinləyiciyə çatdıran element (məlumatın nüvəsi).

Söz birləşməsində çıxış nöqtəsi-məlum olan və ya tema və yeni məlumat-rema. Kommunikativ üzvlənmə – formal-qrammatik üzvlənmə. Məs.: böyük bina – birinci növ təyini söz birləşməsində birləşmənin asılı-birinci tərəfinə "hansı?" sualını vermək olur. Məlum olunan, yəni birləşmədə yeninin sərhədlərini müəyyənləşdirmək üçün suallardan istifadə olunur. Bu zaman əlavə vasitələrdən, məntiqi vurğunun yardımından da istifadə oluna bilər. "Bina böyükdür" şəklində cümləyə çevrilmə "perspektiv"liyi ilə fərqlənir. Cümlənin tərkibində, mətnin içərisində bu tip söyləmlər adlandırma funksiyası ilə yanaşı, mətnin aktual üzvlənməsi kimi də özünü göstərir.

Tema-rema münasibətində söz birləşməsi funksionallıq qazanır. Bu tip söz birləşməsi mikromətndə "təbiət" temasını yaradır: "Meşə yolu dağ çığırları ilə dolu idi. Dağ çığırları ağaclar arasından burulur, aşağılara – çayın sahillərinə doğru uzanırdı. Meşə yolları hündür qayalara səmt idi. Bu yollar yuxarılarda kəsişirdi".

## Söyləmin psixolinqvistik funksiyası

Söyləmlərin psixolinqvistik funksiyası birbaşa kommunikativ akt şəraiti ilə bağlıdır. Bu zaman fərddə – istifadəçidə bir sıra hallar baş verir və dilin sintaktik vahidlərindən istifadə etmək bacarığı formalaşır. Bu zaman eyni bir söyləmdən istifadənin kontekstual fərqliliyi meydana çıxır. Məsələn, fərdlərin feili söyləmlərdən sinonim, variant və paralel olaraq işlətmələri psixolinqvistik tədqiqatlarda qeyd olunur. Fərdin biri, məsələn, "telefonla demək", digəri "telefonla danışmaq" strategiyasına üstünlük verir, bu formaların hər hansı birinin fərd tərəfindən işlənməsi nitqin şəraiti, situasiyası ilə əlaqədar meydana çıxır. Müəyyən psixoloji məqamda lazım olan söyləmin (söz birləşməsinin) yerinə həmin mənanı özündə birləşdirən leksik vahiddən də istifadə olunur ki, bu zaman kontekstual (mətni) fərqliliklər yaranır. Məs.: bir aya başlamaq – bir ay müddətində başlamaq – başlamaq; tədarük görmək – hazırlaşmaq və s.

Göründüyü kimi, fərdlər tərəfindən müəyyən strukturlar (söyləm və leksik vahidlər) mənimsənilir. Burada "kommunikantların məzmun intensiyalarının dil formalarında təcəssüm etdirilməsi haqqında da təsəvvür yaranır. Bunun üçün söyləm törəməsinin dayaz və dərin səviyyələri məfhumu tətbiq edilir. Bununla əlaqədar olaraq, qeyri-nitq davranışından fərqli olan xüsusi nitq davranışı statusu qəbul edilir" [Ə.Rəcəbli].

Söyləm söz, cümlə kimi nitqin elementidir. Nitq prosesində müəyyən bir cümlə – söyləmə daxil ola bilən nitq elementi – söz birləşməsi əvvəldən planlaşdırılmış əsas cümlə strukturuna daxil ola bilmir, sanki qəflətən yada düşən vacib element kimi əsas cümləyə əlavə edilir – qoşulur. Nitqin psixoloji cəhətdən bu cür qurulması qoşulan hissənin semantik zəifliyinə deyil, əksinə, aktuallaşmasına səbəb olur. Nitq prosesində yaranan bu cür əlaqəli cümlələrdən birincisinə əsas (özül) cümlə, sonrakına isə qoşulma konstruksiya deyilir. Qoşulma konstruksiyalar bir çox hallarda bir özül cümlənin bölünməsi, parçalanması əsasında əmələ gəlir. Ona görə də dilçilikdə bu hadisəyə "parselyasiya", qoşulma konstruksiyalara isə "parselyat" da deyilir [2, s.237]. Parselyatlar həmin məqamda söyləmlərdən də ibarət olur. Məs.: Səidənin o biri yanında Leyla yatırdı. *Ramazanın qızı.* Burda "Ramazanın qızı" söz birləşməsi mətndə parselyatdır, əvvəlki cümləyə qoşulduğu üçün qoşulma yarımçıq cümlə funksiyasını yerinə yetirmişdir.

"Söyləm" bir termin kimi çoxsahəlidir. Cümlənin nitqdə gerçəkləşməsi söyləm adlanır. Söyləmi hər hansı bir nitq vahidi kimi də işlətmək olar. Biz burada "söyləm" terminini cümlənin struktur invariantı mənasında da işlədirik. Söyləm nitqdə reallaşır.

Dilçi K.Seqal söyləmi həm linqvistik, həm də psixolinqvistik vahid hesab edir. O, söyləmin leksikləşməsini psixolinqvistik hal sayır. Söz birləşməsinin leksikləşmə mexanizmi prosesi hər şeydən öncə koqnitiv-praqmatik faktlara əsaslanır. Söyləm danışanın niyyət və məqsədinə müvafiq olaraq hər dəfə yenidən yaradılır. Dil arasıkəsilməz söyləm yaradıcılığı axını kimi də fəaliyyət göstərir. Söyləmlərin (ismi və feili) formalaşması prosesi assosiasiyaların psixi qanunları ilə idarə edilən təsəvvürlərin əmələ gəlmə proesidir.

Söyləmin leksikləşməsi məhsuldar dil prosesidir, dilin koqnitiv strategiyasını daşıyır. Bu leksikləşmə ənənələri əks etdirir. Sintaktik strukturun leksikləşməsi kiçik formatları yaradır. Bu bir qanunauyğunluqdur.

Psixolinqvistik təhlil əsasında bir sıra işlərin görülməsi nəzərdə tutulur:

– söz birləşmələrinin funksional mənalarını üzə çıxarmaq;

– mətnin dərk edilməsində (anlanmasında), qavranılması prosesində söz birləşməsinin rolunu təyin etmək;

– mətnin struktur komponentlərinin əlaqəsini, bir-birinə təsirini üzə çıxarmaq (psixolinqvistik təhlil əsasında);

– nitq fəaliyyətinin tərkibində gedən "psixoloji əməliyyat"da söz birləşməsinin mövqeyini açıqlamaq;

– psixolinqvistik sferada söz birləşməsinin nəzəri və tətbiqi xarakterini açmaq, müəyyənləşdirmək;

– mətnin məna strukturunu modelləşdirmək, mətn konseptini söyləm əsasında dəqiqləşdirmək;

– söyləmin psixolinqvistik funksionallığını meydana çıxarmaq; bu zaman L.S.Vıqotskinin, A.Neontevin, A.R.Luriyanın psixoloji məktəblərinə əsaslanmaq, bunların baza rolunu nəzərə almaq;

– nitq mexanizminin qurulmasında, funksionallaşmasında söz birləşməsinin rolunu nəzərə almaq;

– mətnin semantikasını söyləmlərə əsaslanaraq eksperiment yolu ilə öyrənmək;

– mətndəki söyləmlər psixolinqvistik istiqamətdə təhlil edilərkən, ona (yəni mətnə) bir hazır məhsul kimi (hər hansı bir forma kimi), konsept kimi yanaşmaq (həmin formaların reprezentasiyası), yəni xüsusi mətnlərin məna strukturunda terminoloji söz birləşmələrinin (elmi mətnlərdə) rolunu üzə çıxarmaq.

Çünki terminoloji söz birləşmələri mətndəki fikrin, mənanın qavranılması prosesində funksional baxımdan müəyyən rol oynayır.

## Söyləmin mətnyaradıcı funksiyası

Söyləm mürəkkəb sintaktik bütövlərdə kataforik vasitə rolunda çıxış edir. Katafora mətn daxilində sonra gələcək məlumata işarə edən dil elementidir. Bu funksiyada, adətən determinativlər və əvəzliklər çıxış edir

Söyləm mürəkkəb sintaktik bütövlərdə anaforik vasitə rolunda çıxış edir. O, eyni sözün və ya söz qrupunun bir neçə ardıcıl gələn, paralel düzələn sözlərin, söz qruplarının əvvəlində təkrarıdır. Müvazi nitq parçalarında söz birləşməsi təkrar edilir. Anafora mətnin əvvəldə gedən informasiyasıdır. Söyləm mürəkkəb sintaktik bütövlərdə təkrar edilir. Məs.: *Axır vaxtlar* gözə dəymirdi. *Axır vaxtlar* heç həyətə də çıxmırdı. *Axır vaxtlar* anası da evə gəlmirdi [K.İsmayıl].

Söyləm mürəkkəb sintaktik bütövlərdə korkataforik və korkanaforik vasitə rolunda çıxış edir.

Söyləmin mətnyaradıcı imkanları "universal diskurs"un əhatəsində də üzə çıxır. Bu əhatədən biri mətnin başlanğıcının və sonunun nişanlanmasının müxtəlif üsullarıdır.

Universal diskursların bir qismini mətndən asanlıqla seçmək olar. Məsələn, barəsində danışılan personaj sonra gələn cümlədə, yaxud abzasda şəxs əvəzliyi (o) ilə göstərilir. Bu vəziyyətdə mətn parçaları arasındakı bağlılığı, əlaqəni digər vasitələr də yarada bilir. Bu vasitə söyləmdir (söz birləşməsidir). Məsələn, personajın adı əvəzinə onun haqqındakı məlum informasiyadan istifadə edilir. "Onların kürəkəni", "Səmədin şeiri", "qonşunun oğlu" və s. kimi söyləmlər (söz birləşmələri) ilə başlanan mətn parçalarında nişanlama ya əvvəlki hissələrdə, ya da sonrakı hissələrdə açılır. Belə nişanlanma əslində kogeziya vasitəsilə tam aşkarlanır. Yəni, onların mətnyaratmada xüsusi element kimi ayrılması distant, yaxud kontakt kogeziyanın xüsusi hallarının nəzərdən keçirilməsinə gətirib çıxarır. Beləliklə, söyləm nitq aspektində fərdi və situativ xarakter daşıyır.

## Nəticə / Conclusion

Dilçiliyin müasir inkişaf səviyyəsində, nitqin təşkilində mühüm rol oynayan söyləm (fraza) problemi supraseqment səviyyədə öyrənilməkdədir. Söyləm əsas etibarilə dialoq nitqinin funksiyası olub, həmsöhbətlər arasında "ünsiyyət vasitəsi"dir, necə deyərlər, kommunikasiyanın aktuallaşmış vahididir. Hər bir dil faktı kimi söyləmin məzmun və ifadə planı müasir Azərbaycan dilində az öyrənilmişdir. Tədqiqatın nəticələri göstərir ki, söyləm müəyyən nitq şəraitində dinləyici tərəfindən dərk edilə bilən və məna (fikir) bütövlüyünə malik ünsiyyət vahididir. Söyləm

ünsiyyət aktını ifadə edir və aktual sintaksisin başlıca vahididir. Tədqiqatın nəticələri göstərir ki, söyləm cümlədən predikasiyasına görə fərqlənir (cümlənin sintaktik statusu), spesifik situasiyaları, məqamları, dildə məzmun və ifadə dəyişmələrini, dil və nitq vahidlərinin başqa şəklə düşmələrini və s. öyrənir. Söyləm dil və nitq vahidləri ilə üzə çıxan mümkünlük, həqiqilik, doğrululuq, mümkünsüzlük kimi modal mənaları və s. ifadə edir. Ona görə də söyləm dilin semiotik sistemində işarə səciyyəlidir. Tədqiqata əsasən məlum oldu ki, nitqdə söyləmlərin ən müxtəlif formaları işlənir ki, bunlar üzvlənmir və qrammatik struktur təşkil edə bilmir. Söyləm adı ilə linqvistikada tanınan bu ifadələr nitq stimulu-reaksiyatörədicilik yaradır, ona görə də onların reaksiya (təşviqetmə mənasını) bildirməsi, nitq stimulu olmasının öyrənilməsinin aktuallığını ortaya qoyur.

Nəhayət, orta məktəblərin Azərbaycan dili və Ədəbiyyat fənlərinin tədrisində şagird nitqinin stimullaşdırılmasında – təşviqedilməsində, mətnlərin təhlilində söyləm mövzusunun önə çəkilməsi xüsusi ilə əhəmiyyətlidir. Öyrənilən material göstərir ki, söyləm problemi ana dilimizdə ən mübahisəli məsələlərdəndir və hələ də ətraflı və dolğun biçimdə təhlil olunmamışdır. Buna görə də söyləmin nitqlə bağlılığı probleminin daha ətraflı öyrənilməsinin perspektivləri gələcəkdə yeni araşdırmalar tələb edəcəkdir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Axundov A. (1978). Ümumi dilçilik. Bakı, Maarif. 254 s.
2. Kazımov Q. (2000). Müasir Azərbaycan dili. Sintaksis. Bakı, Ünsiyyət. 166 s.
3. Müzəffəroğlu T. (2002). Müasir Azərbaycan dilində mürəkkəb cümlənin struktur semantikası. Bakı, Azərnəşr. 304 s.
4. Veysəlli F.Y. (2013). Dilçiliyin əsasları. Bakı, Mütərcim. 417 s.
5. Bondarko A.V. (1984). Funktsionalnaya grammatika. Leningrad, Nauka. 136 s.
6. Katsnelson S.D. (1965). Soderzhaniye slova, znacheniye i oboznacheniye. Moskva. 110 s.
7. Serebrennikov B.A. (1972). Obsheye yazykoznaniye. Vnutrennyaya struktura yazika. Moskva, Nauka. 564 s.
8. Slyusareva N.A. (1981). Problemi funktsionalnogo sintaksisa sovremennogo angliyskogo yazika. Moskva, Nauka. 208 s.
9. Zolotova G. (1973). Ocherk funktsionalnogo sintaksisa russkogo yazika. Moskva, Nauka. 352 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 23–29
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.002

DİLÇİLİK MƏSƏLƏLƏRİ

# Dil təliminin nəzəri problemləri

***Vaqif Qurbanov***
Pedaqogika elmləri doktoru, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: qurbanov.43@mail.ru
https://orcid.org/0000-0001-7665-3938

**XÜLASƏ**
“Dil təliminin nəzəri problemləri” geniş mövzudur. 2008-ci ildən kurikulum dərsliklərinin tətbiqi ilə başlanan yeni kursun didaktik üstünlükləri olduğu kimi, təəssüf ki, qarşıya çıxan subyektiv çətinlikləri də var. Üstünlüklərini müəyyən edən nitqəyönümlülüklə nəticəyönümlülükdür ki, onun da başlıca şərti 4 məzmun xəttinin nitq mədəniyyətinə çevrilən − bacarıq və vərdişlər, nəticə etibarilə səriştə, qabiliyyət məsələsidir. Bu cəhət xüsusi olaraq dəyərləndirilməlidir. Bu sahədə problemlərimiz də var. Məktəblərimiz dərsliklərə yazılmış metodik vəsaitlərlə, hər bir məzmun xəttinin standartlarının gerçəkləşdirilməsi ilə işləyirlər. Lakin qeyri-ixtisas sahibləri bu işə qarışmaqla Ana dili, Azərbaycan dili, habelə dil və dilçilik, dil və nitq sindromunu qıra bilməyərək, sadəcə bu xətt – hərəkata mane olurlar. Problematikliyin digərləri də məhz mətn üzrə oxu və nitq bacarıqlarına yalnız ədəbiyyat fənninin obyekti olması kimi baxılmaqla və digər səhv streotiplərlə əlaqədardır. Məqalədə həmin nəzəri problemlərdən bəhs olunur.

**AÇAR SÖZLƏR**
ifadə, inşa, nitq inkişafı, ənənəvilik, müasirlik, səriştə, mətn, həyati bacarıq, kurikulum təlimi

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 11.01.2021
qəbul edilib: 17.02.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 23–29
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.002

**LINGUISTIC ISSUES**

# Theoretical problems of language teaching

***Vagif Gurbanov***
Doctor of Pedagogical Sciences, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: qurbanov.43@mail.ru
https://orcid.org/0000-0001-7665-3938

**ABSTRACT**
"Theoretical problems of language teaching" is a wide topic. In addition to the didactic advantages of the new course, which started with the introduction of curriculum textbooks in 2008, unfortunately, there are also subjective difficulties. It is speech orientation and result orientation that define these advantages. Their main condition consists of 4 contents. These are skills, habits, competencies and ultimately, turned into a culture of speech ability. These are skills, habits, competencies and ultimately, abilities that have become a culture of speech. These aspects are especially valued. There are also some issues. Schools work with standard, methodological aids, but non-specialists are not able to break the language and speech syndrome of the Azerbaijani language by interfering in this work, they simply hinder this movement. Another problem is related to the fact that reading and speaking skills in the text are perceived only as the main object of the literature subject and with erroneous stereotypes. These theoretical problems are discussed in the article.

**KEYWORDS**
expression, essay, speech development, traditionalism, modernity, competence, text, vital skills, curriculum training

**ARTICLE HISTORY**
Received: 11.01.2021
Accepted: 17.02.2021

## Giriş / Introduction

Haqqında bəhs etdiyimiz mövzu ilə sistematik olaraq məşğuluq və bu mövzu dil təlimi metodikasının aktual problemlərinə dair monoqrafiya, dərslik və dərs vəsaitlərində də araşdırılmışdır. Ədəbiyyatdan da müəyyən etmək olar ki, bu tədqiqat mövzusunun problematikliyi bizi çoxdan düşündürür. Məktəb kursu üzrə Azərbaycan dili, mətn, dil və dilçilik, ifadə və inşa, habelə ***dil təlimi*** kimi terminlər, o cümlədən ***Azərbaycan dili fənni*** kimi inteqrativ ad düzgün dərk olunmadığından, müəllimlər ya səthi, ya da səhv istiqamətdə fəaliyyət göstərirlər. Məqsədimiz bu stereotipi dağıtmaq və fikrimizi həmkarlarımızla bölüşməkdir. Fikrimiz isə, təxminən bunlardan ibarətdir:

1. Azərbaycan dilindən məktəb kursu ədəbi dilin normalarını, o cümlədən oxu və yazı normalarını ***dilçilikdən*** alır, imla, ifadə və inşa strategiyaları ilə şagirdləri ana dilində mədəni nitqə yiyələndirmək məqsədini həyata keçirir. Əlbəttə ki, bu strateji xətt həmişə belə qoyulub. Lakin axıra qədər düzgün anlaşılmayıb, yaxud da dərk olunmayıb. Halbuki məqsəd gənc nəsli ədəbi dilin normaları əsasında mədəni nitqə yiyələndirməkdən ibarətdir.

2008-ci ildən fəaliyyətdə olan Azərbaycan dilindən fənn kurikulumu öz məzmun xətlərinə və standartlarına uyğun olaraq, ənənəvi təlim proqramından çox fərqli tərtib edilmişdir. Belə ki, dilin ictimai funksiyası ünsiyyət vasitəsi olduğundan, dərsliklər əsas mətn və dinləmə mətn nümunələri ilə diqqəti cəlb edir. Əsas mətn nitq danışıq nümunəsi deməkdir. Yəni ana dilində mətn bir danışığın nümunəsidir ki, oxu, yazı və dil qaydaları da onun üzərində aparılır. Məsələn: "Mübariz", "Əlif Hacıyev", "Yusif Məmmədəliyev" və s. mətnlərini götürək. Bu mətnlər ədəbi parça olmaqla, mədəni nitq və ünsiyyət qurmaq üçün nümunələrdir ki, üzərində məntiqi, ifadəli oxu həyata keçirilir. Bunların üzərində iş leksik, fonetik, qrammatik – üslubi işlər, habelə dinləmə, anlama və danışma, oxu, yazı və dil qaydaları məzmun xətlərinə uyğun şəkildə icra olunur. Müəllim üçün nəzərdə tutulan metodik vəsaitlərdə bu əsas mətnlərin motivasiyalarından başlamış, qiymətləndirməyə qədər zəruri istiqamətlərin nümunələri verilir [Qurbanov V. Bakı, 2014].

Dörd müstəqil xətt üzrə qurulan bu məzmun xəttindən əlavə, süni yükləmələr olmasa, müəllimlər interaktiv – inteqrativ prosesdən zəruri nəticələrə gəlirlər. Mətnlə başlayan Azərbaycan dili dərsi yeni analoji mətn qurmaqla tamamlanmalıdır. Hesab etsək ki, əsas mətn ifadədir, o zaman ona uyğun qurulan yeni mətn ifadə də ola bilər, inşa da.

İfadə yazı konkret bir mətnin məzmunu kənara çıxmadan, şagird tərəfindən yenidən geniş və ya qısa – yığcam şəkildə qurulmuş olandır. İnşa yazı isə əsas mətnin məzmununa müvafiq suallarla münasibət bildirilməsi və ifadənin inşaya çevrilməsidir [Qurbanov V. Bakı, 2019].

Dərsliklərdə verilən hər bir mətn bu şəkildə münasibət bildirməklə yazılırsa və onun haqqında danışılırsa, buna inşa strategiyası deyilir. Azərbaycan dilindən təlim işini bu cür qurmaq üçün dil təliminin qanunu olmalıdır. İnşa da dil təlimində və ya nitq inkişafında zirvə sayılır. Ona həyati bacarıq və ya səriştə də desək, səhv etmərik. Elə isə bu cür kurikulum təliminin nəyi bizi qane etməsin?!

2. Dil qaydaları ilə bağlı olan məsələni araşdıraq. Ənənəvi təlimdə olduğu kimi, yenə də Azərbaycan dili fənnini yalnız Azərbaycan dilçiliyi hesab edənlər və anlayanlar dövlətin təhsil standartının bu şəkildə qurulduğundan, bu cür təlim metodologiyasının Qərbdən əxz olunduğundan bixəbərdirlər. Halbuki on ildən çoxdur ki, bu cür tərtib olunan Azərbaycan dili dərslikləri ilə işləyirik. Orta məktəb müəllimləri kurikulum dərsliklərinin interaktiv metodlarla işləmək didaktikasında qurulduğunu artıq anlayıblar. Belə olduğu halda, şagirdlər mətn, yəni nitq nümunəsi əsasında tədqiqata qoşulmaqla, birgə tədqiqatlar aparmaqla, dil haqqında elmə, ədəbi dilin normalarına yiyələnirlər. Bəzi konservativ düşüncəli dilçi və hətta dilçi-metodist alimlər isə bu şəkildə dil təliminə və ya təhsilinə əngəllər yaradır, bakalavr tələbələri və magistrantları çaşdırır, interaktiv və inteqrativ kurikulum təlimini və yeni sistemi bəyənmədiklərini açıq-aydın deməkdən çəkinmirlər: “Bu fənnin evini yıxıblar”, “Burada dil qaydaları yoxdur” – deyirlər. Çünki onlar dil təlimi deyəndə, yalnız dil qaydaları məzmun xəttini nəzərdə tuturlar. Onlar bu cür düşünür ki, Azərbaycan dili fənni ali məktəblərdə öyrənilən “Azərbaycan dilçiliyi” və “Müasir Azərbaycan dili” fənləri kimi öyrədilməlidir. Azərbaycan dilindən məktəb kursunda imla, ifadə, inşa, lüğət üzrə iş və s. kimi nitq inkişafı həyata keçirilməməlidir.

3. Bəzi müəllimlərin yeniliyə qarşı çıxmağının səbəbini bu iki amillə bağlı olduğunu görürük:

1) yenidən qurula bilməməkdə, müasirliyi dərk etməməkdə;

2) üzərlərində nəzarəti və məsuliyyəti hiss etməməkdə.

Həmkarlarımıza konkret olaraq bunları bildirmək istəyirik: konservatorlar ya gərək yeni təhsil fəlsəfəsini mənimsəyə bilmədiklərini etiraf etsinlər, ya da necə deyərlər, bir növ axına qarşı üzməsinlər. Axına qarşı üzənləri də, həvəslə, şövqlə işləyənləri də çaşdırmaq, həvəsdən salmağa yol vermək olmaz. Biz onları pedaqoji təcrübə keçən tələbələrimizin dərslərinə dəvət edirik. Gəlib tələbələrimizin kurikulum

qaydası ilə necə yüksək səviyyəli sınaq dərsləri keçdiklərinin, həyati bacarıqlar aşıladıqlarının şahidi olsunlar.

4. Orta məktəbdə Azərbaycan dili təlimi ilə ali pedaqoji təhsildə Azərbaycan dili və ya Ana dili fənləri arasındaki fərqli cəhətlər illərdən bəri hökm sürdüyü üçün, səhv stereotiplərin yaranmasına səbəb olub. Həmin fənlərdən orta məktəbdə tədris proqramının tərkibində imla, ifadə və inşa var [Qurbanov V. Bakı, 2019]. Ali məktəbdə tədris olunan proqrama isə imla, ifadə və inşa daxil deyil. Nə üçün? Bəs nə var? Ali məktəbdə bu fənlər dilçilik kimi öyrədilir, bu isə kökündən səhvdir. Ancaq səhv olduğunu sübut edə bilirikmi? Ali pedaqoji təhsildə Ana dili fənnindən dilçilik təlimi kimi istifadə olunur. Bu səbəbdən proqramlara yenidən baxılmasını təklif edirik. Başqa dillərdə, məsələn, rus dilində ***"родной язык"*** ifadəsindən vaxtilə ibtidai təhsildə istifadə edilmişdir. İndi isə birinci sinifdən başlayaraq öyrədilən ***Русский язык*** var. Bizdə isə ali pedaqoji təhsildə bu ifadədən kor-koranə istifadə olunur.

Azərbaycan dili fənn olaraq inteqrativ anlayışdır. O, əlifba, hüsnxətt, oxu, dil qaydalarını özündə birləşdirərək, uğurla işlənir. **Azərbaycan dili** fənn olaraq – dövlət dilinin adını əks etdirir. Azərbaycanın dövləti, Azərbaycanın dövlət dili, Azərbaycanın dövlət bayrağı, Azərbaycanın dövlət himni.

Demək, Azərbaycan dilinə danışıq zamanı ***ana dili*** deyə bilərik. O zaman ana dili fənn mənasını verməyəcəkdir.

5. Dil mədəniyyətindən danışarkən tədqiq olunub normalara salınan, qaydalarla ifadə olunan anlayışları nəzərdə tuturuq. Məsələn: dilimizin ahəng qanunu belədir: sözdə incə saitlərin incələri, qalın saitlərin qalınları izləməsi; fonetik hadisələr, yəni deyilir *səkgiz*, yazılır *səkkiz*, deyilir *dokquz*, yazılır *doqquz* və s.

Dilin öz üslubları var. Mədəni dillərdə olduğu kimi, bizim dildə də bu üslublar işlənir. Üslublar praktik və funksional olaraq iki növə bölünür:

✓ Praktik üslublar: Məsələn: beş şagird deyilir, beş şagirdlər – deyilməz; fanar – fənər, varaq – vərəq, şam – şəm və s. kimi sözlərin kontekstə uyğun işlənmə halları var, atəş – od, alov, yanğın; ürək – könül, qəlb – dil (məsələn, canı-dildən, başqasına dil verib, dilşad olmaq və s.); boy – qamət, üz – sifət, qovun – yemiş, boranı – balqabaq, xiyar – yelpənək və s. sözlər də kortəbii deyil, kontekstə uyğun işlənə bilir. Uyğun işlənmədiyi halda bu praktik üslubi məqamın pozulması və ya üslubi səhv hesab edilir.

✓ Funksional üslublar: bədii, elmi, kütləvi, məişət və rəsmi-işgüzar sözlər və ifadələr özlərinə məxsus funksionallıqla fəaliyyət göstərirlər.

6. Müəllimlərimizə inşa ilə bağlı bir həqiqəti xatırlatmaq istərdik. Ənənəvi təlim proqramında ədəbiyyat kitablarında inşa nümunəsi kimi "Xosrov surəti", "Şirin surəti", "Hacı Qara surəti", "Tükəz surəti", "Abşeron romanının təhlili", "Ölülər pyesinin təhlili" və s. inşa nümunələri verilərdi. Şagirdlərə də həmin nümunələrdən istifadə əsasında inşalar yazmaq tələb olunardı. Kurikulumun tətbiqinə qədər nümunələr əsasında inşa yazmaq ənənəvi şəkil almışdı. Elə isə sual olunur: başqasının yazdığı əsasında yazılan yazı ifadə deyilmi? Ümumiyyətlə, ifadə necə olur? Bəs onu nə üçün inşa hesab etmişik. Konspektlər hazırlayıb boynumuzdan asdığımız yazılar özgəsinin məhsulu deyildimi? Bizim onu olduğu kimi yazmağımız nə üçün inşa sayılmalı idi?

Şagirdə inşanın özü yox, mövzusu verilər. Özü verilən isə ifadədir. İfadəni inşaya çevirmək, yəni onu sərbəst suallarla rəngləndirmək və inkişaf etdirmək isə panellərlə qurulan inşaatdır və yaxud da inşadır. İnşa həm yazılı, həm də şifahi ola bilir. O yalnız bədii üslubda deyil, bütün üslublarda – elmi, publisistik, rəsmi-işgüzar və məişət üslublarında ola bilir.

**Nəticə / Conclusion**

Azərbaycan dilindən fənn kurikulumu çevik təfəkkür və inkişafetdirici təlimlə işləməyi tələb edir. Bu səbəbdən orta və ali-pedaqoji təhsildə çalışan müəllimlər kurikulum metodologiyasına və ya fəlsəfəsinə nəzəri cəhətdən yiyələnməlidirlər. Bu, həyatın qaçılmaz tələbidir. Linqvodidaktlar və ya linqvometodistlər bu məsələlərə daha diqqətlə yanaşmalı və müəllimlər üçün hazırlanan metodik vəsaitlərdə mövzu ilə bağlı aydın şərhlər verməlidirlər. Avropa təhsilindən əxz olunanları bəzən treninq keçənlərin özləri belə, nəzəri cəhətdən sonadək dərk etmirlər. "Azərbaycan dili və ədəbiyyat tədrisi" jurnalı redaksiyası da məktəb və müəllimlərə kömək etmək məqsədi ilə bu cür nəzəri məsələlərlə bağlı mütəxəssisləri redaksiyaya dəvət edib, konfranslar keçirsə, həmçinin bu məqalədə qaldırılan məsələlərə aydınlıq gətirsə daha məqsədəuyğun olar.

## İstifadə edilmiş ədəbiyyat / References

1. İsmayılov R., Cəfərova D., Məmmədova S. (2015). Azərbaycan dili (6-cı sinif üçün dərslik). Bakı, Altun Kitab. 192 s.
2. Kurikulumların hazırlanması və tətbiqi məsələləri. (2008). Bakı, Kövsər nəşriyyatı. 224 s.
3. Qurbanov V. (2014). Azərbaycan dilinin tədrisi metodikası. Bakı, Müəllim nəşriyyatı. 258 s.
4. Qurbanov V. (2019). Azərbaycan dili təlimi predmetlərinə dair. Bakı, Müəllim nəşriyyatı. 204 s.
5. Qurbanov V. (2019). Esse və digər yaradıcı yazı (məzmun, forma və metodika). Bakı, Müəllim nəşriyyatı. 232 s.
6. Pedoqoji terminlərin izahlı lüğəti. (2018). Dərs vəsaiti. Bakı, ADPU. 156 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 30-40
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.004

**DİLÇİLİK MƏSƏLƏLƏRİ**

# Postmodernizm dövründə Azərbaycanın dil situasiyası

***Cahid Kazımov***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, AMEA Nəsimi adına Dilçilik İnstitutu. Azərbaycan.
E-mail: cahid@ismayiloglu.com
https://orcid.org/0000-0002-3955-4065

**XÜLASƏ**
Başqa mövzular (*dil siyasəti, dilplanlaşdırma* və s.) kimi *"dil situasiyası"* aspektindəki sosiolinqvistik tədqiqatlar mühüm ümumsosioloji önəm daşıyır. Onun üçün böyük əhəmiyyət daşıyır ki, dil sosial həyat mühitinin demək olar ki, çox tərəflərini əks etdirir. Bu sahədə metodik üsullar ondan ibarətdir ki, bütövlükdə inzibati-ərazi sektorunda yad dilin funksionallaşma meylləri və dil siyasəti, həmçinin dil situasiyasının müxtəlif tiplərinin təhlili və s. məsələlər tədqiqat obyektini təşkil edir. Məqalədə sosiolinqvistikanın "İnsan və dil" problemi birdillilik və çoxdillilik şəraitində şərh olunur. Bilinqivizm şəraitində yaşayan və fəaliyyət göstərən insanın davranışına, əlbəttə, dil birinci növbədə təsir göstərir. Bu, əsas etibarilə psixoloji problemdir. Müasir Azərbaycan ədəbi dilinin inkişaf xarakteri (demokratikləşmə) və perspektivləri sosial və dil situasiyası müstəvisində səciyyələnir. Məqalədə müasir dil situasiyası postmodernizm kontekstində təhlil olunur. Müasir Azərbaycan ədəbi dili və yeni dil situasiyası müstəvisində qarşılıqlı əlaqələrin başlıca özəllikləri aydınlaşdırılır.

**AÇAR SÖZLƏR**
dil situasiyası, ikinci dil, postmodernizm, ədəbi dil, milli dil

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 02.02.2021
qəbul edilib: 09.03.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 30-40
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.004

**LINGUISTIC ISSUES**

# Language situation of Azerbaijan in the period of postmodernism

***Jahid Kazimov***
PhD in Philology, Associate Professor, Institute of Linguistics named after Nasimi of ANAS. Azerbaijan. E-mail: cahid@ismayiloglu.com
https://orcid.org/0000-0002-3955-4065

**ABSTRACT**
Sociolinguistic researches in the aspect of "language situation" as well as other topics (language policy, language planning, etc.) is of great general sociological importance. It is important because language reflects almost all aspects of the social life environment. Methodological methods in this area are that in the administrative-territorial sector as a whole, the tendencies of foreign language functionalization and language policy, as well as the analysis of different types of language situation, etc. issues are the object of research. The article discusses the "Man and language" problem of sociolinguistics in the context of monolin-gualism and multilingualism. The development nature (democratization) and prospects of the modern Azerbaijani literary language are characterized by the social and linguistic situation. The article analyzes the situation of modern language in the context of postmodernism. The main features of the interaction in the context of the modern Azerbaijani literary language and the new language situation are refined. In essence, by comparing the socio-territorial structure, territorial-linguistic structure and territorial-social linguistic structure, the nature of the language situation in a region is revealed, defined, and the main factors influencing development are clarified.

**KEYWORDS**
language situation, second language, postmodernism, literary language, national language

**ARTICLE HISTORY**
Received: 02.02.2021
Accepted: 09.03.2021

## Giriş / Introduction

Dil çoxfunksiyalı bir hadisədir. Həmin funksiyalar dilin cəmiyyətlə əlaqə və münasibətinin daha sıx olduğunu göstərir. Dil və onun funksionallaşması, cəmiyyət həyatında mühüm vəzifələri yerinə yetirməsi hər zaman aktual olmuşdur. Dil sosial əlaqələrin formalaşması üçün də bir vasitədir. O, insan zehninin fəaliyyətinin substratı olduğundan, onun mənəvi həyatı üçün də dil mühiti, dil situasiyası zəruridir. Bu cəhətdən dil sosiallaşma mühitində keçmiş təcrübənin qazandığı saysız uğurları özündə mərkəzləşdirir və bir düşüncə vasitəsi olaraq istifadə edildiyi üçün insanları (dildaşıyıcılarını) həmin təcrübənin təsiri ilə yaranan davranışa tabe və məcbur etmək məcburiyyətində qalır. Bu zaman funksionallaşan dilin kommunikativ və dərketmə funksiyaları arasında sıx əlaqə formalaşır.

Bu sahədə nöqsanlara yol vermək olmaz. "Müəyyən ərazilərdə, regionlarda işlədilən dil nöqsanlı olarsa, sözlər düşüncəni yaxşı anlada bilməz. Düşüncə yaxşı anlaşılmazsa, edilməsi lazım olan şeylər yaxşı edilməz, vəzifələr yaxşı yerinə yetirilməz. Vəzifələr lazımi şəkildə yerinə yetirilməzsə, adətlər və mədəniyyətlər pozular. Adətlər və mədəniyyətlər pozularsa, ədalət yanlış yoluna düşər. Ədalət yolundan çıxarsa, çaşqınlıq içinə düşən xalq nə edəcəyini, işin haraya varacağını bilməz. Deməli: cəmiyyətdə heç bir şey dil qədər əhəmiyyətli deyil" (Konfutsi) [2, s.3]. Dil xalqın tarixidir. Dil mədəniyyət və sivilizasiya yoludur. Bu yolda ölkənin daha çox önəm daşıyan "dil situasiyası" da ciddi marağa səbəb olur. Başqa ölkələrdə olduğu kimi, Azərbaycanda da müasir dil situasiyası nəinki özünəməxsus tarixi təcrübə qazanmış, eyni zamanda bazar münasibətlərinə uyğun dəyişmələrə məruz qalmış, hər bir tarixi dövr ərzində öz orijinal xüsusiyyətlərini qoruyub saxlaya bilmişdir.

V.V.Vinoqradovun təbirincə desək, "dilin funksional-üslubi çoxcəhətliliyindəki dəyişmələr tarixi kateqoriya kimi xalqın həcm tutumu, tərkibi və sosioloji mahiyyətindəki tarixi dəyişmələrlə sıx bağlıdır" [7, s.17].

Bu baxımdan biz dilə, ümumiyyətlə, tarixi situasiyalarla sıx əlaqədə yanaşırıq. Amma dil situasiyalarını müəyyənləşdirməkdən ötrü müəyyən olunduğu kimi, sosiolinqvistikada hələ ki, hamı tərəfindən qeyd-şərtsiz etiraf edilən bir ölçü yoxdur. Amma bununla belə, dil situasiyası problemi ilə dilçiliyin yeni sahəsi olan sosiolinqvistika məşğul olur. Sosiolinqvistik tədqiqatlar hər bir ölkənin, respublikanın, ərazinin, regionun, yaşayış məntəqəsinin dil situasiyasını adekvat (tam uyğun, bərabər) təqdim edir. Dil situasiyası hər hansı bir bölgədə istifadə olunan dillərin toplusunu, kompleksini, dəstini səciyyələndirir, hər bir dildə danışanların

sayı, yaşı, dilə sahib olma, yiyələnmə dərəcəsi, hər bir dildən hansı durumda istifadə etmə, nəhayət, hər dildən istifadədə bir-birinə yaxınlıq, bir-birinə təmas, tezlik göstəricisini və s. əhatə edir.

Bəzi tədqiqatçılar *dil situasiyası* termininin əvəzinə *"dil assimmetriyası" vahidini də işlədirlər* [Bayramova L.K. Kazan, 2002].

Ümumiyyətlə, XX əsrin sonu XXI əsrin başlanğıcında dilə, dilin varlıq formalarına yeni bir baxış ifadə olunur. Bu yanaşma quruluşun, sosial münasibətlərin, yeni-yeni sahələrin meydana gəlməsi, şüurlarda demokratik fikirlərin və s. baş qaldırması ilə səciyyələnir. İntensiv sosial-siyasi, iqtisadi, mədəni, ideoloji proseslər, ekstralinqvistik dəyişmələr hər bir respublikada olduğu kimi, ölkəmizdə də dil situasiyasını dəyişir. Rus dilinin ikinci bir dil kimi istifadəsi bir qədər arxa plana keçir. Necə deyərlər, dilin balansı dəyişir. Keçən totalitar dövrdə – 70 illik dövr ərzində rus dili respublikada cəmiyyət həyatının bütün sferalarında mühüm funksiyaları yerinə yetirmişdir. Bu dil demək olar ki, respublikanın bütün sahələrində (məktəbəqədər müəssisələrdə, orta ümumtəhsil məktəblərində, universitetlərdə, diplomatik yazışmalarda, nazirliklərdə və s.) güclü işlək dairəsinə malik olmuşdur. Rus dilindən milli dillə yanaşı, kütləvi informasiya vasitəsi (kütləvi kommunikasiya, televizor, radio, mədəni sahələr, teatr, kino və s.) kimi istifadə edilmişdir.

Fəlsəfi istiqamət olan postmodernizm mədəni fonemendir. *"Postmodernizm"* (*fr. Postmodernisme* – modernizmdən sonra) termini deyərkən, hər hansı bir dövrün və mərhələnin bilavasitə aid olduğu dövrdən və mərhələdən sonra tutduğu vəziyyət nəzərdə tutulur. Postmodernizm yeni diskursun, rasionalizmin, üslubun, yeni ideyanın xüsusi tipidir, əsasən dövrü təyin edir. **Məhz bu dövrdə müasir dil situasiyası və Azərbaycan ədəbi dilinin inkişaf ənənələri** hansı kriteriyalar əsasında reallaşa və əlaqə yarada biliblər? Bu sualın cavabı mövzunun aktual olduğunu göstərən ümdə cəhətlərdəndir.

Ədəbi dil tarixi, aydın məsələdir ki, dil faktlarını nitqin, mətnin içində öyrənir. Həm dil situasiyası, həm də ədəbi dil tarixi fikrin necə təzahür olunma imkanını əsas götürür. İstifadə olunan hər hansı bir dildə (ikidillilik, çoxdillilik şəraitində) var olan qrammatik formaların ideyanı, təfəkkürü ifadə etməsindəki "çevikli"yi nəzərə alır. Hər iki halda dilin iç potensialı aşkarlanır. Dil faktlarının münasibət qurduğu dinamik sosial şəraiti, fikrin ifadəsindəki "mütəhərriklik bacarığı"nı, "tarixi və sosioloji, əqli-idraki məndəricə"ni göstərir. Müasir dil situasiyası və Azərbaycan ədəbi dilinin inkişaf ənənələrini Tofiq Hacıyev belə xarakterizə edir: "Ədəbi dil tarixi milli dil faktları ilə əcnəbinin (yad dilin) qarşılıqlı əlaqəsini də unutmur və milli qrammatk quruluşun və lüğətin müzəffər çıxmasının tarixi mənzərəsini canlandırır.

Başqa dillərlə təmasda dilin orqanizmində gedən reaksiyaların məhsulunu nümayiş etdirir. Fikrin müəyyən mərhələdəki ifadə tərzində əcnəbi elementlərin iştirakının ictimai-linqvistik və mədəni tarixi şərhini verir" [2, s.19].

Postmodernizm dili ifadə edir. Dünya linqvistikasında dil situasiyası "linqvistik postmodernizm" istiqamətində də tədqiq olunur. Dil situasiyasının nitq və mətn şəraitində postmodernizm kodu olur. Bu kod postmodern – sosiomədəni situasiyadır. Bu, bir fəlsəfi konsepsiyadır. Əsas problem dil və düşüncənin kodlaşmış səciyyəsidir. Fəaliyyət isə ortaya çıxan fikrin (diskursiv) təcrübəsidir. Başlıca problem yuxarıda göstərildiyi kimi, dildə insan amilidir. XX əsrin sonu XXI əsrin əvvəllərində linqvistik antroposentrizmin meydana gəlməsi hər hansı inkişaf etmiş ölkədə dil situasiyasının istiqamətini də, ona yanaşmanı da dəyişdi. Bu məqalədə həmin münasibətlərin kritik məqamları çözüləcəkdir.

Qeyd etmək lazımdır ki, sosial sistem dildə funksionallaşır. Bu gün sosial münasibətlərin dildə ifadəsi problemi öz aktuallığı ilə xarakterizə olunur. "İnsan rəftarı, davranışı" – "potensial mətn" terminoloji anlayışları formalaşır. "Dilin sərhədləri" – "dünyanın sərhədləri" ilə bərabər tutulur. Bu sərhədləri dildə dünyanın bir nöqtəsində yaradılmış yeni texnoloji sahələr və həmin sferalara aid olan söz və terminlər, necə deyərlər, qırır. Bu söz və terminlər müasir Azərbaycan dilinin lüğət tərkibinə gəlir. Həqiqətən də, bu gün ingilis, fransız, italyan və s. dillərdən türk dillərinə (əvvəllər də keçib) alınmalar keçərək, həmin sahənin terminologiyasında bir dəyişiklik əmələ gətirmişdir. Bu o deməkdir ki, başqa dildə danışan əhalinin işlətdiyi ifadələr milli dillərdə ünsiyyəti, anlaşmanı təmin edir, dil situasiyasının durumu mövcud ərazidə dəyişir.

Tədqiqatlar da göstərir ki, müasir vəziyyət, alınmaların kəmiyyətcə birdən-birə, tədricən, şiddətli şəkildə kəskin güclənməsi, necə deyərlər, "boy atması", lüğət tərkibinin "donunun yeni rənglərlə" boyandığını nümayiş etdirir. Elmin, texnikanın Azərbaycan dilinin modernləşməsi ilə təması, bağlılığı yaranır. Alınmaların "məhkumluğu", məhkum olması çox şeydən soraq verir. Belə alınmalar öncə müasir mətbuatın dilinə gəlir. Kütləvi informasiya qaynaqları isə bu cür sözləri qəbul edir, radio, televiziya kanalları isə bu sözləri işlədirlər.

Bu məqsəd üçün dərhal sözlər, terminlər toplanmalı, "*Yeni sözlər və onların mənası"*nı izah edən lüğətlər yaradılmalıdır. Müşahidələrimiz göstərir ki, ingilisdilli alınmalar yeni reallıqları müəyyənləşdirir, sanki alınmaların bəziləri ballastlaşır, yəni artıq yükə çevrilir, amma bu vahidlər vasitəsilə yeni mənalar ifadə olunur, Azərbaycan dili ifadələri ilə ekvivalentlik təşkil edir. Bu məsələlərə dil situasiyası aspektində normativ və funksional planda yanaşmaq lazımdır. Həmin sözlər vasitəsilə

Azərbaycan dilinin modernləşməsini (müasirləşməsi), bu xüsusda dil situasiyasının hansı keyfiyyətlər qazandığını görmək olur. Məsələn, xeyli zamandır ki, Azərbaycan mühitində informatikaya dair termin və anlayışlar, iqtisadiyyat və siyasətə aid ifadələr Azərbaycan dilinin lüğət tərkibinə axır, kalkalar yaranır, bu sahədə lüğətlər yaradılır, hətta dissertasiyalar da yazılır [3, s.132].

Postmodernizm dövründə (əvvəllər də olub) fransız dilindən Azərbaycan dilinə aşağıdakı qəbildən olan sahə terminləri daxil olmuşdur: *lizinq, innovasiya, veb-sayt, portal, veb-dizayn, xaker, marketinq* və s. Belə sözlər hesabına müasir Azərbaycan dilinin leksikası zənginləşir. Bu proses aktiv müşahidə olunur. Dilimizin lüğət tərkibində zənginləşmə prosesi gedir, yeni sözlərin ekvivalentləri, variantları Azərbaycan dilində funksionallaşır. Əcnəbi leksika və terminologiya nəinki lüğət tərkibini genişləndirir, həmçinin dünyanın dil mənzərəsinin nominasiyanı milliləşdirir. Bu mütərəqqi, güclü, məhsuldar proses dilin inkişafına əhəmiyyətli dərəcədə təsir göstərir.

Bəzi hallarda müşahidə olunan sosiolinqvistik proseslər vaxtından qabaq və qanunauyğunsuz şəkildə də təqdim olunur. Məhz Azərbaycan Respublikasının müasir dil situasiyasının xüsusiyyətləri buradan da irəli gəlir; həmin məsələ bu yöndə də təhlil olunmalıdır.

Müasir Azərbaycan dilində dil situasiyasına 2 əsas aspektdə yanaşılır:

1) mədəni-linqvistik;

2) sosiolinqvistik.

Mədəni-linqvistik, sosial, iqtisadi dəyişmələr dilin müxtəlif səviyyələrinə öz təsirini göstərir.

Dil situasiyası adı altında milli və əcnəbi dillərin məcmusu, cəmiyyətə xidmət göstərən region sərhədləri və dövlətlərin xüsusiyyətləri və funksionallaşması başa düşülür. Həmin anlayış adətən ölkə, region, respublika üçün müəyyənləşir.

Dil situasiyası sosiolinqvistik tədqiqatların mühüm mövzularından biri hesab edilir. Şübhəsiz, dil situasiyasına təsir edən faktorlar da müəyyənləşməlidir. Bu faktorlardan biri dildənkənar sosial hadisələrdir. Bir tərəfdən də mürəkkəb etnik tərkib respublikada əhalinin mürəkkəb dil situasiyası ilə üzləşdiyini göstərir. Dil situasiyası Azərbaycanda əvvəlki dövrlərdə ana dili və rus dilinin birgə işlənməsi şəraiti ilə müəyyənləşmişdir. Azərbaycan mühitində çoxsaylı etnik qruplar prioritet “dil siyasəti aparırlar”, bu da dil situasiyasına öz təsirini göstərir. Azərbaycan Respublikasında bu gün 26 dildə danışan millət və xalqlar yaşayır. “Müasir Azərbaycanda dil situasiyası” adlı yazısında Fəxrəddin Veysəlli həmin dilləri dil xəritəsi baxımından aşağıdakı kimi qruplaşdırmışdır:

Azərbaycanlılar – 98,6
Ruslar – 7,6
İngilislər – 7,6
Talışlar – 200, 000 min.
Ləzgilər – 150, 000 min.
Tatlar – 20 000 min.
Çuxurlar (dağ yəhudilərinin dili) – 15 000 min.
Lahıclar – 2.000 min.
Udinlər – 1000
Tabasaranlar – 1000
Gürcülər – 3000
Rutullar – 500
Avarlar – 200
Xınalıqlar – 300
Kürdlər – 20.000
Habutlar – 200
Assurlar – 100
Ermənilər – 20.000
Buduğlar – 2000
Ahısqa türkləri – 38000
Saxurlar – 2000
Axvaxlar – 1000
Krızlar – 1500 [6, s.66]

Sosial faktor kimi dil situasiyası cəmiyyətin nitq kommunikasiyasında mühüm rol oynayır. Burada yaranan müxtəlif amillər bir-birinə öz təsirini göstərir. Cəmiyyətin inkişaf və fəaliyyətində dilin bu situasiyada oynadığı rol aydınlaşır. Postsovet dövründə ikidilliliyin konkret olaraq reallığı milli dilin kölgədə qaldığına sübutdur.

Azərbaycan Respublikasında dil siyasəti dil situasiyasından asılı vəziyyətdədir. Bu asılılıq onun 3 növünü fərqləndirir: 1) birdilli mühitdə yürüdülən dil siyasəti; 2) çoxdilli mühitdə yürüdülən dil siyasəti; 3) dövlətin özünün sərhədləri (hüdudları) kənarında yürüdülən dil siyasəti [5, s.151].

Azərbaycan Respublikası çoxmillətli dövlətdir. Bu regionda, ərazidə azsaylı dillər fəaliyyət göstərir, bəziləri (ləzgi dili) aşağı siniflərdə tədris olunaraq məişətdə də istifadə olunur.

Digər bir məsələ, *ikinci dilin təlimdə yaratdığı çətinliklərdir*. Bu çətinliklər şagirdləri müasir təlim prosesində ciddi problemlərlə üzləşdirir. Söhbət ingilis dilindən gedir. Yeni dövrdə yeni terminoloji vahidlərin ekvivalentlərinin seçilməsində beynəlxalq miqyasda işlədilən ingilis dilindəki terminlərə üstünlük verilir (məsələn, *kompüter, printer, piksel, servis, dialoq, skaner*, *intoperabellik*, *repozitar* və s.). İngilis dilinin digər dillərdəki terminologiyaya bu və ya digər dərəcədə təsiri təbiidir, ona görə ki hazırda bu dil milli dillərə öz təsirini göstərir, dilləri sıxışdırmağa başlayır, bu cəhət dünya üzrə baş verən qloballaşma prosesinin tərkib hissəsidir. Rus dilinin tədris əhəmiyyəti bir qədər aşağı səviyyədədir. Həmin çətinliklərin aradan qaldırılması həlli vacib olan məsələlərdəndir.

Hazırda dünya dillərinə keçmiş amerikanizmlərin (alınma vahidlərin) ədəbi nitqdə özünə yer etməsi təbii görünür. İngilis dili beynəlxalq dil olmaqla bərabər, hər biri spesifikliyi ilə fərqlənən Böyük Britaniya, ABŞ, Kanada, Yeni Zelandiya və Avstraliya və digər ölkələrdə də istifadə olunur. Avropa ölkələrində dilin durumu nəzərə alınarsa, o zaman bizdə – Azərbaycanda dil müxtəlifliyi mürəkkəb bir şərait kimi düşünülür. Bu gün qloballaşan dünyada təhsil sferasında əlavə dil kimi ingilis dili müəyyənləşir.

“Bilinqvizm” latın mənşəli linqvistik termindir, *bi* – iki, ikidil, *lingua* – dil. Beləliklə, bilinqvizm – iki dilin vasitələrinə sahib olma, yiyələnmək deməkdir. Situasiya üçün bir neçə dilin funksionallaşması mümkündür, bunun üçün “çoxdillilik” terminindən (ing. *multilingualism,* frans. *plurilinguisme)* istifadə edilir.

Yeni semantik kalkalar yad dilin modeli əsasında qurulur və tərcümə xarakteri daşıyır. “Kalkalar alınmanın xüsusi bir növüdür. Bu, müvafiq əcnəbi sözlərin quruluşu kimi formalaşan, lakin onların maddi əsasını almayan sözlərdir” [1, s.88].

Funksionallaşan həmin dil vahidləri mətndə yeni fikir münasibətləri yaratmaq vəzifəsini yerinə yetirir. Yeni tərkibdə həmin kalkalar daha böyük vahidlərin tərkibində müəyyən rol oynayır. Məs.: *avtoçağırış (avtovızov), bufer-yaddaş (bufernaə pamət), giriş faylı (vxodnoy fayl), əmrlər generatoru (qenerator komand), məntiqi yazı (loqiçeskaə zapis), fəal yaddaş (operativnaə pamət); addressfield (ünvan sahəsi), arqument list (arqument siyahısı), kibernetik model (kibernetik model), deskevvinq buffer (bufer qurğusu), cipherer (kodlama qurğusu)* və s.

Qarşılıqlı əlaqə və həmin əlaqə vasitəsilə bunların kommunikasiyada, fikrin ifadəsində rolu görünür. Bu cəhətdən yad dil vahidlərinin milli dildə funksionallaşması qrammatiki faktor rolunu oynaya bilir. Bu məsələyə sintaqmatik planda da yanaşmaq mümkündür.

Qarşılıqlı təsirlər nəticəsində yeni semantik kalkalar yaranır və KİV-də işlənməyə başlayır. Bu daimi proses kimi özünü göstərir. Bu prosesin aktivləşməsi müasir dil situasiyasının implisit və eksplisit xüsusiyyətlərinin yeni keyfiyyətlərlə meydana çıxmasını sübut edir. Yuxarıda qeyd etdiyimiz kimi, yeni alınmalar vasitəsi ilə dilin resursları (ehtiyatları) genişlənir, dil vahidlərinin semantikası inkişaf edir, ən başlıcası, sosial mühitdə iki, yaxud üçdillilik şəraitində dil intellektuallaşır (yəni anlayışların kəmiyyəti yüksəlir), nitq lakonik (yığcam) hala düşür; dilin dadı, ləzzəti nitqdə, konkret mətnlərdə hiss edilir. Çox mühüm bir hadisə baş verir. Ədəbi dilin **demokratikləşməsi** təmin olunur. Köhnə ədəbi dil ənənələri arxada qalır, ənənələr yeniləşir. Ədəbi dilin demokratikləşməsi prosesi gedir. Demokratikləşmə müasir mərhələdə də davam edir. Bu ədəbi dilin yeni magistral inkişaf yoluna düşdüyünü göstərir. Müasir dil situasiyasının başlıca xüsusiyyəti bu nöqtədə, bu kəsişmə sərhədində də ehtiva olunur, ədəbi dilin inkişaf istiqamətləri müəyyənləşdirilir. Dilin inkişafının konservativ xarakteri mühafizə edilir.

XX əsrin sonu – XXI əsrin başlanğıcında müasir Azərbaycan dilinin lüğət tərkibinin ciddi şəkildə dəyişməsi ilə xarakterizə olunur və bu vəziyyət insanlar arasında xoş təəssürat doğurur. İnternet şəbəkəsi genişlənir, ədəbi dilin kütləvi kommunikasiya bazası güclü şəkildə inkişaf edir. İnternet və yeni dil situasiyası meydana çıxır. Aktiv sintaktik proseslər başlanır. Ədəbi dilin növbəti demokratiya dalğası sosial dəyişmələrlə stimullaşır. Bu faktlar ədəbi dilə güclü təsirlərlə səciyyələnir, demokratikləşmə prosesi yeni hadisələri, kütləvi mədəniyyət, postmodernizm (modernizm) hadisələrini doğurur. Ölkədə gündən-günə müxtəlif forma və sferalar (sahələr) reallaşır. Ekstralinqvistik faktorların təsiri və rolu çoxalır. Məsələn, hazırda Qarabağın işğal altından azad olunmuş torpaqlarında müxtəlif şirkətlərin milliyətcə rus, ingilis, italyan, türk olan nümayəndələri çalışırlar. Onlar bir-biri ilə ünsiyyət qurur, bu zaman çoxdillilik şəraitində öz fəaliyyətlərini, işlərini davam etdirirlər.

Müasir mədəni situasiya-mədəniyyət sistemində radikal şəkildə dəyişir. Kütləvi mədəniyyət mühüm bir amil kimi ədəbi dilə təsir göstərir. Linqvistik planda ədəbi dilin yeni normaları yaranır.

Kütləvi mədəniyyət mürəkkəbləşmiş dil reallığını dəyişir. Müasir dil situasiyası mədəni kütləvi (ədəbi) təhlillə hesablaşmır, bu mümkün olmur. Rəqabət yaranır. Müasir dil situasiyasının xarakteristikası, ədəbi dilin müasir vəziyyəti kütləvi ədəbiyyatın dili ilə hesaba, nəzərə alınmır. Kütləvi mədəniyyətin ədəbi dilə təsiri öz növbəsində ümumi postmodernist situasiya ilə sıx şəkildə bağlıdır. Yeni mədəniyyət fenomeni meydana gəlir.

Beləliklə, müasir dil situasiyası həmişə mürəkkəb olaraq qalır. Ədəbi dilə, həmçinin müxtəlif faktorlar, sosial dəyişmələr ("yenidənqurma", islahatlar, kütləvi mədəniyyətlər, postmodernizm, internet və s.) öz təsirini göstərir. Müasir dil situasiyasının başlıca mərkəzi xüsusiyyəti əsasən bunlardan ibarətdir. Məhz bu mühitdə hər bir funksional üslub manifestləşir, ədəbi dil anlayışı assosiasiya doğurur.

Beləliklə, müasir dil situasiyası mürəkkəb, çoxölçülü və çoxamilli bir hadisədir. Yeni dövr ədəbi dillərin inkişaf dövrüdür. Yeni keyfiyyətli ədəbi dil yeni ictimai şərait və yeni dil situasiyası ilə birgə inkişaf edir.

## Nəticə / Conclusion

Deyilənlərdən belə qənaətə gəlmək olur ki, Azərbaycanda dil situasiyasının məzmun və mahiyyəti tarixi mərhələlər üzrə aşağıdakı istiqamətlərlə səciyyələnir:

- ✓ Azərbaycanın dil mənzərəsi çoxobrazlı genetik və tipoloji cəhətlərlə səciyyələnir.
- ✓ Dil çoxfunksiyalı mütləq vasitədir. Dilin müəyyən məqsədə çatmaq funksiyaları mövcuddur. Sosial-kommunikativ sistemin komponentləri arasındakı funksional münasibətlər həmin məqsədi tənzimləyir.
- ✓ Dil situasiyası həyatın, varlığın formasıdır. Ərazi-sosial münasibətlər və funksional əlaqələr; coğrafi-regional, yaxud siyasi inzibati əlamətlər dil situasiyasının aparıcı xüsusiyyətlərindən hesab edilir. Dil situasiyasının dəyişkən xarakteri bu cəhətlərlə izah oluna bilər.
- ✓ Dil situasiyasından nitq situasiyasına doğru müəyyən istiqamətlər mövcuddur. Dil və nitq situasiyası arasındakı fərqlər onların ayrı-ayrılıqda təsvirini gerçəkləşdirir və onlar arasındakı fərqlər aşkar edilir.
- ✓ Hər dövrün özünün dil situasiyası vardır. Sovet dövründə Azərbaycandakı dil situasiyası ilə yeni müasir dövrün dil situasiyası xeyli dərəcədə bir-birindən fərqlənir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Budaqov R.A. (1956). Dilçiliyə dair oçerklər. Bakı, Azərnəşr. 286 s.
2. Hacıyev T.İ. (2012). Azərbaycan ədəbi dilinin tarixi. I hissə, Bakı, Elm nəşriyyatı. 476 s.
3. İsrafilova S. (2006). Azərbaycan dilində informatika terminlərinin leksik-semantik təhlili. Bakı, Təhsil nəşriyyatı. 160 s.
4. Bayramova L.K. (2002). Tatarstan: yazikovaya simmetriya i asimmetriya. Kazan. 267 s.
5. Shveytser A.D. (1976). Sovremennaya sotsiolingvistika: teoriya, problemi, metodi. Moskva, Nauka. 176 s.
6. Veysalli F. (2019). Sotsiolingvistika. Uchebnoe posobie. Baku, Mutardjim.
7. Vinogradov V.V. (1952). Ponyatie vnutrenikh zakonov razvitiya yazika i obshey sisteme marksistskogo yazikoznaniya. Voprosi yazikoznaniya, s.3-43.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 41-58
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.005

**A Z Ə R B A Y C A N   Ə D Ə B İ Y Y A T I**
**N İ Z A M İ   G Ə N C Ə V İ – 880**

# Nizami Gəncəvinin əsərlərində psixoloji dəyərlər

***Gülnarə Əlixanova***
Psixologiya üzrə fəlsəfə doktoru, ADPU-nun Pedaqoji psixologiya kafedrası. Azərbaycan.
E-mail: gulnare.alixanova@mail.ru
https://orcid.org/0000-0002-5241-0250

**XÜLASƏ**
Dahi şair və mütəfəkkir Nizami Gəncəvinin insanları daim əxlaqi kamilliyə səsləyən və yüksək mənəvi psixoloji keyfiyyətlər aşılayan zəngin yaradıcılığının bəşər mədəniyyətinin nailiyyəti kimi müstəsna əhəmiyyətini nəzərə alaraq, anadan olmasının 880 illik yubileyinin dövlət səviyyəsində qeyd olunması Azərbaycanın zəngin tarixi-mədəni irsinin təbliğinə böyük töhfədir. Şairin yaradıcılığı xalqımızın milli mənəviyyatının ayrılmaz hissəsinə çevrilmişdir. Vətənpərvər şair əsərlərində təsvir etdiyi bütün hadisələri Azərbaycanla əlaqələndirməyə, Vətəninin keçmiş günlərini tərənnüm etməyə çalışmışdır. Qüdrətli söz ustadının bəşəriyyətin bədii fikir salnaməsində yeni parlaq səhifə açmış ölməz əsərləri bu gün də insanların mənəvi, psixoloji və əxlaqi kamilləşməsinə misilsiz xidmət göstərir. Korifey sənətkar öz ənənələri ilə seçilən ədəbi məktəbi yaratmışdır. Nizami Gəncəvinin dünyanın ən zəngin kitabxanalarını bəzəyən əsərləri Şərqdə incəsənətin, xüsusən də miniatür sənətinin inkişafına təkan vermişdir.

**AÇAR SÖZLƏR**
N.Gəncəvi, şəxsiyyət, özünüqiymətləndirmə, kamil insan, vətənpərvərlik, psixoloji dəyər

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 12.01.2021
qəbul edilib: 28.01.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 41-58
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.005

**AZERBAIJANI LITERATURE**
**NIZAMI GANJAVI – 880**

# Psychological values in the works of Nizami Ganjavi

***Gulnara Alixanova***
PhD in Psychology, Department of Pedagogical Psychology, ASPU. Azerbaijan.
E-mail: gulnare.alixanova@mail.ru
https://orcid.org/0000-0002-5241-0250

**ABSTRACT**
The celebration of the 880th anniversary of the birth of the great poet and thinker Nizami Ganjavi at the state level is a great contribution to the promotion of the rich historical and cultural heritage of Azerbaijan. Nizami's work has become an integral part of the spirituality of our people. For Nizami Ganjavi, the highest criterion of personality was humanity. The patriotic poet tried to connect all the events he described with Azerbaijan, to glorify the past days of his homeland. The immortal works of the great master of words, which opened a new bright page in the annals of artistic thought of mankind, still serve the spiritual, psychological and moral perfection of people. Coryphaeus created a literary school distinguished by its traditions. Nizami Ganjavi's works, which adorn the richest libraries in the world, gave impetus to the development of art in the East, especially miniature art.

**KEYWORDS**
N.Ganjavi, personality, self-esteem, perfect man, patriotism, psychological value

**ARTICLE HISTORY**
Received: 12.01.2021
Accepted: 28.01.2021

## Giriş / Introduction

Zəngin mədəniyyət tariximizin ən parlaq simalarından olan N.Gəncəvinin dərin və sonsuz ümmana bənzəyən poeziyasında həm milli-mənəvi, həm də ümumbəşəri dəyərlər öz əksini tapmışdır. N.Gəncəvi haqqında ən yüksək fikirləri söyləyən, onun xatirəsinin əbədiləşdirilməsi, irsinin dərindən öyrənilib dünya miqyasında tanıdılması üçün dövlət səviyyəsində nəhəng işlər görən məhz Azərbaycan mədəniyyətinə və incəsənətinə hər zaman böyük qayğı göstərən ümummilli liderimiz H.Əliyev olmuşdur. Onun təşəbbüsü ilə 1979-cu ildə qəbul olunmuş “Azərbaycanın böyük şairi və mütəfəkkiri Nizami Gəncəvinin irsinin öyrənilməsini, nəşrini və təbliğini daha da yaxşılaşdırmaq tədbirləri haqqında” qərar Nizami yaradıcılığının tədqiqi və təbliği üçün yeni perspektivlər açıb. Ölməz sənətkarın 1981-ci ildə Ulu Öndərin bilavasitə təşəbbüsü və iştirakı ilə keçirilən 840 illik yubiley mərasimləri ölkənin mədəni həyatının əlamətdar hadisəsinə çevrilmiş, 2011-ci ildə isə Nizami Gəncəvinin 870 illiyi dövlət səviyyəsində silsilə tədbirlərlə geniş şəkildə qeyd edilmişdir.

**2021-ci ili Prezidentimiz İlham Əliyevin dahi Azərbaycan şairi Nizami Gəncəvinin şərəfinə “Nizami Gəncəvi İli” elan etməsi ölkəmizdə klassik ədəbi irsimizin, milli ədəbiyyatımız və mədəniyyətimizin görkəmli simalarının təbliği sahəsində atılan növbəti addımdır.** Böyük Azərbaycan şairi Nizami Gəncəvi haqqında imzalanmış Sərəncam yeni nəsillərdə milli iftixar, azərbaycançılıq, vətənpərvərlik duyğuları aşılamaq, milli-mənəvi psixoloji özünüdərk prinsiplərini daha geniş şəkildə təbliğ etmək üçün də qarşımızda yeni perspektivlər açır.

Dövlət başçısı İlham Əliyevin 2021-ci ilin "Nizami Gəncəvi ili" elan edilməsi haqqında Sərəncamında qeyd edildiyi kimi, böyük sənətkarın xalqımızın mənəviyyatının ayrılmaz hissəsinə çevrilmiş parlaq irsi əsrlərdən bəri Şərqin misilsiz mədəni sərvətlər xəzinəsində özünəməxsus layiqli yerini qoruyub saxlamaqdadır. Nizami Gəncəvi ömrü boyu dövrün mühüm mədəniyyət mərkəzlərindən olan qədim Azərbaycan şəhəri Gəncədə yaşayıb yaradaraq, Yaxın və Orta Şərq fəlsəfi-ictimai və bədii-estetik düşüncə tarixini zənginləşdirən ecazkar söz sənəti incilərini də məhz burada ərsəyə gətirmişdir. Onun geniş şöhrət tapmış “Xəmsə”si dünya poetik-fəlsəfi fikrinin zirvəsində dayanır. Mütəfəkkir şair çox sayda davamçılarından ibarət böyük bir ədəbi məktəbin bünövrəsini qoymuşdur. Nizaminin ən məşhur kitabxana və muzeyləri bəzəyən əsərləri Şərq miniatür sənətinin inkişafına da təkan vermişdir.

Poeziya dünyasının dahisi Nizami Gəncəvinin ölməz ədəbi irsi təkcə humanizm, insana məhəbbət, yüksək əxlaq, estetik zövq, tərbiyə və bilik mənbəyi, heç vaxt qiymətini, etik təsirini itirməyən əlvan söz, dərin fəlsəfi fikir, hikmət xəzinəsi

olmaqla bərabər, həm də canlı tariximizdir, keçmişimizin ən qaranlıq guşələrinə işıq salan sönməz məşəldir.

Mütəfəkkir şairin ədəbi irsinin təbliği bütün dövrlər üçün öz aktuallığını və psixoloji təsirini qorumaqla yanaşı, müxtəlif peşə sahibləri kimi psixoloqların da qarşısında onun əsərlərini araşdırıb daha sanballı psixoloji fikir və ideya mənbələrinin ortaya qoyulmasını və dahi şairin hər kəlməsinin psixoloji cəhətdən mənasının araşdırılmasını tələb edir. Bu işin daha geniş miqyasda inkişaf etdirilməsi üçün hər kəs üzərinə düşən işi məsuliyyətlə və yüksək səviyyədə yerinə yetirməlidir .

Nizami yaradıcılığının ən əhəmiyyətli hissəsi insan şəxsiyyətinin psixoloji cəhətdən düzgün formalaşdırılması məqsədi daşıyan hikmətli hekayətlərdən ibarətdir. Deməli, bu zəngin materiallardan məhz müasir dövrün tələbləri ilə böyüyən kiçik və orta yaşlı məktəblilər, yeniyetmələr və gənclərdə şəxsiyyətin formalaşması və idrak qabiliyyətlərinin inkişaf etdirilməsi prosesində məqsədyönlü şəkildə istifadə etmək olar.

Dahi Nizami irsinin öyrədilməsi humanitar fənlər arasında birinci yeri tutsa da, onun əsərlərində təzahür edən ideyaların və şəxsiyyətyönümlü fikirlərin psixoloji mahiyyəti çox dərindir. Çünki Nizami dahi şair olmaqla yanaşı, böyük mütəfəkkir-filosof, ensiklopedik biliyə malik olan, əsərlərində psixoloji fikir və dəyərlərə daha çox yer verən alimdir [1, s.20].

Dahi Nizaminin təhsil, təlim, tərbiyə və şəxsiyyətin inkişafı ilə bağlı hikmət dolu psixoloji fikirləri zəngin, geniş və dərindir. Onun əsərlərində həm humanitar (ədəbiyyat, dilçilik, tarix, musiqi, təsviri incəsənət və s.), həm də təbiət-riyaziyyat elmləri (fizika, həndəsə, kimya, biologiya, coğrafiya və s.) ilə bağlı dəyərli psixoloji fikirlər, zamanı qabaqlayan psixoloji ideyalar kifayət qədərdir. Məsələn, "Oğlum Məhəmmədə nəsihət" şeirində şair öz oğlunun timsalında gənc nəslə əxlaqi hisslərin inkişaf etdirilməsini bu cür tövsiyə edir:

1. İnsan cavanlıq yaşından qeyrətlə çalışmalı, öz hünəri ilə uğurlar qazanmağa nail olmalıdır;
2. Cəmiyyətdə öz yerini tutmaq və ağıllı-kamallı olmaq lazımdır;
3. İnsan hisslərini cilovlamağı bacarmalıdır;
4. İnsan öyrəndiyi elmi və ya peşəni dərindən bilməli, onun kamil ustası olmalıdır;
5. Cavanlar ata öyüd-nəsihətinə qulaq asmalı və onlara əməl etməlidirlər.

Aparılan tədqiqatlar göstərir ki, dahi şairin ayrı-ayrı əsərlərinin dərindən öryənilməsi, həmin əsərlərdəki psixoloji fikir və ideyaların tam üzə çıxarılması baxımından müasir psixoloji təsir vasitələri və texnologiyaları əsasında hazırlanan təqdimatlar mühüm əhəmiyyət kəsb edir. Gənclərdə idrak proseslərinin inkişaf

etdirilməsinə, yaradıcılıq qabiliyyətlərinin, təfəkkür, təxəyyül, müstəqil düşünmək, eyni zamanda bilik, vərdiş və bacarıqların inkişafına güclü təkan verir.

Nizami Gəncəvi bütün yaradıcılığı boyu lirik şeirlər yazmış, sonralar poemalarında irəli sürdüyü ictimai, fəlsəfi və psixoloji dəyərli fikirlərini ilk dəfə bu şeirlərində ifadə etmişdir. Şairin lirikası yüksək sənətkarlığı, məhəbbətə dünyəvi münasibəti, insan taleyi haqqında humanist düşüncələri ilə seçilir. Onun ilkin yaradıcılığında dövrünün ən humanist, ümümbəşəri ictimai-siyasi, sosial və psixoloji, əxlaqi idealları parlaq şəkildə öz bədii əksini tapmışdır.

Dahi sənətkar şəxsiyyətin ən yüksək meyarını insanlıq hesab edirdi. İrqi, milli və dini ayrı-seçkiliyi qətiyyətlə rədd edirdi. Onun qəhrəmanları içərisində müxtəlif xalqlara və dinlərə mənsub olan nümayəndələr vardır. Bu qəhrəmanlar ədalət, xalq xoşbəxtliyi, ali məqsədlər uğrunda vuruşurlar. İnsan şəxsiyyətinə, insan əməyinə və qarşılıqlı münasibətlərə hörmət şairin yaradıcılığının əsas mövzularındandır [2, s.103].

Elm və mədəniyyətimizin inkişafı ilk növbədə "insan amilindən", gələcəyimiz olan gənclərimizin intellektual hazırlıq və vətəndaşlıq səviyyəsinə bağlıdır. Bu keyfiyyətlərin formalaşdırılmasında Nizami Gəncəvi poeziyasının rolu misilsizdir. Şairə Flora Xəlilzadənin gəldiyi elmi qənaətə görə: "Vətənə, xalqa xidmət haqqında düşünürüksə, müharibənin, ədalətin nə olduğunu, hünər, cəsarət, mərdanəlik, çalışqanlıq, məhəbbət, sevgi, düzlük, səadət kimi məziyyətlərdən xəbət tutmaq, gəncliyin, qocalığın fərqini anlamaq, səbrin, qənaətin fəzilətinə dolmaq, bir sözlə, insan olmaq istəyiriksə, Nizamini oxumaq, duymaq, onun hikmət çeşməsindən dadmaq və əməl etmək bəs edər".

"İnsan amili"nin öndə dayandığı müasir dövrümüzdə humanist, demokratik, hüquqi cəmiyyətin yaradılmasında dahi şairimizin "kamil insan" konsepsiyası çox aktualdır. N.Gəncəvinin şəxsiyyətin inkişafına dair hikmət dolu psixoloji məna kəsb edən kəlamları, öz zamanını doqquz yüz ilə yaxın bir vaxt müddətində qabaqlayan psixoloji ideyaları həddən ziyadə çoxdur. Mütəfəkkir şair öz əsərlərində "şəxsiyyətin formalaşmasında yalnız irsiyyət deyil, digər amillər də mövcuddur" fikrini ifadə etmişdir. N.Gəncəvi əsərlərində insanın şəxsi – mənəvi keyfiyyətlərinin formalaşmasında mühit amilinin əvəzsiz roluna aid ideyanın psixoloji məzmununu bu cür açıqlayır: "Əgər insansansa, insanları sev". Bu tövsiyəni verən humanist şair yaxşı adamlarla qarşılıqlı münasibət qurmağı, pis adamlardan uzaq olmağı və mənfi davranışın psixoloji təsiri altına düşməməyi rəva bilir.

"Ağılsız kəslərlə oturub-duran, ağıldan, şüurdan deməsin dastan", – deyən şair başa salır ki, elmli, mərifətli adamlarla dost olmaq daha yaxşıdır:

Bədəsil olarsa əgər bir adam,
Qırmızı gövhəri saraldar tamam.
Ağıllı adamla dost olsan əgər,
Elmi, mərifəti sənə də keçər.

Nizami Gəncəvinin "Leyli və Məcnun" poeması dərin humanizmi, möhkəm süjet xətti, kompozisiya bütövlüyü, surətlərin tamlığı və psixoloji mənası ilə müasirlərini valeh etmiş və səkkiz yüz ildən artıq bir vaxtda öz təravətini saxlayaraq hələ də əldən-ələ gəzməkdədir. Bu poema böyük fəlsəfi – psixoloji və bədii keyfiyyətlərinə görə Şərq poeziyasının və bütün dünya ədəbiyyatının müstəsna əhəmiyyət kəsb edən sənət əsəridir. Poema orta əsrlərdə dövlətlərin və ölkələrin sərhədlərini aşaraq bütün dünyaya yayılmış, böyük əks-səda doğurmuş nadir sənət incilərindəndir. Dahi sənətkar N.Gəncəvi "Leyli və Məcnun" əhvalatına ruhən bağlanmış, onu bütün varlığı ilə sevmiş, dastanı şair təxəyyülünün zəngin boyaları ilə bəzəmiş və əbədi yaşaya biləcək bir sənət əsəri yaratmışdır [3, s.71].

Şair "Yeddi gözəl" poemasında mühit amilinin psixoloji dəyərini bir daha qeyd edir, irsi imkanları toxuma, qeyri-sağlam mühiti "şoran torpağa" bənzədir və insanlara başa salmağa çalışır ki, şəxsiyyətin formalaşmasında yaxşı nəticə almaq üçün əlverişli psixoloji mühit və şərait yaradılmalıdır:

Hər kim toxum əksə şoranlıq çölə,
Bircə peşimanlıq gətirər ələ.
Ağac əkilməli münbit bir yerə,
Ta behişt barıtək meyvələr verə.

Dahi şair şəxsiyyətin formalaşmasında təhsil, təlim və tərbiyəyə, yəni pedaqoji proses amilinə xüsusi önəm vermişdir. "Qüvvət elmdədir, başqa cür heç kəs, heç kəsə üstünlük eyləyə bilməz" – deyən şairə görə, insanı heyvanlardan fərqləndirən əsas əlamət onun ağlı, düşüncəsi və kamalıdır. Ağlın çırağı isə elm və bilikdir. O, elmi biliklərə yiyələnməkdə təlimin rolunu kamil insan obrazı kimi yaratdığı İsgəndərin təlim alması səhnəsində konkret nümunələr əsasında vermişdir. İsgəndərin hərtərəfli inkişafını təmin etmək üçün atası onun təlimini çox yüksək biliyi ilə şöhrət qazanmış Niqumaş adlı alimə tapşırır.

O, böyük zəhmət hesabına İsgəndərə bütün elmlərin sirlərini öyrədir və ona "hər gizli biliyə" çatmaqda kömək edir.

Şair şəxsiyyətin hərtərəfli psixi inkişafında tərbiyənin rolunu xüsusi qeyd edir. İsgəndərin müəllimi ona dərin bilikləri öyrətməklə yanaşı, "ağıla nur", "ürəyə qüvvət" verən "şəhanə tərbiyə" aşılayır:

Şəhanə tərbiyə, hünər, nəzakət,
Ağıla nur verir, ürəyə qüvvət.

Şəxsiyyətin formalaşmasında təhsil, təlim, tərbiyə ilə yanaşı, özünütərbiyənin rolunu yüksək qiymətləndirən müəllif "Xəmsə"də bu barədə bir sıra dəyərli psixoloji yönümlü fikirlər söyləmişdir. Məsələn, "Yeddi gözəl" poemasında şair "özünü başa düşən, dərk edən, özünü yaxşı tanıyan insana ölüm yoxdur" deyir:

Kim ki, öz-özünü düşmüşdür başa,
Ona ölüm yoxdur, o ölməz haşa.
Nəqşini bilməyən fanidir, fani,
Baqi say bu nəqşi bilən insanı.
Tanısan özünü, köçsən cahandan,
Yenə bu dünyada yaşayacaqsan.

Nizami göstərir ki, özünü tanımayan, öz nöqsanını görmək istəməyənlər, öz hərəkətlərinə tənqidi yanaşmayanlar bədbəxt insanlardır, onlar şəxsiyyət səviyyəsinə yüksələ bilməyəcəklər:

Özündən hər kim ki, deyil xəbərdar,
Bir qapıdan girər, birindən çıxar...
Heç kəs öz könlünə tutmayır irad,
Odur varlığını eləməz abad.

Çağdaş dövrün pedaqoq və psixoloqları şəxsiyyətin formalaşmasına təsir edən amillər sırasında fəaliyyət və ünsiyyət amilini xüsusi qeyd edirlər. Halbuki dahi şair hələ doqquz əsrə yaxın bundan əvvəl bu amillərin, xüsusilə əmək fəaliyyətinin rolunu "Xəmsə"də "həyat – əməkdir" ideyası ilə şərh etmişdir. Böyük mütəfəkkirin fikrincə, əməksevərlik, çalışqanlıq, halal əməkdən psixoloji və estetik zövq almaqla məşğul olmaq insanda müsbət əxlaqi keyfiyyətlər formalaşdırır [4, s.169].

Əxlaqi keyfiyyətlərdən biri kimi dəyərləndirilən insanpərvərlik humanist şairin əxlaqi görüşlərinin əsasını təşkil edir. Yeni psixopedaqoji təfəkkürə görə "insanpərvərlik" çox geniş anlayışdır. Böyük insanpərvərlik nümunəsi olan dahi

Nizami həmin anlayışa məhz bu yönümdən yanaşması ilə müasir elmi psixoloji dəyərlər haqqında fikirləri doqquz yüz ildən çox qabaqlamışdır. Şairin insanpərvərlik fikirlərinə görə, hər kəs bütün insanlara hörmət və rəğbət bəsləməli, onları sevməlidir. Çünki insan bu dünyanın əvəzedilməz varlığıdır:

Sən, ey yerdə fələyi heyrətdə qoyan insan,
Yer də, göy də nazınla daim oynayan insan.
Ülviyyət aləmindən xəbərdarsan deyə sən,
Qüdrətinlə şərəfsən, şansan yerə, göyə sən.

“Əgər insansansa, insanlığı sev” – deyən humanist şairin yaratdığı müsbət obrazların hamısı özünün şəxsiyyəti, yüksək bəşəri hissləri və insanpərvərliyi ilə seçilir. Xalqımızın yüksək əxlaqi keyfiyyətini göstərən milli-mənəvi dəyərlərimizdən olan ata-anaya ali məhəbbət, övladlara yüksək qayğı, ağsaqqallara dərin ehtiram və hörmətdir. Milli dəyərlərimizi yüksək qiymətləndirən Nizami poemalarında insanlığın parlaq nümunəsi kimi valideyn-övlad arasındakı qarşılıqlı münasibətlərində məhəbbəti, hörmət və izzəti dönə-dönə tərənnüm etmişdir. Bu da əxlaqi keyfiyyətlərin təbliğində şairin hikmət dolu öyüd və nəsihətlərindən yararlanmaq üçün geniş imkanlar yaradır. Məsələn, “Leyli və Məcnun” poemasında şair əsərin qəhrəmanı Məcnunun dili ilə ananı yüksək dəyərləndirir:

Başımın tacıdır ayağın sənin,
İncini bəsləmiş sənin sədəfin.
Sənin toxumunun məğziyəm, ana,
Ayaq torpağın da cənnətdir mana.

“İsgəndərnamə” poemasında dahi şair anaya böyük hörmət və məhəbbətin yüksək əxlaqi keyfiyyət olduğunun psixoloji məqamlarını açıqlayır. Əsərdə dünyanı fəth edən İsgəndər ölüm ayağında əziz anasına yazdığı məktubda xahiş edir ki, oğlunun ölümünə görə dərd-qəm çəkməsin:

Anacan, bu məktub gəlib çatarkən,
Çatıb qaşlarını kədərlənmə sən.
Bu dünya fanidir, əbəs ağlama,
Mənimçün yas tutma, qara bağlama!

Valideyn-övladın bir-birinə olan qarşılıqlı münasibətini nəzərə çatdıran şair uşağın valideynləri tərəfindən təmənnasız sevildiyini, övladın ailənin sevinci və evin işığı hesab

edildiyini psixoloji çalarlarla ifadə etmişdir. Hər bir valideynin övladına bu cür müraciəti onların şəxsiyyətə çevrilməsində, özünəinamın və özünəgüvənin artmasında, daxili "mən" obrazının formalaşmasında güclü meyar hesab edilir [5, s.103].

İnsanpərvərliyi "insanlığın parlaq gövhəri" adlandıran şair xeyirxahlıq və yaxşılıq məfhumlarının sıx qarşılıqlı əlaqədə olduğunu göstərir. N.Gəncəviyə görə ətrafındakı insanlara qarşı xeyirxahlıq və yaxşılıq nümayiş etdirməyənləri "böyük insan" adlandırmaq olmaz:

Yaxşılıq etməsən əgər insana,
Böyüklük şərəfi verilməz sana.

Bununla belə, insanpərvərlik, xeyirxahlıq və yaxşılıq kimi anlayışların psixoloji mahiyyətini şərh edərkən dahi şair qeyd edir ki, pis adamlara xeyirxahlıq və insanpərvərlik göstərmək yaxşılara yamanlıq etməkdir. O, qəddar və insafsız insanlara qarşı sərt münasibət göstərməyi məsləhət görür:

Həyasız adama qarşı sərt rəftar,
Yumşaq davranmaqdan faydalı olar.

N.Gəncəvinin əsərlərində əxlaqi tərbiyənin inkişaf etdirilməsinə daxil edilən müdrik kəlamlarla ifadə etdiyi əsas mənəvi keyfiyyətlərdən biri də həmrəylikdir:

"İnsansan, insana qatış hər zaman;
İnsanla yaşayır insan hər zaman",

– deyən şair bütün insanları həmrəy olmağa, pozitiv qarşılıqlı münasibət qurmağa, əlaqəli şəkildə birgə yaşamağa çağırır:

İnsanla yaşayan mərddir, kişidir,
Kimsəni sevməmək namərd işidir.

Şair möhkəm əqidəsinə və inamına görə insana sözdə deyil, əməldə möhkəm olmağı tövsiyə edir.

Birlik və həmrəyliyin nəticə etibarı ilə səadətin açarı olduğunu göstərir. Birlik yoxdursa, psixoloji gərginliklər, narahatlıqlar başlayır, bu isə insanları şəxsiyyətlərarası emosional fəlakətlərə sürükləyir:

Bir olsa yoldaşın, dostun əməli,
Daşdan su çıxardar onların əli.
Nifaq olan yerdə fəlakət də var,
Səadət günəşi birlikdən doğar [1, s.189].

Əxlaq tərbiyəsinin və davranış qaydalarının düzgün inkişaf etdirilməsi qaydalarına daxil edilən, şəxsiyyətin inkişafına birbaşa öz təsirini göstərən dostluq və yoldaşlıq keyfiyyətlərinə də dahi Nizami bütün poemalarında xüsusi diqqət yetirmiş, əsərlərində bir sıra nümunəvi davranış meyarlarını özündə əks etdirən dost obrazlarının psixoloji mahiyyətini açıqlamışdır. Səmimi dostluq və yoldaşlıq münasibətlərini hər kəs üçün çox vacib sayan şair "bir həmdəmi", "könül sirdaşı", yəni bir dostu olmayanların həyatda müəyyən çətinliklər yaşamasının psixoloji məqamlarını bu cür açıqlayır:

Həyat nəyə gərəkdir, bir həmdəmin olmasa?
İnsan çətin yaşayar dosta əmin olmasa.

"Yaxşı dost dar gündə tanınar", – deyən ulularımızın bu hikmətini şair məntiqi təfəkkürün gücü ilə daha da qüvvətləndirərək bu cür məsləhət verir:

Elə sadiq dost ara, səni darda qoymasın,
Çəkib tordan çıxarsın, səni torda qoymasın.

"Dostun olmazsa, həyatın da fəlakətdə olar", – deyən Nizamiyə görə həqiqi dost odur ki, dostunun səhvini onun üzünə desin, dostunun sirrini gizli saxlasın, dar gündə ona dayaq olsun, dostluqdan təmənna güdməsin. Dahi şair qərəzli və ikiüzlü adamların yağı düşməndən daha etibarsız və daha qorxulu olduğunu kəskin şəkildə qeyd edir:

Təmənnalı olarsa dostun, aman, dostluğu,
Düşmənçilik deməkdir, dostun haman dostluğu.
İkibaşlı dostluğu dostluq sanma heç zaman,
Qərəzli dost düşməndir, arxalanma heç zaman.

Dostluq və yoldaşlıq münasibətlərinə çox yüksək qiymət verən Nizami hər kəslə dostluq etməməyi də məsləhət görür. Bu misallardan aydın görünür ki, şair insanları pozitiv qarşılıqlı şəxsi psixoloji keyfiyyətlərə malik olan "yaxşı ad qazanmış gözəl

dost"lar aramağa ruhlandırır. Qeyd edir ki, "gözəl dost" insan üçün dünyada hər şeydən üstündür:

Yaxşı ad qazanmış gözəl dost ara,
Ondan yetişərsən ağ günə, vara.

Nizami Gəncəvi təsvir etdiyi bütün hadisələri Azərbaycanla əlaqələndirmiş və vətəninin keçmişini fəxrlə tərənnüm etmişdir. Onun yaradıcılığında vətən məhəbbəti doğma xalqı uğrunda qəhrəmanlıq ideyası ilə birləşir. Vətənpərvərliyi hər bir insan üçün zəruri əxlaqi müsbət keyfiyyət hesab edən N.Gəncəvi böyük vətənpərvər olmuşdur [6, s.201]. O, doğma yurdu Gəncəni çoxsaylı təkliflərə baxmayaraq, şan-şöhrətə, var-dövlətə dəyişməmiş, ömrünün sonunadək oranı tərk etməmişdir. Vətənpərvərlik anlayışına çox geniş mənada yanaşan Nizamiyə görə vətənpərvərlik təkcə vətəni sevməklə bitmir, əsl vətənpərvərlik hissləri Vətəni yadellilərdən qorumaqdır. Şairin əqidəsinə görə, Vətəni hamı sevməli və doğma elini göz bəbəyi kimi qorumalıdır:

Çalış ki, kirpiyin olsun almaztək,
Ayıq ol, ölkənin keşiyini çək.

"Dünya yurdumuzdur, candan əzizdir", – deyən şair, "bizim doğma yerimiz, yurdumuz olduğu üçün biz onu canımızdan da çox sevməliyik" kəlamı ilə insanlarda vətən sevgisini daha da möhkəmləndirir. "Doğma yurdda insanın qul olması qərib ölkədə sultan olmasından daha yaxşıdır" fikrinin isə psixoloji mahiyyəti daha dərin və parlaqdır:

Azacıq düşünsən bir nüktə vardır:
Hər kəs öz şəhrində bir şəhriyardır.
Öz şəhrində olsan ən alçaq insan,
Yaxşıdır qürbətdə sultan olmaqdan.

"Qürbət cənnət olsa da, yenə Vətən yaxşıdır", – deyən ata-babalarımızın hikmət dolu vətənpərvərlik tərənnümünü uca tutan ulu Nizami, İsgəndər kimi fatehin – yüzlərlə cənnət ölkəni öz ixtiyarına keçirmiş bir hökmdarın vətən həsrətini çox təsirli psixoloji boyalarla təsvir edir:

İsgəndər hər yerdə qələbə çaldı,
Lakin vətən eşqi qəlbini aldı.

Hökmündə olsa da saysız vilayət,
Öz doğma yurduna çəkərdi həsrət.

Məlum olduğu kimi, hazırki dövrdə müasir gənclərdə böyük aktuallıq kəsb edən hərbi-vətənpərvərlik hisslərinin aşılanması, inkişaf etdirilməsi vacib əxlaqi keyfiyyət olmaqla vətənpərvərlik anlayışının tərkib hissələrindən biridir. Dahi şairin kəlamları bu gün də öz aktuallığını qoruyub saxlamaqla hər gəncə müqəddəs örnək verir:

"Can yandırsan orduna, məmləkətə, yurduna,
Arxalana bilərsən, öz xalqına, orduna".

N.Gəncəvi öz poemalarında vətəni sevməklə bərabər, onu qorumağın çox vacib olduğunun zəruriliyini dönə-dönə xatırlatmış, onun yadelli işğalçılardan və əsarətdən xilas edilməsi yollarını da məharətlə əks etdirmişdir [7, s.145]. Şair əsərlərində Vətən uğrunda mübarizənin üç yolunu tövsiyə və təsvir etmişdir: birincisi, "ağılla, tədbirlə" (siyasi yol – Nüşabənin dünya fatehi İsgəndərə qarşı istifadə etdiyi yol): ikincisi, "qılıncın gücü ilə" (hərbi yol – Xosrovun öz ölkəsini azad etmək üçün istifadə etdiyi yol); üçüncüsü, ağlın və qılıncın gücünün birləşdirilməsi yolu (siyasi-hərbi yol – fateh İsgəndərin üstünlük verdiyi yol). Şair poemasında Əflatunun dili ilə İsgəndərə verdiyi məsləhət mahiyyətcə xüsusi psixoloji dəyərə malikdir:

Mərdlərin qan tökən qılıncı, bəlli,
Alim tədbiri ilə olar kəsərli.

Şəxsiyyət psixologiyasında əxlaqi hisslərin inkişafı və formalaşmasına aid olan yüksək əxlaqi keyfiyyətlərdən biri də, insan davranışında düzlük və doğruçuluq xüsusiyyətləridir. Şairin bütün poemalarında və ömrü boyu insanlara düzlük və doğruçuluq xüsusiyyətlərini təlqin etməyə çalışması, insanları düzgün və doğru qarşılıqlı davranışa səsləməsi çox böyük psixoloji əhəmiyyət kəsb edir:

“Nə qədər ki, dünyada alıb-verirsən nəfəs,
Sən düzlük qapısını döyməyə göstər həvəs”,

– deyən şair insanları düzlüyə, doğruçuluğa səsləyir və bunların dünyanın nicat yolu olmasını hesab edir:

Doğruçuluq yaxşıdır, uymayın yada,
Bircə düzlükdədir nicat dünyada.

Şair doğruçuluq xüsusiyyətini insanın müsbət şəxsi keyfiyyətlərini əks etdirən və onu hər an qoruyan "zireh" adlandırır. Əyriliyin, yalanın isə mənfi psixoloji xüsusiyyət olduğunu açıb göstərir. Həyatın başlıca şərtlərindən olan doğruçuluq xüsusiyyətini "vicdan tərəzisi" adlandırır. O, öz əsərlərində xarakterdə düzlük və doğruçuluq xüsusiyyətinin formalaşmasını insanın həyatda ucalmağının zəruri şərtlərindən biri hesab edir:

Əyri gülü düzlükdə tikan qucar, aldadar,
Bil ki, şəkər qamışı düzlüyündən bal dadar.
Doğruluğun harda ki, ucalıbdır bayrağı,
Haqq əliylə fələkdən öc alıbdır bayrağı.

Bu vacib əxlaqi keyfiyyətlərin psixoloji mahiyyətini və əhəmiyyətini dərindən anladan dahi Nizami xarakterində olan məhz doğru sözləri və düz əməlləri sayəsində ən uca ad olan "kamil şəxsiyyət" adını qazanmışdır. Bunu şairin özü də səmimiyyətlə etiraf edir:

Doğru sözə bağlıdır öz qüdrətin həmişə,
Qoy qüdrətdən güc alsın söz qüdrətin həmişə.
El gözündə Nizami ucalıbdır düzlükdən,
İlhamına, qəlbinə güc alıbdır düzlükdən.

Əsərlərində sadəlik və təvazökarlıq kimi müsbət şəxsi psixoloji keyfiyyətlərin əhəmiyyət və mahiyyətini "ağac bar gətirdikcə, başını aşağı salar" dəyəri ilə aşılamağa çalışan şair xarakterində təvazökarlığı olmayan insanları zəhərli ilana bənzədir:

İlantək dikbaşlı gəzmə, ey insan!
Aşacaq dünyanın seli başından...
Çox da yüksəkliyə ucalma ki, sən,
Torpağa düşəndə inciməyəsən.

Dahi şairin fikrincə, insan şəxsiyyəti xaraktercə nə qədər sadə və təvazökar davranış nümayiş etdirsə, öz xalqına baş əyməyi bacarsa, o, xalqının gözündə əbədi olaraq ucalacaqdır:

Ucalar özünü əyən insanlar,
Təvazö sahibi hörmət qazanar.

Şan-şöhrətə, bər-bəzəyə aludə olan insanlara mənfi münasibətini gizlətməyən, onları kəskin şəkildə tənqid edən şair insanın gözəlliyi onun xarakterindəki sadə

davranış və münasibətində, rahatlığı isə sadə həyat yaşamağında olduğunu psixoloji çalarlarla əks etdirir:

Torpaq vücuduna vurma min bəzək,
İnsana qum kimi sadəlik gərək.

“Öz-özünə vurulub bəyənmə sən özünü” fikrini hamıya aşılamağa çalışan dahi Nizami demək olar ki, bütün poemalarında özünə müraciətlə: “təvazökar ol!” – deyir. Şairin fikrincə, özünü hamıdan yüksək qiymətləndirən və yüksək eqoya malik olan insanların xarakterində olan bu mənfi xüsusiyyət həyatda heç vaxt başqaları tərəfindən qəbul edilməz, təvazökar və sadə insanlar isə daha uzun ömür sürər:

Özünü bəyənsə insan nə qədər,
Öz gözündən ona dəyər bəd nəzər.
Özündən razılar hər zaman sınar,
Ondan qurtarana uzun ömür var.

Bu misraların təhlili göstərir ki, şan-şöhrət zirvəsinə yüksəldiyinə baxmayaraq, heç vaxt öz sadəliyini və təvazökarlığını xalqın qarşısında itirməyən dahi Nizami kamil bir şəxsiyyət kimi davranışındakı və insanlara münasibətindəki belə gözəl əxlaqi keyfiyyətlərinə görə bu gün gənc nəslə bir örnək, onun şəxsi həyatı isə hər kəs üçün mükəmməl tərbiyə nümunəsidir. Şairin əsərlərində əks etdirdiyi və dönə-dönə toxunduğu mənfi və əxlaqi davranış keyfiyyətlərini belə qruplaşdırmaq olar: paxıllıq, yalançılıq, tamahkarlıq, ikiüzlülük, haqsızlıq, satqınlıq, vicdansızlıq, qəddarlıq, tənbəllik, israfçılıq, lovğalıq, qorxaqlıq, iradəsizlik və s. Qeyd olunan keyfiyyətlərin hər birinin mahiyyəti və təkcə insanın şəxsi psixoloji həyatı üçün deyil, bütövlükdə cəmiyyət üçün zərərli davranış xüsusiyyəti olması haqqında şairin poeziyasında, xüsusilə, “Xəmsə”də hikmətli psixoloji mahiyyət kəsb edən ifadələr, kəlamlar, beytlər kifayət qədərdir. İnsanların şəxsi mənəviyyatını korlayan bu mənfi emosional davranışa şair bütün poemalarında tənqidlə yanaşır.

“Sirlər xəzinəsi”, “Xosrov və Şirin” poemalarında isə bu davranışın psixoloji açıqlaması ustalıqla verilmişdir.

Şahlara, hökmdarlara baş əyməyən, sözünü birbaşa hər kəsin üzünə deməyi bacaran məğrur şairin ən çox nifrət etdiyi mənfi əxlaqi davranış xüsusiyyəti olan ikiüzlülükdür. O, əsərlərində bu cür xarakterə malik olan insanları saxta qızıl, qəlp pul kəsənlərə bənzədir. Belələrini “üzü qızıl, içi mis” adlandırmaqla bərabər, ikiüzlülərin üzünə baxanda “aydan arı, sudan duru” görünsələr də, daxildən xəbis və

kinli xarakter xüsusiyyətlərinə malik olmalarının psixoloji çalarlarını bu cür qabarıq şəkildə nümayiş etdirir:

Üzü qızıl, içi mis saxta pul san onları,
Hər sözünə qulp qoyar, tanı hər an onları.
Üzlərinə baxanda aydan arı hər biri,
Əməliylə aləmin riyakarı hər biri.
Üzdə şamdır, daxildə düyünlü ad hamısı,
Üzdə sadə, daxildə xəbis vücud hamısı.

Dahi şair əsərlərində mənfi əxlaqi davranış xüsusiyyətlərindən olan tamahkarlığın yüksək dərəcəsi olan hərisliyi də ifşa edir. O, tamahkarlıq və hərislik kimi mənfi xarakterik xüsusiyyətlərə malik olan insanları qazandıqları nemətlərə qane olmağa səsləyir:

Çibintək, mığmığatək qan sormağa can atma,
Tamahın neştəriylə ürəyini qanatma.
Qarşına gələn nemət qismətindir, yeyərsən,
Ruzi verən kimsəyə min-min alqış deyərsən.

İnsanlara "həyat sağlam əməkdən ibarətdir" çağırışı edən şairin əqidəsinə görə, hərtərəfli inkişaf etmiş şəxsi keyfiyyətlərə malik olan insan yalnız halal əməyi və zəhməti hesabına cəmiyyətdə yüksək mövqe tutar, şan-şöhrət sahibi olar.

Həyatda qarşılaşdığı həm mənəvi, həm maddi, həm də psixoloji emosional çətinliklərə insan yalnız öz yorulmaz əməyi sayəsində qalib gələ bilər:

Əməkdir insanı ucaldan, inan,
Əməklə çıxarsan fırtınalardan.

Şairin fikrincə, halal zəhmət insanı firavanlığa, şadlığa, rahatlığa, şan-şöhrətə çatdırmaqla yanaşı, xarakterindəki əxlaqi keyfiyyətləri saflaşdırmağa, onda insanlara qarşı mərhəmət və empatiya hisslərini oyatmağa qadirdir:

Öz halal zəhmətinlə namuslu insan sayıl,
Hər yetənə alçalma, əl açıb olma sail.

Qeyd olunan nümunələrdəki başlıca fikir və ideyalarda N.Gəncəvinin əməyin iqtisadi, sosial, əxlaqi, psixoloji, idrak və tərbiyəvi mənası ilə bağlı hikmətli kəlamlarından tərbiyəvi nəticə çıxarmağı, ömrü boyu halal zəhməti ilə dolanan,

şahlara baş əyməyən, gecə-gündüz yorulmadan çalışan, hər əzaba qatlaşan və məhz gərgin əməyi sayəsində dünya poeziyasının korifeyi zirvəsinə ucalan zəhmətkeş şairin şəxsi həyatı bizim üçün kamil bir nümunədir.

Müasir elmi psixologiyaya görə, əmək tərbiyəsinin başlıca tərkib hissələrindən biri peşəyönümü işidir. Peşəyönümü işində peşələrə maraq tərbiyəsi və peşə seçmək üçün məsləhətin verilməsi mühüm rol oynayır. “Xəmsə”nin bu məsələlər baxımından tədqiqi və təhlili göstərir ki, dahi Nizami demək olar ki, bütün poemalarında müxtəlif peşə və sənət növlərinə diqqəti cəlb etmiş, onların psixoloji əhəmiyyətini, səciyyəvi xüsusiyyətlərini, cəmiyyətdəki mövqeyini açıb göstərmişdir.

Kamil insan konsepsiyasına sonadək sadiq qalan böyük şair peşə seçimi işində məsləhət görür ki, hansı peşəni seçməyindən asılı olmayaraq, insan çalışmalıdır ki, öz sənətinin kamil ustası olsun, seçdiyi peşənin dərinliyinə və incəliklərinə bələd olsun. Nizaminin qəti inamına görə: “Kamil bir palançı olsa da insan, yaxşıdır yarımçıq papaqçılıqdan.”

Şair doğma oğlu Məhəmmədə “Leyli və Məcnun” poemasında tövsiyə edir ki, oğlu özünə peşə seçərkən “yüz ölçüb, bir biçsin”. Ən əsası isə hansı peşəni seçməyindən asılı olmayaraq, onun sirlərinə mükəmməl bələd olmaq üçün həvəslə səy göstərsin:

İsa mərifətli həkim ol, amma,
İnsanı öldürən bir həkim olma [1, s.65].

Peşəyönümü ilə əlaqədar mütəfəkkir-şairin öyrətmək istədiyi həyat həqiqətlərindən biri də budur ki, hər bir insan gərək öz peşəsi ilə məşğul olsun, bacardığı sənətin qulpundan yapışsın, “ayağını yorğanına görə” uzatsın, gücü çatmayan, başı çıxmayan işin ağırlığını öz çiyinlərinə qaldırmasın. “İsgəndərnamə” poemasından böyük fateh İsgəndərlə cavan əkinçinin söhbətini buna misal göstərmək olar:

Bir gün İsgəndər səfər zamanı münbit torpaqlı bir ərazidə iş görən gənc bir oğlana “gözəl bir gəncsən, bu torpaqla niyə əlləşirsən?

Gözəl insanlar gözəl işlərlə məşğul olar “ – deyə sual verir. Gəl, bu torpaqdan əl çək, istəsən, “sənə lap şahlıq verərəm”. Gənc əkinçi oğlan İsgəndərin bu təklifinə özünəməxsus şəkildə – ağılla cavab verir:

Başqa iş bilmirəm, əkinçiyəm mən,
Padşahlıq eləmək gəlməz əlimdən.

N.Gəncəvi "kamil insan" konsepsiyasına sadiq qalaraq, "gözəllik" anlayışını hərtərəfli açıqlamış, ideal gözəlliyə malik obrazlar yaratmışdır. Dahi şairin yaratdığı gözəl insan obrazları zahiri və daxili-mənəvi zənginlikləri ilə vəhdətdədir. Məcnun, Leyli, Bəhram, Xosrov, Şirin, Fərhad, Nüşabə, İsgəndər və s. obrazları həm zahirən, həm də daxilən ağıllı, əxlaqlı, tərbiyəvi davranışlı olaraq bütöv mənəviyyatca gözəldirlər [8, s.56].

Nizami Gəncəvinin əsərlərində xalqımızın fəlsəfi fikri, milli sosiologiya, psixologiya da öz əksini tapmışdır. Bu mənada, böyük şairin əsərləri bütün yaş qrupları, o cümlədən uşaqlar üçün aktualdır. Məsələn, onun ən məşhur sayılan "Fitnə" əsəri istər uşaqların mənəvi-psixoloji inkişafında, istər gənc nəslin tərbiyəsində, istərsə də böyüklər üçün ibrətamizliyinə görə olduqca dəyərlidir.

N.Gəncəvinin bütün yaradıcılığı Azərbaycan psixoloji fikrinin yaranması, inkişafı və formalaşmasında əhəmiyyətli rol oynamışdır. Onun yaradıcılığı bir tərəfdən xalqın təfəkkür tərzinin inkişafına təkan vermiş, digər tərəfdən bu əsərlərin özündə həyat reallıqları öz əksini tapmışdır. Psixoloji fikrin inkişaf mərhələlərinin müəyyənləşdirilməsində şairin demək olar ki, bütün əsərləri qiymətli bir mənbə, əvəzsiz xəzinədir. Biz öz gələcəyimizin sosial-psixoloji tərbiyəsində milli ənənələrə söykənməliyik. Milli ənənələrimizin ən bariz nümunələrindən biri isə Nizami Gəncəvi ədəbi irsidir. Bu irsin araşdırılması, tanıdılması vətənpərvər gələcəyimizin yetişməsinə də öz töhfəsini verəcək.

## Nəticə / Conclusion

Nizaminin poeziyası doqquz əsrə yaxındır ki, insanların qəlbini öz işığı ilə nurlandırır. Dahi şəxsiyyət insanları ağıla, kamala, dünyanın sirlərinə dərindən bələd olmağa, "hər gizli xəzinədən bir dürr çıxarmağa", gecə-gündüz yorulmadan çalışaraq dərin biliklərə yiyələnməyə, mənəvi saflığa, halal əməklə yaşamağa, "zəhmət tikanından" qorxmamağa, fiziki kamilliyə, öz həyatını gözəllik qanunları əsasında qurmağa, "həyat üçün yaranmış canlıları sevməyə, vahid orqanizm olan təbiəti qorumağa, qənaətlə dolanmağa, haqqa-ədalətə, qanunlara (kimliyindən asılı olmayaraq) boyun əyməyə, hərislikdən, tamahdan, xəbislikdən, paxıllıqdan, riyakarlıq və yalandan, böhtançılıqdan, lovğalıqdan, qəddarlıq və zülmkarlıqdan uzaq gəzməyə, özünü dərk etməyə, tanımağa və düzgün qiymətləndirməyə, bir sözlə, "kamil insan" zirvəsinə yüksəlməyə səsləyir.

Nizami Gəncəvi yaradıcılığının nəşri, tədqiqi və təbliği bu gün də diqqət mərkəzindədir və bu sahədə atılan hər bir uğurlu addım bizi böyük Azərbaycan şairinin ölməz bəşəri ideyalarına daha da yaxınlaşdırır, bəşəriyyətin xoşbəxtliyi uğrunda mübarizədə onu bizim mənəvi müasirimizə çevirir. Bəli, elə bu baxımdan da qeyd etmək lazımdır ki, Nizaminin bizə qoyub getdiyi ədəbi irs tükənməz bir xəzinədir.

Dahi şairin təhsil, təlim və tərbiyəyə dair dərin və əvəzedilməz psixoloji məna kəsb edən fikir və ideyalarından istifadə yolları rəngarəngdir. Başlıcası, əsas məsələ bu sistemdən təlim və tərbiyənin keyfiyyətini yüksəltmək vasitəsi kimi səmərəli istifadə etməkdir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Apoyev B. (2008). Nizami Gəncəvinin pedaqoji görüşləri. Bakı, Adiloğlu. 244 s.
2. Babayeva T.T. (2000). Nizami Gəncəvinin ədəbi irsində şəxsiyyət problemi. Bakı, Nurlan. 198 s.
3. Əlibəyzadə E. (2004). Nizami və tariximiz. Bakı, 186 s.
4. Əlizadə Ə., Şirinova Z. (2006). Nizami Gəncəvinin psixoloji görüşləri. Bakı, ADPU. 277 s.
5. Əhmədov Ə. (2001). Nizami-Elmşünaslıq. Bakı, 254 s.
6. İbrahimov Ş. (2012). Bütün dünyanın böyük mütəfəkkiri. “Təhsil” jurnalı. Yanvar, s. 30-35.
7. Kərimli T. (2002). Nizami və tarix. Bakı, Elm. 241 s.
8. Şirinova Z. (2002). Nizami Gəncəvinin psixoloji görüşləri. Bakı, 151 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 59-66
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.006

**AZƏRBAYCAN ƏDƏBİYYATI**
**NİZAMİ GƏNCƏVİ – 880**

# Türk dünyasının dahi şairi – Nizami Gəncəvi

***Nüşabə Səfərova***
Bakı şəhəri 286 №-li tam orta məktəbin Azərbaycan dili və ədəbiyyat müəllimi. Azərbaycan.
E-mail: seferova.nushabe@gmail.com
https://orcid.org/0000-0001-7220-8124

**XÜLASƏ**
N.Gəncəvi həm yaradıcılığı, həm də şəxsiyyəti ilə bütövlükdə bir dahidir. Şair öz yaradıcılığı ilə dövrünün dolğun fəlsəfəsini yaratmışdır. Əsərləri isə hər biri özlüyündə həmin fəlsəfənin bir qolunu, bir qanununu özündə ehtiva edir. Özündən sonra gələn alimlər əsərlərində və yaradıcılıqlarında bu fəlsəfədən geniş şəkildə istifadə etmişlər. Əgər Azərbaycan poeziyasının məhəbbət simvolu dahi Füzulidirsə, xarakteri kimi yaradıcılığı da üsyankar olan nümayəndəsi Xaqanidirsə, əzabkeş övladı Nəsimidirsə, düşünən beyni, ağsaqqalı Nizamidir, desək, yanılmarıq. Qələmə aldığımız bu yazıda dahi şairə "N.Gəncəvi kimdir?" və yaxud "N.Gəncəvi olduğu kimi" kontekstindən yanaşılmışdır. Şairin şirin qəzəllərinə baş vurulmuş, dünya poeziyasının incisi "Xəmsə"yə daxil edilən poemalar bir daha nəzərdən keçirilmişdir. Nüşabələr, Şirinlər, Fitnələr yad edilmiş, Xosrovlar, İskəndərlər, Bəhramlar bir daha göz önündə canlandırılmışdır. Şairin dillər əzbəri olan aforizmləri bir daha xatırlanmışdır.

**AÇAR SÖZLƏR**
Nizami, poeziya, lirika, qəzəl

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 14.12.2020
qəbul edilib: 19.01.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 59-66
https://dx.doi.org/10.48445/TAIIJ.2021.34.97.006

**A Z E R B A I J A N I   L I T E R A T U R E**
**N I Z A M I   G A N J A V I – 880**

# A great poet of the Turkish world – Nizami Ganjavi

***Nushaba Safarova***
Teacher of Azerbaijani language and literature of Baku city secondary school No. 286. Azerbaijan. E-mail: seferova.nushabe@gmail.com
https://orcid.org/0000-0001-7220-8124

**ABSTRACT**
N.Ganjavi with both creativity and personality is a genius as a whole. The poet created a full philosophy of his time with his work. Each of his works embodies a branch of that philosophy, a law. Subsequent scholars have made extensive use of this philosophy in their works and creations. If the symbol of love in Azerbaijani poetry is the great Fuzuli, if his character is a rebellious representative of Khagani, if he is the tormented son Nasimi, if he is the thinking brain, the elder Nizami, we are not mistaken. In this article, the great poet "Who is N. Ganjavi?" or from the context of "as N.Ganjavi". The poet's sweet ghazals were recited, and the poems included in "Khamsa", the pearl of world poetry, were reconsidered. Nushabas, Shirins, Fitnas were commemorated, Khosrovs, Iskanders, Bahrams were revived. The poet's aphorisms, which are the memorization of languages, are remembered once again.

**KEYWORDS**
Nizami, poetry, lyrics, ghazal

**ARTICLE HISTORY**
Received: 14.12.2020
Accepted: 19.01.2021

## Giriş / Introduction

1141-ci ildə qədim Gəncə torpağında bir Günəş doğdu. Bu, çox fərqli bir Günəş idi. Bu Günəşin fərqi onda idi ki, o biri ulduzlar zaman keçdikcə öz ziyasını itirir və nəhayət, tamamilə tükənərək sönür, Gəncədə doğan Günəşin isə əksinə, zaman keçdikcə şəfəqi gurlaşır, bütün dünyanı nura boyayır. Bu Günəşin şəfəqi bütün bəşəriyyəti xəzinələrin sirlərindən agah edir, dünyaya meydan oxuyan İskəndərləri, Xosrovları, dünyanın yeddi gözəlini özünün söz dünyası ilə ram edir və qarşısında diz çökdürür. Özü isə söz sərkərdəsi olaraq, heç bir hökmdarın qarşısında baş əymir. Bu sərkərdə dünya ədəbiyyatının sultanı, dünya lirik və fəlsəfi poeziyasının korifeyi, Azərbaycan ədəbiyyatının patriarxı, milli qürurumuz olan Cəmaləddin əbu Məhəmməd İlyas ibn Yusif ibn Zəkiəddin və yaxud sadəcə Nizami Gəncəvidir.

N.Gəncəvi öz dövrünün ən möhtəşəm filosof alimlərindən biri olmuşdur. Əsərlərindən də göründüyü kimi, o, "Quran"ı dərindən bilmiş, təbiət elmləri: astronomiya, coğrafiya, təbabətdən və hətta riyaziyyatdan da dərin biliyə malik olmuşdur. Böyük Nizamişünas alim, professor Rüstəm Əliyev yazır: "Mübaliğəsiz deyə bilərik ki, Nizami öz dövrünə məlum olan hər şeydən xəbərdar olmuşdur. O, fars və ərəb dillərini gözəl bilmişdir. Onun yazdığı hər misra buna inandırıcı sübutdur. Xatırladaq ki,o zaman Gəncədə, bütün Arranda danışıq dili türk dili idi, əhalinin böyük əksəriyyəti bu dildə danışırdı. Ərəb dili elm və din dili, fars dili poeziya dili hesab olunurdu. Nizami ərəb və fars dilli ədəbiyyatı gözəl bilirdi. Bu qədər hərtərəfli və dərin biliyə, böyük istedada malik olan, söz sənətinə məharətlə yiyələnən Nizami, şübhəsiz, saray şairi də ola bilərdi".

Şair gözəl bilirdi ki, saray şairi olmaq müstəqilliyi itirmək, əsl yaradıcılıqdan məhrum olmaq, yalnız mədhiyyələr və sifarişli əsərlər yazmaq deməkdir. O, saraylara olan bütün dəvətləri geri çevirərək, müstəqillik yolunu seçdi. Bu addımı hər qələm sahibi ata bilməzdi. Sarayların gözqamaşdıran məclisləri və şairlərə verilən ənamlar çoxlarını özünə cəlb etsə də, Nizamini yolundan döndərə bilməmişdi. Bunu yalnız o şairlər edə bilərdilər ki, onlar öz istedadlarının gücünə arxayın idilər. Böyük Nizami Gəncəvi də məhz belə şairlərdən idi.

Hələ gənclik illərində ilk yaradıcılıq nümunələrindən məlum olurdu ki, ədəbiyyata bir istedad gəlməkdədir. Onun ilk qələm təcrübələri qəsidə və qəzəllər olmuşdu. Şair qəsidələrində xeyirxah əməllər tərənnüm edir, hakimlərə, mənsəb sahiblərinə ədalətli olmağı tövsiyə edirdi. Əsərlərindən, xüsusilə 1188-ci ildə yazmış olduğu "Leyli və Məcnun" poemasından məlum olur ki, şairin lirik şeirlərindən ibarət "Divan"ı da olub. Çox təəssüf ki, həmin divan günümüzə qədər gəlib çatmayıb.

Araşdırmalara əsasən, həmin divan ən azı iyirmi min beytdən ibarət olsa da, ondan bu günümüzə sadəcə 6 qəsidə, 120 qəzəl, 30 rübai gəlib çatmışdır.

Gedir əldən gecələr səbrü qərarım sənsiz,
Aldığım hər nəfəs atəşdi, nigarım, sənsiz.

– beyti ilə başlayan qəzəli də, məhz həmin “Divan”dan bizə gəlib çatan nümunədir. Dahi Üzeyir Hacıbəyli bu qəzəlin əsasında "Sənsiz" romansını bəstələmiş, böyük sənətkarımız Bülbül isə onu ifa etmişdir. Mənə elə gəlir ki, bu, Üzeyir bəyin, bəlkə də, ən rahat bəstələdiyi əsərlərdən biridir. Çünki qəzəl özü başdan-ayağa musiqi ilə yoğrulduğu üçün musiqi onun daxilindən süzülüb gəlir:

Hicrinin zülmü deyir: vəslinə and olsun, inan,
Qaçmayıb tab edəcəm, yoxdu güzarım sənsiz.

Və yaxud başqa bir qəzəl:

Ey möcüzə Ay, sən kimə mehman olacaqsan?
Bu hüsn-cəlal ilə, kimə canan olacaqsan?

Axşam başın üstündə səma çətrini açmış,
Sən ay çətirinlə kimə sultan olacaqsan?

Bu dahiyanə qəzəlləri oxuduqca ürəyimizdən bir sual keçir: "İlahi, bunları insan oğlumu yaradıb?" Cavab isə birdir: "Bəli, bunları yalnız dahi Nizami yarada bilərdi".

Nizaminin dahiliyi ondadır ki, o, insanın özündən asılı olan qüsurları fələkdə, çərxdə, divdə, şeytanda deyil, əksinə, nəfsdə, tamahda, şöhrət düşkünlüyündə, öz idrakının imkanlarını gərəyincə qiymətləndirməməkdə görür. Bütün bunlardan qurtulmaq üçün insanın öz qüvvəsini yardıma çağırır və bildirir ki, bu qüvvə ağıldır, yalnız ağıl sayəsində insan yüksələ bilər:

Əgər yar olmasaydı, ağlın, idrakın sənə,
Səni kim qaldırardı insanlıq pilləsinə?

Ağıl Məsihadır, bil, ondan üz döndərmə sən,
Ulaqsanmı, palçığa ulağını sürürsən?
Ya get ağıl yoluyla, çıraq tapıb işıqlan,
Ya da bir yolluq əl çək, sən ağıl qapısından.

Nizaminin sərraf gözləri cəmiyyəti saf-çürük edərkən, əməkçini müftəxordan, halallıq əhlini haram yeyənlərdən qətiyyətlə ayırır. Onlar əxlaq və dünyagörüşcə daban-dabana zidd olan təbəqələri, zümrələri təmsil edirlər. Nizami bəşəriyyətə nümunə ola biləcək insanları yalnız və yalnız əməkçilər, öz zəhmətinə güvənənlər, halallıq dalınca gedənlər sırasında tapır. Halallıq ləyaqət meyarı, hər xilqətin hörmət və nüfuzunu müəyyənləşdirən və onun qarşısına qoyduğu məqsədin böyüklük dərəcəsidir. Kərpickəsən qocanı işcillikdə ittiham edən, "bir doyumluq çörəyi səndən kim əsirgəyər?" fəlsəfəsi ilə çıxış edən dəliqanlıya qocanın verdiyi cavab daha kəskin, daha sərrastdır:

Qoca dedi: -Ay bala, dəliqanlılıq etmə,
Öz işinlə şuğullan, mənə ağıl öyrətmə.

Hər sənətin sahibi öz işilə yaşayır,
Qocalar kərpic kəsər, kölələr yük daşıyar.

Əziyyətli olsa da, öyrəndim bu sənəti,
Ki, boynumda qalmasın bir kimsənin minnəti.

Xəzinə yığmıram ki, məsxərəyə qoyulum,
Əlimin zəhmətilə dolanıram, ay oğlum.

Bu sətirlər oxuculara cahanda üzü ağ, başıuca, məğrur yaşamağın yeganə yolunu göstərir. Oxuduqca görürük ki, "Sirlər xəzinəsi", həqiqətən, mədəni sərvət, xəzinədir. Bir elm xəzinəsi, bir fəlsəfə xəzinəsi, bir ədəb-ərkan xəzinəsi və nəhayət, bir insanlıq xəzinəsidir. Yaşından, dinindən, dilindən və idrakından asılı olmayaraq, hər bir insan özünü orada tapa bilər.

N.Gəncəvinin dahiliyi bir də onda özünü göstərir ki, o, əsərlərini yazmağa başlayarkən, dildə gəzən şaiyələrdən istifadə etmir, əsərin qəhrəmanı haqqında bir çox mənbələrlə tanış olur. Buna görə də dahi Nizaminin əsərləri hər dövr üçün aktualdır. Biz bunu "İskəndərnamə" poemasında görürük. Şair dünya fatehi İskəndəri

Azərbaycana gətirir və Bərdə hökmdarı Nüşabə ilə görüşdürür. Halbuki onun ayağı heç zaman Azərbaycana dəyməyib. Nüşabə surəti Azərbaycan təbiəti ilə həmahəng yaradılıb. Cəsurluqda kişilərdən geri qalmayan Nüşabəni şair ən zərif və unudulmaz boyalarla canlandırmışdır. Eyni zamanda o, "Leyli və Məcnun" poemasında sərt orta əsr mühitində məhvə məhkum olunmuş ülvi məhəbbətin faciəsini dahiyanə ustalıqla təsvir etmişdir.

Nizaminin qələmə aldığı "Yeddi gözəl" poeması fərqli mövzudadır. Qədim İran hökmdarlarından olan Bəhram Gurun həyatı və əməlləri barədə rəvayət yeddi gözəlin söylədiyi ibrətamiz novellalarla əvəz olunur. Dahi şair Bəhram şahın timsalında ədalətli, ideal şah haqqında fikirlərini oxucunun diqqətinə çatdırır. Deyilənə görə, şair 1180-ci ildə qələmə aldığı "Xosrov və Şirin" əsərində dünyalarca sevdiyi və vaxtsız itirdiyi həyat yoldaşı Afaqın surətini yaradıb. Bu əsərdə İran şahzadəsi Xosrov və onun sevdiyi Şirindən bəhs olunur. Şair poemada Şirinin gözəlliyi, azadlıqsevərliyi, nəcibliyi, ağlı və məhəbbətini ön plana çıxarır. Sözsüz ki, Şirini saf məhəbbətlə sevən, sevgilisinin yolunda hər cür təmənnasız hünər göstərməyə hazır olan Fərhadı da yaddan çıxarmaq olmaz. Prof. R.Əliyevin dediyi kimi: "Xosrov və Şirin" dünya poeziyasının ülvi məhəbbəti, nəcib hissləri, sevgilisinin yolunda həyatını qurban verməyə hazır olan qəhrəmanların yüksək mənəviyyatını alqışlayan ən gözəl abidələrdən biridir".

N.Gəncəvinin yaradıcılığında aforizmlər xüsusi yer tutur. Əsərlərinin daha da dolğun və real görünməsi üçün o, xalq deyimlərindən və aforizmlərdən geniş şəkildə istifadə etmişdir. Şair söylədiyi fikirləri hər vasitə ilə aforizmlərlə, həyatdan götürülmüş ibrətamiz misallarla möhkəmlətməyə çalışmışdır. Bu aforizmlərin bir qismi əməyə, zəhmətə məhəbbət aşılayır, insanı xalqa xidmətə, nəcib əməllərə səsləyir.

Çalış öz xalqının işinə yara,
Geysin əməlindən dünya zər-xara.

Çox iti zehinlər yatan oldular,
Axırda saxsı qab satan oldular.

Qana qəltan etsə də, səni zəhmət tikanı,
Çalışmaqdan usanma, işə alışdır canı.

Nizaminin yaradıcılığındakı aforizmlər yalnız əməyə məhəbbət aşılamaqla bitmir, onların içərisində ölkəni ədalətlə idarə etmək, elmə, biliyə yiyələnmək kimi məsələlərə də toxunulur. Təsadüfi deyil ki, tədris proqramında, əsasən də inşa, esselərdə bu aforizmlərdən geniş istifadə olunur:

Zülmkarlıq dağıdar, bərbad eylər ölkəni,
Ədalət səadətlə abad eylər ölkəni.

Məmləkətin dayağı ədalətdir hər zaman,
Ədalətlə nəsibin səadətdir hər zaman.

Əzəl gündən qiymətli bir incidir doğru söz,
Acısıyla könüllər sevincidir doğru söz.

Dahi Nizami o qədər sevilən bir sənətkar olmuşdur ki, onun dahiliyi və böyüklüyü qarşısında hamı heyran qalmışdır. Buna görə zaman-zaman onu öz adına çıxarmaq istəyən, özününküləşdirməyə cəhd edən ölkələr və xalqlar olmuşdur. Biri fars, digəri kürd, bir başqası isə ayrı ad vermişdir. Lakin Nizami türk oğlu türk olduğunu əsərlərində bildirmişdir. Belə ki, məşhur hökmdar türk qızı Nüşabənin dünya fatehi İskəndərə, eyni zamanda da Fitnənin Bəhram Gura verdiyi ağıl, nəsihət və dərs onu deməyə imkan verir ki, türk qızlarını göyə qaldırmaqla şair hansı xalqa mənsubluğunu bildirir.

Onu demək lazımdır ki, Nizami kimi dahilər bütün dünyaya mənsubdur. Hələ 1941-ci ildə müharibənin qızğın vaxtında, SSRİ-nin taleyi həll olunan günlərdə, o günlərdə ki, Leninqrad blokadada idi, Moskva ilə düşməni 25 kilometrlik bir məsafə ayırırdı, onda Leninqradda dahi şairin 800 illik yubileyi çox təntənəli şəkildə keçirilib. Bu onu göstərir ki, kimliyindən asılı olmayaraq, Nizamiyə ümumxalq sevgisi olub. Azərbaycanın ədəbi-mədəni irsinə həmişə qayğı ilə yanaşan ümummilli liderimiz Heydər Əliyev Nizami irsinə də hər zaman xüsusi diqqət yetirib. 1981-ci ildə Ulu Öndərin bilavasitə təşəbbüsü və iştirakı ilə dahi şairin 840 illik yubiley mərasimləri keçirilib və mərasimlər ölkənin həyatında əlamətdar hadisəyə çevrilib. 2011-ci ildə şairin 870 illiyi münasibətilə də silsilə tədbirlər təşkil edilib.

**Nəticə / Conclusion**

Bu il dahi şair və mütəfəkkirin anadan olmasının 880 illiyi tamam olur. Qüdrətli söz ustadının bəşər mədəniyyətinə verdiyi töhfələrə görə, hörmətli Prezidentimiz, ulu öndərimizin layiqli davamçısı İlham Əliyev 2021-ci ili Azərbaycan Respublikasında "Nizami Gəncəvi ili" elan edib.

Fikrimi böyük şairimiz Xəlil Rza Ulutürkün sözləri ilə bitirmək istəyirəm: "Doqquz əsrə yaxın vaxt keçməsinə baxmayaraq, bədii sözün qədrini bilən bəşəriyyətin müxtəlif qitələrdən yönələn nəzərləri Nizaminin Azərbaycanda ucalan əzəmətli heykəlinə zillənmişdir. Bunun səbəbi odur ki, öz əsrinin övladı, dünya vətəndaşı olmağa layiq Nizami bütün əsrlər, zamanlar üçün öz bədii gücünü saxlayan ölməz əsərlər yarada bilmişdir. Nə sağlığında, nə də vəfatından sonra keçən illər ərzində Nizami irsinə maraq, məhəbbət heç vaxt soyumayıb, azalmayıb. Azərbaycanın milli hadisəsi olsa da, milli hüdudlara sığmır Nizami!".

**İstifadə olunmuş ədəbiyyat / References**


1. Gəncəvi N. (1981). Xəmsə: Poemalardan parçalar. Bakı, Gənclik. 276 s.
2. Gəncəvi N. (1982). Hikmət və nəsihətlər. Tərtib edən R.Əliyev. Bakı, Yazıçı nəşriyyatı. 132 s.
3. Gəncəvi N. (2002). Poemalar. I kitab. Bakı, Maarif. 240 s.
4. Gəncəvi N. (2004). İskəndərnamə. Bakı, Lider. 256 s.
5. Gəncəvi N. (2004). Leyli və Məcnun. Tərcümə edən S.Vurğun. Bakı, Lider nəşriyyatı. 288 s.
6. Gəncəvi N. (2004). Sirlər xəzinəsi. Bakı, Lider nəşriyyat. 264 s.
7. Səfərli Ə., Yusifli X. (1982). Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı. Bakı, Maarif. s.78-137.
8. https://nizamigenceviaz.wordpress.com/sirl%C9%99rx%C9%99zin%C9%99si-poemasi/
9. http://heb.science.gov.az/az/news/1987/
10. https://nuhcixan.az/news/cemiyyet/26135-zengin-meneviyyat-kitabi-sirler-xezinesi

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 67-78
https://dx.doi.org/10.48445/TAIIJ.2021.45.25.007

**M E T O D İ K A**

# Kurikulum üzrə ədəbiyyat dərslərində B.Vahabzadənin həyat və yaradıcılığının öyrədilməsi imkanları

***Bilal Həsənli***
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**XÜLASƏ**
Gənc nəslin xalq şairi Bəxtiyar Vahabzadənin həyat və yaradıcılığı ilə ilk ciddi tanışlığı ümumtəhsil məktəblərində ədəbiyyat dərslərindən başlanır. Ədəbiyyat dərslərində görkəmli sənətkarın şəxsiyyəti və yaradıcılığının bütövlüyü, vəhdəti, vətəndaşlıq mövqeyi, xalqımızın istiqlal mücahidi olması şagirdlərdə aydın təsəvvür yaradılmalıdır. Bu məqsədlə təlim prosesində kurikulumun tələbinə uyğun olaraq, müzakirə, diskussiya, təqdimat, problemin həlli, debat, təqdimat və s. interaktiv metodlardan məqsədyönlü istifadə, şagirdlərin tədqiqatçılıq fəaliyyətinin, əlavə mənbələr üzrə işinin təşkili zəruridir. Təlimi prosesində ədibin Azərbaycanın müstəqilliyi, türk xalqlarının birliyi uğrunda mübarizə aparmasından söz açılmalıdır. Ədəbiyyat dərslərində sənətkarın həyat və yaradıcılığı, monoqrafik şəkildə öyrənilən əsərləri müzakirə olunarkən, şairin vətəndaşlıq qayəsi, mövqeyi, həyatı boyu apardığı istiqlal mücadiləsi konkret nümunələr əsasında, əlavə mənbələrdən istifadə ilə aydınlaşdırılmalıdır.

**AÇAR SÖZLƏR**
istiqlal, azadlıq, şeir, poema, xalq, milli, ədəbiyyat dərsləri, qırmızı imperiya, ana dili, mübarizə

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 13.12.2020
qəbul edilib: 03.02.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 67-78
https://dx.doi.org/10.48445/TAIIJ.2021.45.25.007

**M E T H O D S**

# Opportunities to teach the life and creativity of B.Vahabzade in literature classes on the curriculum

***Bilal Hasanli***
PhD in Pedaqogy, Assosiate Professor, Azerbaijan State Pedagogikal University. Azerbaijan.
E-mail: bilalhasanli@yahoo.com
https://orcid.org/0000-0002-6964-0546

**ABSTRACT**
The young generation with the first serious biography of the poet Bakhtiyar Vahabzadeh tour starts school literature classes. Classes of well-known artist's personality and creativity, integrity, unity, nationality, position, sacrifice for the freedom of our people to create a clear idea about the students. The existence of creativity in its people and its destiny linked politically motivated public and lyrical works of the artist, as well as the epic poems, dramatic works, the people and the loyalty of the people, symbols and literature classes focus on opening the inner face of the red empire maintained. Life and work of master classes, learned to monographic works on this aspect to be considered when discussing the poet's civic purpose, position, lifelong struggle for independence had clarified on the basis of concrete examples. In the process of learning the guage and literature of the writer fanatic, Azerbaijan's independence, the struggle for the unity of the Turkic peoples of speech should take.

**KEYWORDS**
independence, freedom, poetry, folk, national, literature classes, red empire, mother language, struggle

**ARTICLE HISTORY**
Received: 13.12.2020
Accepted: 03.02.2021

## Giriş / Introduction

Müasir ədəbiyyat dərslərində türk dünyasının görkəmli sənətkarı, Xalq şairi Bəxtiyar Vahabzadənin bədii irsinin öyrədilməsi, sovet rejimi şəraitində yazılmış əsərlərinin təhlili yeni yanaşma tələb edir. Şairin VII sinifdə "Vətəndaş" şeirinin, IX sinifdə "İstiqlal" poemasının, XI sinifdə həyat və yaradıcılıq yolunun, "Şəhidlər" poemasının tədrisi zamanı görkəmli sənətkarın şəxsiyyəti, vətəndaşlıq mövqeyi, xalqımızın istiqlal mücahidi olması və yaradıcılığının söz sənətimizin zirvələrindən birini təşkil etməsi barədə şagirdlərdə aydın təsəvvür yaradılmalıdır. B.Vahabzadənin həyat və yaradıcılığı dərsdə problemli sualların qoyulması və axtarış, tədqiqat üçün geniş imkanlar yaradır. Təlim prosesində qarşıya qoyulan təlim, tərbiyə inkişaf məqsədlərinə nail olmaq üçün müəllim kurikulumun tələbinə uyğun olaraq, şagirdlərin mövzu, problem üzrə əlavə mənbələr üzərində işini təşkil etməli, müzakirə, diskussiya, debat, təqdimat, problemin həlli, layihələrin hazırlanması, müsahibə və s. interaktiv metodlardan məqsədyönlü istifadə etməklə onları fərdi və əməkdaşlıq şəraitində tədqiqatçılıq fəaliyyətinə yönləndirməlidir.

Ədəbiyyat dərslərində qüdrətli sənətkarın sovet rejimi şəraitində müxtəlif janrlarda yazdığı bir sıra əsərlərin əsl mahiyyətini, müstəqillik illərində qələmə aldığı söz sənəti nümunələrinin ideya-bədii zənginliyinin müzakirəsinin, şagird tədqiqatının, əlavə mənbələr üzrə işin təşkili mühüm metodik problem kimi qarşıda durur.

Sənətkarın həyat yolunun, yaradıcılığının, ayrı-ayrı əsərlərinin monoqrafik şəkildə öyrənilməsi zamanı ilk növbədə şagirdləri düşündürən təbii bir sual meydana çıxır: Sovet dönəmində, avtoritar rejimin söz azadlığını boğduğu bir mühitdə, güclü senzura şəraitində istiqlalçı sənətkarın azadlıq, müstəqilliklə bağlı düşüncələri onun yaradıcılığında necə əks olunmuşdur?

Təlim prosesində bu məsələ ilə əlaqədar ilk növbədə şairin öz qeydlərini məktəblilərin diqqətinə çatdırmaq və onların münasibətini öyrənib müzakirə etmək məqsədəuyğundur. B.Vahabzadə sovet rejiminin xalqa zidd mahiyyətini, Azərbaycana gətirdiyi bəlalardan bəhs edən əsərlər yazmasının səbəblərindən danışarkən yazır: "Mən sovet sisteminə və rejiminə qatı düşmən olan, onunla barışmayan, əksinə, namaz üstə ona lənət oxuyan, məhvini arzulayan savadsız, lakin açıq gözlü bir ailədə böyümüşəm... Hələ uşaq yaşlarımdan mən sovet rejiminin zülmünü, zorakılığını və dəhşətlərini öz gözlərimlə görüb ağlımla dərk etdim. Beləliklə, hələ uşaqlıqdan qəlbimdə sovet quruluşuna nifrət toxumları səpildi. Həmin bu toxumlar isə sonralar şeirə çevrilib cücərdi" [9, s.49-50].

Dərsdə müzakirə və müəllimin şərhi vasitəsilə aydınlaşdırılır ki, o, kiçik yaşlarında Şəkidə kollektivləşmə əleyhinə xalq üsyanının şahidi olmuş, Bakıdan gələn rus qoşununun üsyanı yatırarkən camaata divan tutması, yaxın qohumlarının bu üsyanın qurbanı olması, atası və əmisinin qaçaqlara yardım etdiklərinə görə həbs olunması, onun qəlbində silinməz izlər buraxmışdı.

Qələmi püxtələşdikcə şairin mövcud quruluşa nifrəti də ildən-ilə dərinləşir və bu gizli hissini ifadə etmək üçün yollar axtarırdı. Hələ kifayət qədər təcrübəsi, səriştəsi və ustalığı olmadığına görə universitetdə oxuduğu müharibə illərində sözünü birbaşa dediyi şeirlərini çap üçün yazmır, arxivində saxlayırdı.

Ədib sovet dönəmində mövcud rejimin təqiblərindən, senzuranın yasaqlarından xilas olmaq üçün öz yaradıcılığında başqa bir yol seçməyin lazım olduğunu anlamışdı. O, mövcud vəziyyətdən çıxış yolunu bir çox əsərlərini böyük M.F.Axundzadənin "zamanı və məkanı dəyişməklə sözünü demək" üsulundan istifadə edərək qələmə almaqda görmüşdür. Bu məqam nəzərə alınaraq, ədəbiyyat dərslərində öyrənilən "Vətəndaş" şeirinin, "İstiqlal", "Şəhidlər" poemalarının, eləcə də müəllimin tapşırığı ilə şagirdlərin müstəqil oxuduğu "Latın dili", "Mərziyyə", "Yollar-oğullar", "Ehramların önündə" və s. əsərlərin müzakirəsi zamanı sənətkarın imperiyaya qarşı apardığı əqidə mübarizəsindən, senzuradan, manqurt məmurlardan qorunmaq üçün sovet ideologiyasına zidd olan fikirlərini "Ezop dili" ilə demək məcburiyyətində olmasından söz açılmalıdır.

B.Vahabzadə özü bu barədə yazırdı: "Sətiraltı mənalarda ürəyimi parçalayan hiss və duyğularımı, beynimi gəmirən fikirlərimi dilə gətirdiyim bütün əsərlərimdən bir məqalədə söhbət açmaq çox çətindir. İstiqlal arzusu və azadlıq duyğularının hamısını üzə çıxarmaq üçün mənim bütün əsərlərimi – dramlarımdan tutmuş şeirlərimə, şeirlərimdən tutmuş məqalələrimə qədər hamısını ələk-vələk eləmək lazımdır. Çünki bu duyğular və fikirlər, demək olar ki, mənim bütün yazılarıma səpələnmişdir.

Vətən, millət, onun tarixi, ədəbiyyatı, ana dili, təhsilin milliləşdirilməsi, xalqın yetirdiyi böyük şəxsiyyətlər, onların əqidə və amallarının tərənnümü və s. mənim istiqlal və azadlıq yolunda apardığım mücadilənin ayrı-ayrı qollarıdır" [9, s.70].

Qüdrətli sənətkarın 1988-ci ilə qədər sovet rejiminə qarşı yazdığı əsərlərini iki qismə bölmək olar: bir qismi birbaşa, açıq-aşkar rejimin dəhşətlərini əks etdirən yazılar, o biri qismi isə senzuranı aldatmaq üçün təsvir olunan hadisəni, nəql olunan əhvalatı ya tarixə, ya da əcnəbi ölkələrə keçirmək yolu ilə yazılan əsərlər.

Birinci qismə aid olan əsərlər rejimin repressiya maşınından qurtulmaq üçün çap məqsədi ilə deyil, sənətkarın şəxsi arxivi üçün yazılırdı. Bu əsərlərin böyük bir qismi

ədibin 1991-ci ildə çap etdirdiyi "Nağıl-həyat" və 1996-cı ildə çap olunan "Körpü çaydan uzaq düşüb" kitablarında "Sandıqdan səslər" başlığı altında verilmişdir.

Hələ tələbəlik illərindən şairin ən böyük etirazı və üsyanı ana dilimizin qapılar dalında ağlar qalması, hakim rus dilinin təcavüzünə məhkumluğu idi. Ədib 1942-1953-cü illər arasında yazdığı şeirlərin böyük bir qismini 1988-ci ildə yazdığı "İki qorxu" poemasında dediyi kimi, yandırmağa məcbur olmuşdu. Yandırdığı bu şeirlərdən birinin bir bəndi belədir:

Bir vaxtlar şax-şax axardı
Bu gün donduruldu dilim.
Tapdalandı ayaq altda,
Gör necə xar oldu dilim.

B.Vahabzadə bu duyğunun təbii davamı olaraq, 1954-cü ildə indi məşhur olan "Ana dili" şeirini yazmışdır. Ana dilinin təəssübkeşi, doğma dilini böyük məhəbbətlə sevən B.Vahabzadə öz yaradıcılığında bu mövzuya dönə-dönə müraciət etmiş, dilimizin müqəddəsliyini, əvəzedilməzliyini yüksək sənətkarlıqla vəsf etmişdir. Şair ana dilinə biganə yanaşan, bu dildə danışmağı özünə ar bilən ədabazları nankor adlandırır, öz doğma dilini qoruyub saxlamağın hər bir insan üçün vətəndaşlıq borcu olduğunu bir daha xatırladır. Şairin fikrincə, ana dili əslində milli düşüncə, milli mənəviyyat, əqidə məsələsidir. Ana dili ağsaqqal babaların, ağbirçək nənələrin bizə miras qoyduğu misilsiz xəzinədir. Milli dili bilməyən insan milli ruhdan, milli mənafe duyğusundan da məhrumdur:

Dil açanda ilk dəfə "ana" söyləyirik biz,
"Ana dili" adlanır bizim ilk dərsliyimiz.
İlk mahnımız laylanı anamız öz südüylə
İçirir ruhumuza bu dildə gilə-gilə.

Şair doğma dilinə xor baxan, əcnəbi dillərdə danışmağı müasirlik, mədəniyyət hesab edib, öz dilində danışmağı bacarmayanları nifrətlə damğalayır:

Ey öz doğma dilində danışmağı ar bilən
fasonlu ədabazlar!
Qəlbinizi oxşamır qoşmalar, telli sazlar.
Bunlar qoy mənim olsun,

Ancaq Vətən çörəyi,
Sizlərə qənim olsun!

Həmin şeiri dinləyib bəyənən S.Vurğun V.Leninin əsərlərinin hansı cildindənsə “Biz öz ana dilimizi və vətənimizi sevirik” cümləsini götürüb “Ana dili” şeirinin əvvəlinə öz əli ilə epiqraf yazmışdı. Şeir bir neçə gündən sonra çap edildi. Beləliklə, ustad şair Lenindən qalxan kimi istifadə etmək səriştəsini gənc Bəxtiyara öyrətdi. Ədib sonralar yazdığı “Leninlə söhbət” poemasında ustad şairin öyrətdiyi bu üsuldan daha geniş istifadə etmişdir.

B.Vahabzadənin əvvəlki ədəbiyyat fənn proqramı üzrə öyrənilmiş “Latın dili” şeirinin tədrisi ilə bağlı müəllimlərimizin əksəriyyəti müəyyən təcrübəyə malikdir. Şeirin ideya-bədii əhəmiyyətini nəzərə alaraq, onu şagirdlərə sinifdənxaric oxu materialı kimi tövsiyə etmək və sənətkarın yaradıcılığı üzrə dərsdə tətbiq, yaradıcı iş materialı kimi müzakirə etmək məqsədəuyğundur.

Şeirdə sənətkar fikirlərini təsdiq, hökm şəklində deyil, bədii suallardan geniş istifadə etməklə verərək əsərin oxucuya bədii – estetik təsirini gücləndirməyə, onu həmin suallar ətrafında dərindən düşünməyə sövq etməyə müvəffəq olmuşdur. Bədii sual formasının seçilməsi şairə xalqı ölən, lakin özü yaşayan latın dilinin xalqı yaşasa da, özü istifadəsiz qalan bir dillə müqayisə etməyə, bununla da qarşısında qoyduğu başlıca məqsədə çatmağa imkan yaratmışdır:

İndi söylə,
Hansı dilə ölü deyək:
Vətən varkən,
Millət varkən,
Kiçik, yoxsul komalarda
dustaq olan bir diləmi?
Yoxsa, uzun əsrlərdən
keçib gələn,
Xalqı ölən,
Özü qalan bir diləmi?

Şair bu misralarda oxucuya belə bir fikri çatdırır ki, əsl canlı dil yaşayan, istifadə olunan, insanlara xidmət edən dildir. Xalqı yaşasa da, özü yaşamayan, istifadəsiz qalan dil əslində ölüdür. Dili yaradan, ona həyat verən xalqdırsa, xalqı da yaşadan dildir. Müzakirə nəticəsində şagirdlərdə belə qənaət hasil olmalıdır ki,

əslində bu əsər sovet rejiminin əsarətdə olan xalqların dilini sıxışdırıb çıxarmağa yönəlmiş siyasətinə etirazın ifadəsi idi.

Şair cəmiyyətdə yalan, saxtakarlıq mühiti yaradan qırmızı imperiyanın iç üzünü açmaq, ona öz kəskin münasibətini bildirmək üçün ilk baxışda adi görünən, ağlagəlməz mövzulardan istifadə edir. 1953-cü ildə yazdığı "Əmzik" şeirini şair o zaman 7-8 aylıq olan körpə qızı Gülzara həsr etmişdir. Anasının südü olmadığına görə uşaq ağlayanda onu əmziklə aldadırlar. Şair bu adi məişət hadisəsindən çıxış edib, sovet cəmiyyətində baş alıb gedən yalana, saxtakarlığa işarə vurmaq fürsətini əldən vermir:

Aldadırıq, aldanırıq elə biz,
Saxta əmzik ağzımızda bal dadır.
Uşaq ikən öz doğmaca anamız,
Böyüyəndə həyat bizi aldadır.

IX və XI siniflərdə ədəbiyyat dərslərində sənətkarın poema yaradıcılığı üzrə də tədqiqatın təşkilinə, müzakirəyə imkanlar vardır. B.Vahabzadənin sovet dövründə yazdığı şeir və poemalarda həm müstəqim, həm də rəmzi və simvolik mənalar vardır. Təlim prosesində sənətkarın yaradıcılığı üzrə müzakirələr zamanı həmin əsərlərdəki mətnaltı mənaya xüsusi diqqət yetirilməlidir. Onun poemalarında istiqlaliyyət, insanın, xalqın azadlığı ideyası da aparıcı yer tutur. "Bəxtiyar Vahabzadənin bir vətənçi şair kimi orijinallığı və sovet ədəbiyyatı prinsiplərindən uzaqlaşmaq səyləri onun poemalarında özünü daha qabarıq göstərir. İlk poemaları olan "Gülüstan", Füzuliyə həsr olunmuş "Şəbi-hicran", el muğamlarına həsr edilmuş "Muğam", dahi xalq şairi Sabirə həsr olunmuş "Ağlar-güləyən" kimi əsərlər 60-cı illər poeziyasında yeni hadisə idi və şairin ənənəvi poeziyadan və mövzulardan uzaqlaşmaq səylərini ifadə edirdi. Bu poemaların hamısında klassik ədəbiyyatımızın ovqatları, qəm, kədər, iztirab motivləri müşahidə olunur. Şair azadlıq və müstəqillik arzuları ilə yaşayan Azərbaycan xalqının kədər və faciələrini birbaşa təsvir edə bilməzdi, bu halda mütləq repressiyalara məruz qalardı. Ona görə klassik ədəbiyyat motivlərindən, Füzuli, Sabir kimi böyük şairlərin xalq kədərindən yazmaqla mənsub olduğu millətin, sovet zülmünün kədərini qələmə aldı [1, s.164].

Sovet imperiyasının xalqımıza öz qəhrəmanlıq keçmişini, tarixini unutdurmaq cəhdlərinə cavab olaraq şair məşhur "Gülüstan" poemasını yazmış, Vətənimizin düşmənlər tərəfindən parçalanması, xalqımızın öz azadlığını itirməsi barədə tarixi həqiqətlərdən bəhs edən bu əsərə görə təqiblərə məruz qalmışdır. Poemanın mərkəzi mətbuatda işıq üzü görməsinə nail ola bilməyən şair onu "Nuxa fəhləsi" adlı rayon

qəzetində çap etdirmişdir. Əsərin sorağı Mərkəzə çatanda şairə qarşı təqiblər başlamış, işlədiyi universitetdə ona şiddətli töhmət verilmiş, bir bəhanə ilə müəllimlikdən azad edilmişdi. Lakin qədirbilən oxucular əsəri əlyazması şəklində oxumuş, əldən-ələ ötürərək yaymışdılar.

Azərbaycanın birliyi və istiqlaliyyəti uğrunda çarpışan Səttar xan, Şeyx Məhəmməd Xiyabani və Pişəvərinin əziz xatirəsinə həsr olunmuş poemada şair "Azərbaycanın Rusiyaya birləşdirilməsinin" bayram edildiyi bir mühitdə iki od arasında qalıb parçalanmış Vətənin acı taleyindən ürək ağrısı ilə söz açmışdır. Əsərdə bir anın içində yurdumuzun iki pay kimi bölüşdürülməsi hökmünə çevrilən müqaviləyə müraciətlə sənətkarın dediyi sözlərdə xalqın kədəri, millətimizin qan düşmənlərinə nifrəti öz bədii əksini tapmışdır:

Ey kağız parçası, əvvəl heç ikən
Yazılıb qollanıb yoxdan var oldun.
Böyük bir millətin başını kəsən,
Qolunu bağlayan hökmdar oldun.

Şairin Cənub mövzusunda yazdığı silsilə əsərlər Vətənin ayrılıq dərdini ürəyində gəzdirən xalqımızın nisgilli hisslərini, duyğularını əks etdirir. Həmin əsərlərdə ikiyə bölünmək faciəsini yaşayan xalqın hər bir övladının qəlbində qövr eləyən dərdlər dil açıb danışır, bu ədalətsizliyə etirazını bildirir:

Yarım bu tayda qaldı,
Yarım o tayda qaldı.
Toyum burda çalındı,
Yarım o tayda qaldı.

B.Vahabzadə azadlıq uğrunda geniş xalq hərəkatının bilavasitə iştirakçısı olan, 20 Yanvar faciəsinə ilk etiraz səsi qaldıran, xalqın misilsiz qəhrəmanlığını və dərdini bədii ədəbiyyata gətirən dönməz əqidəli sənətkardır. İmperiya cəlladlarının silahından qorxmayan sənətkar şəhidlərin ruhuna "Şəhidlər" poeması ilə əbədi heykəl ucaltmışdır. Onun bu mövzuya həsr etdiyi əsərlərində ölümün gözlərinə dik baxan, qolundakı mütilik buxovlarını qırıb ataraq, son və qəti mübarizəyə başlayan vətənpərvər insanların parlaq obrazları yaradılmışdır.

Həyat öz millətinin qəhrəmanlıq tarixini söz sənətində əks etdirən şairin belə bir inamını bir daha təsdiq etdi ki, ölümdən qorxmayan insanların azadlıq eşqini heç kəs boğa bilməz. Haqq səsini top-tüfənglə, ən güclü ordu ilə belə susdurmaq olmaz:

O şənbə gecəsi, o qətl günü,
Mümkünə döndərdik çox namümkünü.
Xalqın qəlbindəki qorxu mülkünü,
O gecə dağıdıb sökdü Şəhidlər…

İnsan insan olur öz hünəriylə,
Millət millət olur xeyri, şəriylə.
Torpağın bağrına cəsədləriylə,
Azadlıq tumunu əkdi Şəhidlər.

Həmin matəm günlərini xatırlayan şair yazırdı ki, bəzən Cavanşir, Babək, Cavad xan, Çələbi xan kimi tarixi qəhrəmanlarımız haqqında oxuduğumuz kitablarda onların qorxmazlığından, şücaət və cəsarətlərindən əfsanəyə bənzər elə epizodlara rast gəlirik ki, insan bu boyda fədakarlığa inana bilmir. Bəzən mənə elə gəlir ki, yəqin xalq öz qəhrəmanlarını görmək istədiyi mərtəbədə əfsanələşdirmiş və onlar haqqında məlumat bizə şişirdilmiş və böyüdülmüş halda çatmışdır. Şənbə gecəsinin şəhidlərinin cəsarət və qəhrəmanlığını öz gözlərimlə görəndən sonra tarixi qəhrəmanlarımızın cəsarət və şücaətinə məndə şübhə qalmadı.

Dünənə qədər hər gün rast gəldiyimiz, bəzilərini tanımadığımız bu adi cavanlar bir gecənin içində nə boyda böyük qəlbə malik olduqlarını öz ölümləri ilə təsdiq edib, qeyri-adiləşdilər. Zaman keçəcək, xalq bu igidlər barədə əfsanəvi dastanlar yaradacaq, şair və yazıçılarımız onlar haqqında kitablar yazacaqlar.

Şair qara yanvar günlərində inanırdı ki, azadlıq uğrunda canını qurban verən şəhidlərin qanı yerdə qalmayacaq, əsrlər boyu arzuladığı azadlığa qovuşan xalqımız şəhidlərin xatirəsini əbədi yaşadacaqdır:

Onlar sübut etdi: hər qara zülmün
Əli uzansa da, ömrü gödəkdir.
Xalqın azadlığı sabah, biri gün
Şəhid yarasından göyərəcəkdir!

Şairin istiqlal şeirləri içərisində türk xalqlarının taleyi, türk dünyasının birliyi ilə bağlı əsərlər mühüm yer tutur. Qardaş Türkiyədə çox sevilən şair 1994-cü ildə "Türk dünyası ədəbiyyatına xidmət" mükafatına layiq görülmüşdür. Şairin böyük sənətkarlıqla yazdığı "Azərbaycan-Türkiyə" şeirində bir millət iki dövlətin tarixi köklərindən, xalqlarımızın bir-birinə bəslədiyi məhəbbət duyğularından, tarixin sınaqlarından çıxmış birliyindən söz açılır:

Bir ananın iki oğlu,
Bir ağacın iki qolu,
O da ulu, bu da ulu,
Azərbaycan – Türkiyə!

"Aluştada Əmət xan Sultanın heykəli önündə" əsərində Krım türklərinin öz doğma vətənindən sürgün edilməsindən, bu cinayəti törədənlərdən bəhs edilir. Krım türklərinin faciəsini əks etdirən digər şeirində şair türk xalqlarının məruz qaldığı məhrumiyyətlərə, repressiyalara öz etirazını bildirir:

Krım, Yalta, Qızıldaş...bir xalqın ata yurdu,
Millətə yad oldu, gəlməyə Vətən oldu.
İndi necə ayıraq burda xeyirdən şəri,
Axı, haqqın gözləri oyum-oyum oyulmuş.
Torpağın altındadır torpağın sahibləri,
Gəlmələr torpaq üstə torpağa sahib olmuş.

Məlumdur ki, 1986-cı il dekabrın 17-də Alma-Atada qazax xalqının Moskvanın imperiya siyasətinə, milli hüquqlarının tapdalanmasına qarşı etiraz mitinqi sovet rejiminin çöküşünün ilk carçısı oldu. Lakin imperiya rəhbərlərinin hələ güclü olduğu bir şəraitdə, şair həmin faciəli hadisələrdən açıq danışa bilməzdi. O, bu hadisəyə öz münasibətini bildirmək üçün dostu, məşhur tarixçi-alim Şirməmməd Hüseynovun da ad gününün həmin günə düşməsindən istifadə edib "17 dekabr" şeirini yazmışdır. Özünü mümkün repressiyadan qorumaq üçün bu təsadüfdən qalxan, dayaq nöqtəsi kimi istifadə edən şair yazırdı:

Sənin ad günündə gördünmü birdən,
Qaranlıq üfüqdə çaxan şimşəyi.
Həmişə zamanın lal axarından

Gözlə fırtınanı, gözlə çox şeyi.
Həmin o fırtına döndərib yönü,
Başqa bir dövranın olar ad günü.
...Vaxtın axarında sular durulur,
Gerçək gül açanda solur riyalar,
Bir anın içində solub məhv olur
Yüzillik, minillik imperiyalar.

B.Vahabzadənin sovet dövründə beynəlxalq mövzuda yazılmış əsərlərində də dolayısı ilə Azərbaycan xalqının azadlıq idealı öz əksini tapmışdır. Şair öz istiqlaliyyəti uğrunda mübarizə aparan xalqlardan yazanda, onlara həmrəyliyini ifadə edəndə, əslində Rusiyadan asılı vəziyyətdə yaşayan, öz sərvətlərinin xeyrini görməyən xalqları, ilk növbədə isə öz xalqını nəzərdə tutmuşdur.

**Nəticə / Conclusion**

B.Vahabzadə Vətənin müqəddəratı, istiqlal mübarizəsi kimi taleyüklü məsələlərə dram əsərlərində də dönə-dönə toxunmuşdur. Görkəmli dramaturqun “Dar ağacı”, “Fəryad” tarixi dramlarında sənətkar tarixi keçmişə müraciət etməklə, xalqımızın taleyində böyük rol oynamış şəxsiyyətlərin obrazlarını yaratmaqla oxucunu öz keçmişinə yeni nəzərlərlə baxmağa, ibrət dərsi almağa səsləyir. Ədibin uğurla tamaşaya qoyulmuş “Özümüzü kəsən qılınc” pyesi tarixi mövzuda yazılsa da, müasir dərdlərimizlə səsləşir.

Kurikulum üzrə ədəbiyyat dərslərində B.Vahabzadənin həyat və yaradıcılığının tədrisinə yeni yanaşma, müzakirə, diskussiya, debat, təqdimat, problemin həlli, layihələrin hazırlanması, müsahibə və s. interaktiv metodlardan məqsədyönlü istifadə, əlavə mənbələr üzərində işin təşkili şagirdlərdə sənətkarın vətəndaşlıq, istiqlalçılıq, müstəqillik amalı ilə bağlı dolğun təsəvvür yaradır, vətənpərvərlik tərbiyəsində mühüm rol oynayır. Şairin yaradıcılıq yolu, monoqrafik şəkildə öyrənilən əsərlərinin öyrədilməsi zamanı ədibin milli-mənəvi dəyərlərimizin, ana dilimizin təəssübkeşi, Azərbaycanın müstəqilliyi, türk xalqlarının birliyi uğrunda mübarizə aparan istiqlal şairi kimi fəaliyyəti barədə qazanılmış biliklər, müzakirələr zamanı yaranmış qənaətlər şagirdlərdə fəal həyat mövqeyi formalaşdırır.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Cəfərov N., Həbibbəyli İ., Əliyeva N., Bakıxanova A. (2010). Ədəbiyyat. Ümumtəhsil məktəblərinin 11-ci sinfi üçün dərslik. Bakı, Çaşıoğlu. 178 s.
2. Həbibbəyli İ., Həsənov B., Hüseynoğlu S., Mustafayeva A. (2018). Ədəbiyyat. XI sinif üçün dərslik. Bakı, Bakınəşr. 212 s.
3. Həsənli B., Hüseynoğlu S., Mustafayeva A., Məmmədova S. (2017). Ədəbiyyat. VII sinif. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr. 211 s.
4. Həsənov B., Əliyev S. Mustafayeva A., Verdiyeva N. (2020). Ədəbiyyat. IX sinif üçün dərslik. Bakı, Bakınəşr. 227 s.
5. Həsənov B., Əliyev S. Mustafayeva A., Verdiyeva N. (2020). Ədəbiyyat. IX sinif. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr. 227 s.
6. Həsənov B., Hüseynoğlu S., Mustafayeva A. (2018). Ədəbiyyat. XI sinif. Müəllim üçün metodik vəsait. Bakı, Bakınəşr. 245 s.
7. Hüseynoğlu S. (2019). Ədəbiyyatın məktəbdə öyrədilməsi. Bakı, 262 s.
8. Hüseynoğlu S., Həsənli B., Mustafayeva A., Məmmədova S. (2017). Ədəbiyyat. VII sinif üçün dərslik. Bakı, Bakınəşr. 211 s.
9. Vahabzadə B. (1999). İstiqlal. Bakı, Gənclik. 67 s.
10. Vahabzadə B. (2004). Seçilmiş əsərləri. İki cilddə. I cild. Bakı, Öndər nəşriyyatı. 320 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 79-94
https://dx.doi.org/10.48445/TAIIJ.2021.86.20.008

**M E T O D İ K A**

# Repressiya qurbanı olan ədiblərimizin ana dili tədrisinin zəruriliyi uğrunda mübarizəsi

***Kamal Camalov***
Pedaqogika elmləri doktoru, dosent, Naxçıvan Müəllimlər İnstitutu. Azərbaycan.
E-mail: kamal.camalov@gmail.com
https://orcid.org/0000-0003-1977-7250

**XÜLASƏ**
Məqalədə repressiyaya məruz qalan Azərbaycan ədibləri – Firidun bəy Köçərli, Ömər Faiq Nemanzadə, Hüseyn Cavid, Yusif Vəzir Çəmənzəminlinin ana dili və onun tədrisi uğrunda mübarizələri tədqiq və təhlil obyektinə çevrilmişdir. Göstərilir ki, repressiya qurbanlarının pedaqoji irsinin öyrənilməsi yalnız tarixilik nöqteyi-nəzərdən deyil, həm də bu günümüz üçün faydalıdır. Repressiya qurbanlarının pedaqoji irsində təlim məsələləri – təlimin funksiyaları, prinsipləri, metodları mühüm yer tutur. Məslək və amal dostları XX əsrin əvvəllərində Azərbaycanda genişlənən təlimin ana dilində aparılması ideyasının tərəfdarı olmuş, onun ictimai-siyasi və pedaqoji əhəmiyyətini şərh etmişlər. Məqalədə maraq kəsb edən yanaşmalardan biri də dərsliklərin anlaşıqlı, sadə və aydın ana dilində, elmi və pedaqoji əsaslara uyğun yazılmasına münasibətin bildirilməsidir. Məqalədə vətən fədailərinin Azərbaycan məktəblərində ana dilinin tədrisinin zəruriliyi və əhəmiyyəti haqqında fikir, ideya və görüşləri elmi ümumiləşdirmələrlə təhlil edilmişdir.

**AÇAR SÖZLƏR**
repressiya qurbanları, ana dili və onun tədrisi, dilin saflığı, ədəbi dilin yaradılması uğrunda mübarizə, ana dili və onun məktəblərdə tədrisi haqqında fikirlər, ana dilində aparılan təlimin ictimai-pedaqoji əhəmiyyəti

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 27.01.2021
qəbul edilib: 16.02.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 79-94
https://dx.doi.org/10.48445/TAIIJ.2021.86.20.008

**METHODS**

# The struggle of our writers victims of repression for the necessity of teaching their native language

***Kamal Jamalov***
Doctor of Pedagogical Sciences, Associate Professor, Nakhchivan Teachers Institute. Azerbaijan. E-mail: kamal.camalov@gmail.com
https://orcid.org/0000-0003-1977-7250

**ABSTRACT**
In the article, the struggles of Firidun bey Kocharli, Omar Faig Nemanzade, Huseyn Javid, Yusif Vazir Chamanzaminli, who were repressed, for their native language and its teaching, have became the object of research and analysis. It is shown that, the study of the pedagogical heritage of the victims of repression is useful not only from a historical point of view, but also for today. Training issues, functions, principles and methods of training play an important role in the pedagogical heritage of victims of repression. One of the interesting approaches in the article is to express the attitude to writing textbooks in comprehensible, simple and clear native language and in accordance with scientific and pedagogical principles. It is analyzed the thoughts, ideas and views of the homeland patriots on the necessity and importance of teaching the native language in Azerbaijani schools with scientific generalizations in the article.

**KEYWORDS**
victims of repression, native language and its teaching, purity and richness of language, the struggle for the creation of a literary language, thoughts on the native language and its teaching in schools, socio-pedagogical significance of teaching in the native language

**ARTICLE HISTORY**
Received: 27.01.2021
Accepted: 16.02.2021

## Giriş / Introduction

Xalqın mövcud olması və yaşaması üçün əsas amil hesab edilən milli dilini hər bir xalq ana südü kimi sevmiş, onu yad təsirlərdən mühafizə etməyə, qoruyub saxlamağa çalışmışdır. Azərbaycan maarifçiləri Mirzə Fətəli Axundov, Həsən bəy Zərdabi, Məhəmməd ağa Şahtaxtlı, Məhəmməd Tağı Sidqi, Sultan Məcid Qənizadə, Nəriman Nərimanov və b. ana dilini fars, ərəb, rus sözlərindən, xarici təsirlərdən qorumağı, hər bir azərbaycanlının başa düşdüyü bir dildə yazmağı vacib məsələ hesab edirdilər. Maarifçi demokratların ana dili məsələsinə fəal münasibət bəsləmələri səbəbsiz deyildi. XX əsrin əvvəllərindən başlayaraq, dil məsələsi Azərbaycanda ictimai-siyasi və mədəni həyatın müxtəlif sahələrini özündə cəmləşdirən bir amilə çevrilmişdi. Siyasətdən və iqtisadiyyatdan bəhs edənlər də, mədəniyyətdən yazanlar da bu məsələyə toxunmadan yan keçə bilmirdilər. Pedaqogikanın klassikləri sayılan Y.A.Komenski, İ.H.Pestalotsi, K.D.Uşinski və b. ana dilinə böyük əhəmiyyət verərək, məktəblərdə tədrisin məhz bu dildə aparılması ideyasına böyük önəm vermişlər.

XIX əsrin sonu – XX əsrin əvvəllərində Rusiya imperiyasının müstəmləkə siyasəti ilə əlaqədar olaraq, başqa millətlərin dilinə qiymət verilmirdi. Bütün dövlət məktəblərində tədris rus dilində aparılırdı. Azərbaycanda olan dövlət məktəblərində azərbaycanlı şagirdlərə doğma dillərində danışmalarına belə icazə verilmirdi. Məhz buna görə də, Azərbaycanın qabaqcıl mütəfəkkir pedaqoqları Firidun bəy Köçərli, Ömər Faiq Nemanzadə, Hüseyn Cavid, Yusif Vəzir Çəmənzəminli və b. Rusiya imperiyasının müstəmləkə siyasətinə qarşı mübarizə aparmaqla, məktəblərdə ana dilinin bir fənn kimi tədris olunmasına və ana dilində məktəblər açılmasına var qüvvələri ilə çalışırdılar. Bu mübarizə eyni zamanda Azərbaycan dilinin orfoqrafiyasını sadələşdirmək, onu mümkün qədər ərəb, fars və s. sözlərdən təmizləməkdən ibarət idi. Onlar ana dilini və onun məktəblərdə tədrisini mühüm bir məsələ hesab edərək, mətbuat səhifələrində tez-tez bu məsələ barəsində publisist məqalələri ilə çıxışlar edir, dilin təmizliyinə xələl gətirən, məktəblərdə tədrisi qadağan edən mövcud qanunlara qarşı öz etiraz səslərini ucaldır, dilin saflığını, müstəqilliyini qoruyub saxlamağa çalışırdılar.

Türk dünyasında dramaturq, publisist, ictimai xadim kimi tanınan repressiya qurbanları Firidun bəy Köçərli, Ömər Faiq Nemanzadə, Hüseyn Cavid, Yusif Vəzir Çəmənzəminli və başqalarının pedaqoji görüşlərində milli-mənəvi dəyərlər, əxlaqi fikirlər, təhsillə bağlı ideyalar və müəllim hazırlığı ilə yanaşı apardıqları böyük mübarizələrdən biri də ana dili və onun tədrisi ilə bağlı məsələlər olmuşdur.

Repressiya qurbanları Azərbaycan dilinin varlığı, yaşaması və tərəqqisi üçün bütün üsul və vasitələrdən istifadə etməklə Azərbaycan xalqının milli mənsubiyyətinə sona qədər sadiq qalmış, onun öz tarixi qədər qədim mədəniyyəti və dilinə hörmət bəsləmişlər. Repressiya qurbanlarının hər biri öz yaradıcılıq tərzlərinə uyğun ana dilinin saflığı uğrunda mübarizəyə dair çox sayda məqalə, şeir, məktub və publisist yazılar, dərslik, felyeton, hekayə, maraqlı şəkil və karikaturalarla mətbuat səhifələrində çıxış etmişlər.

Firidun bəy Köçərli "Molla Nəsrəddin" jurnalında çap etdirdiyi "Ana dili" adlı məqaləsində dili hörmətdən salan, onu alınma sözlərlə korlayan ziyalıları kəskin şəkildə tənqid edirdi: "Hər millətin özünəməxsus ana dili var ki, onun məxsusi malıdır. Ana dili millətin mənəvi diriliyidir, həyatının mayəsi mənziləsindədir. Ananın südü bədənin mayəsi olduğu kimi, ananın dili də ruhun qidasıdır, hər kəs öz anasını və vətənini sevdiyi kimi, ana dilini də sevir. Rusların məşhur pedaqoq və ədibi K.Uşinski deyir: "Bir millətin malını, dövlətini və hətta vətənini əlindən alsan, ölüb-itməz, amma dilini alsan, fövt olar və ondan bir nişan qalmaz". Bu doğrunu digər millətlərin həqiqi ədib və yazıçıları yaxşı anlayıblar və əsərlərini ana dilində yazmaqla belə millətin əxlaqını düzəldib, ağlına və ruhuna tərbiyə veriblər və verməkdədirlər…" ["Molla Nəsrəddin" jurnalı. 1913, № 22].

Firidun bəy Köçərli yazır: "Son zamanlar bizim açıq və sadə dilimizə İstanbulda yarımçıq elm təhsil edib gələnlər xələl yetirməkdədirlər. Bu cənablar nə elmdən elm və nə də mərifətdən mərifət öyrəniblər. Ancaq qəliz ifadələr, kəlimələr üstünə minib ədəbiyyat meydanında cövlan etməkdədirlər". F.Köçərli qəliz ifadələrlə, kəlimələrlə meydan sulayanların başında ortaq türk dilinin təbliğatçısı olan mühacir həyatı yaşayan Əli bəy Hüseynzadəni, ətrafında isə "bir dəstə meymunların" toplaşmasından ciddi narazılıq edir. F.Köçərli "Molla Nəsrəddin" jurnalında yazır ki, "Allah Əli bəy Hüseynzadəyə insaf versin. Kaş o alicənab İstanbulda rahat əyləşib bizim şumbəxt (şumbəxt – uğursuz bəxt – K.C.) Qafqaza təşrif gətirməyəydi. O cənabın elm və kamalına sözümüz yoxdur. Sözümüz ondadır ki, elm və kamalından bizə bir bəhrə vermədi, ancaq dilimizə pozğunluq saldı, təzə dil gətirdi. Ətrafını bir dəstə meymunlar bürüdü və ona təqlid etməkdə bir-birinə macal verməyib böyük hünərlər göstərdilər. Az vaxtın içində Qafqaz türklərinin dili osmanlı sözləri və istilahları ilə doldu: "işbu", "iştə", "şimdi", "şol", "əfəndim", "bakalım", "nasıl" sözləri qəzet sütunlarını doldurdu. Bu işin nəticəsi bu oldu ki, indi qəzetlərimizin və jurnallarımızın dilini oxuyub başa düşmək olmur... Təlim-qiraət kitablarımızda "ata", "ana", "yaxşı" kimi işlənən və əziz sözlər dərman üçün belə axtarılsa, tapılmaz".

Əli bəy Hüseynzadənin osmanlı şivələri ilə dolu olan "Füyuzat" jurnalına maarifçi-pedaqoq Həsən bəy Zərdabi də kəskin etirazını bildirmişdir. Belə nəql edilir ki, bir gün Həsən bəy Zərdabinin yolu kitab, qəzet, jurnal satılan köşkün önündən keçir. Gözü "Füyuzat" məcmuəsinə sataşır. Əlinə alıb bir neçə vərəqinə baxdıqdan sonra soruşur:

"– Bunu kimin üçün yazırsınız?

– Camaat üçün – demişlər.

Həsən bəy gülümsünərək demişdir:

– Elə isə camaatın dilində yazın ki, camaat da başa düşsün" [4, s.351].

Firidun bəy Köçərli yazır ki, "Millətini sevən, onun mənəvi diriliyinə çalışan, tərəqqisi yolunda əmək sərf edən yazıçı, ədib və şairlərimizdən çox-çox təvəqqe edirik ki, dillərini asanlaşdırsınlar, ana dilindən uzaq düşməsinlər, meymunluqdan əl çəkib, fikirlərini açıq və sadə dildə yazsınlar, ta ki, xalq onların yazdıqlarını oxuyub anlasın, düşünsün və ayılsın. Ancaq bu yolla yazan ilə oxuyan arasında dostluq, ittifaq və birlik əmələ gələ bilər" ["Molla Nəsrəddin" jurnalı. 1913, № 23]. Aydındır ki, dil məsələsi siyasi səciyyə daşıyırdı. Bəzən Azərbaycan xalqı müstəqil bir xalq, onun dili isə müstəqil bir dil kimi inkar edilir, ya da ümumtürk ortaq dil kimi götürülməyə cəhd edilirdi. Xalqın özünü "qövm", "tayfa" hesab edənlər dilini "şivə", "Qafqaz şivəsi" adlandırır, "sənin ayrıca bir lisanın yoxdur" [5, s.51-52] – deyə onu öz milli zəminəsindən ortaq dil kimi götürmək istəyirdilər.

Ana dili uğrunda irəli sürülən təşəbbüsləri milli maarifçiliyin inkişafı yolunda mübarizənin tərkib hissəsi hesab edən Firidun bəy yaxşı başa düşürdü ki, mədəniyyətin tərəqqisi, ana dilinin inkişaf etməsindən çox asılıdır. Bunsuz milli mədəniyyət yaratmaq olmaz. Bunsuz ittifaq bağlamaq olmaz, xalq bir-birini anlaya bilməz, ünsiyyət yaranmaz, bunsuz milli məktəblər təşkil etmək olmaz, bunsuz sadə adamlara dövrün inqilabi, demokratik tələblərilə əlaqədar olan nəcib hisslər aşılamaq olmaz. "Milli dil olmasa, o xalqın inkişafı dayanır, "ana dili" məhv olarsa, xalq artıq yox olar" - deyən K.Uşinskinin sözlərini F.Köçərli ürəkdən alqışlayır. "Molla Nəsrəddin" jurnalını vərəqləyərkən indiyə qədər işıqlandırılmayan bir tarixi faktla da qarşılaşırıq. Bu da Rəşid bəyin (M.F.Axundovun oğlu) atasının əlyazmalarından bir neçəsini F.Köçərliyə verdiyi faktdır. F.Köçərli jurnalda yazır: "Mirzə Fətəli Axundovun oğlu Rəşid bəy keçən vaxtlarda uca olan atasının əlyazmalarından bir neçəsini vermişdi ki, oxuyub lazım olan vaxt nəşr edim. O kağızlardan biri də həmin aşağıda dərc olunan fars dilində yazılmış bir məqalə idi ki, mən onu türk dilinə tərcümə elədim, göndərdim "Molla Nəsrəddin" idarəsinə. Çünki Mollanın səhifələrində çap olunmağını münasib görürəm" ["Molla Nəsrəddin" jurnalı. 1912, №

1]. F.Köçərli böyük maarifçi Mirzə Fətəli Axundovun əlifba layihəsini aydın, sadə, anlaşıqlı dil ilə tərcümə etmiş və onun əlifba layihəsini dəstəkləyənlərdən biri olmuşdur. Firidun bəy xalqın tez bir zamanda savadlanması, ana dilinin inkişafı üçün ərəb əlifbasının yeni əlifba ilə əvəz olunmasını vacib və həlli təxirə salınmaz məsələlərdən biri kimi dəyərləndirmişdir.

Mollanəsrəddinçi Ömər Faiq Nemanzadə də xalqına məxsus dili, əlifbası olmasını arzulayan və bu yöndə xalqının xeyrinə bir çox işlər görən ziyalılardan olmuşdur. Onun əsərlərində, eləcə də mətbuatda dərc etdirdiyi bir sıra məqalələrində Azərbaycan dilinə məxsus əlifba olmasını və məktəblərdə bu əlifbadan istifadə etməklə xalqımızın balalarına milli dilimizin tədris olunmasını arzulayırdı. Ö.F.Nemanzadə hər zaman ana dilinə xor baxanları tənqid etmiş və onlarla mübarizə aparmışdır. O, Cəlil Məmmədquluzadə ilə birlikdə yaratdığı "Molla Nəsrəddin" jurnalının səhifələrində istər məqalələri ilə, istərsə də felyetonları ilə açıq şəkildə bunu bəyan etmişdir.

Maarifçi-pedaqoq Ö.F.Nemanzadə qeyd edirdi: "Ana dilini tədris etmək üçün gərək onu xalqa sevdirək, bu da dövrün maarifçi ziyalılarının üzərinə düşür. Onlar qəzet və jurnallarda dərc etdirdikləri məqalələrdə öz sözlərimizdən istifadə etməklə, doğma dilimizi xalqa sevdirməlidirlər. Əgər ziyalılarımız bunu bacarmırlarsa, avam camaat bunu necə anlasın?!".

Ö.F.Nemanzadə dili millətin varlığı hesab edirdi. Elm, maarif və mədəniyyəti, təmiz ana dilində yazmağı, bu sahədə qonşu xalqlardan ibrət götürməyi odlu ürəklə təbliğ edirdi. O, ölkəmizdə milli məktəblərin açılmasının, orada müsəlman uşaqlarına dərs verilməsinin tərəfdarı idi. Lakin xalqın maariflənməyə etinasız qalması, onu xalqı oyandırmaq üçün işlər görməyə sövq edirdi. O, "Axalsixdən" adlı məqaləsində yazırdı: "Camaatımız çox rahatdır. Nə yeni məktəblərimiz var, nə də əski!.. Azqurda müsəlmanların parası ilə keçinən beş böyük meyxana, altı qəhvəxana vardır. Bu hesabca qırx min camaata bir Üsuli-Cədid məktəbi düşdüyü halda, iyirmi evə bir meyxana ilə iki qəhvəxana isabət edir. Maarifimiz də o dərəcədədir ki, dörd saatlıq yolu olan Qori darülmüəllimində bizdən ancaq bir müsəlman var" ["Tərcüman" qəzeti. 1900, № 1].

Ö.F.Nemanzadə azərbaycanlı uşaqların məktəbə cəlb olunması ilə yanaşı, onlara ana dilində təhsil verilməsini də tələb edirdi. O, bizim minlərcə türk sözlərimiz ola-ola, onları buraxıb, ata yerinə pədər, ana yerinə madər, Tanrı yerinə haqq-təala və s. sözləri işlətməyi, hətta onlar ilə yazmağı və bunu özümüzə bir hünər saymağı ən böyük qəbahət hesab edirdi. O yazırdı ki, "İndi insaf ediniz, bir millət ki, ata, ana, su,

çörək kimi sözləri də yad bir dildən alıb işlədə, dəxi o dilin, o millətin nə şanı olar. Dəxi nə hala deyə bilərik ki, mənim də dilim və vücudum vardır?" [9, s.171].

Ö.F.Nemanzadə ana dilinə dərin və sonsuz sevgi duyğularını "Eşq və məhəbbət" məqaləsində də ürək yanğısı ilə ifadə edirdi. O qeyd edirdi ki, "Dünyada nə çətin iş ola bilər ki, məhəbbət onu vücuda gətirə bilməsin? Əl verər ki, başda bir iş üçün məhəbbət ola! Əl verər ki, elm həvəsi, millət məhəbbəti, vətən eşqi, mədəni istiqlal arzusu hamı məhəbbətlərin güclüsü ola! Bunlar – insanı idarə edən bu güclər oldumu, daha irəlisini düşünməyiniz: istənilən hər şey bu sayədə yapıla biləcəkdir. Mən inanmıram ki, insan hər şeyi ürəkdən istəyə, ürəkdən elm və tədbir ilə çalışa, ürəkdən məhəbbət bağlaya, o şey başa gəlməyə! Mən inanmıram ki, məhəbbətlə can qıyılan yerdə dünyalar əmələ gəlməyə. Eşidirik ki, bir yaponiyalı dənizdə üzən qorxulu bir düşmən minasını partladıb, öz vücudu ilə bərabər darmadağın edir. Eşidirik ki, bir avropalı on min metrlik aeroplan ilə bərabər aşağı fırlanıb düşmənin əhəmiyyətli bir flotunu özü ilə bərabər parça-tikə edir. Eşidirik ki, bir şəxs Vətən uğrunda düşmən qalasının barıt anbarını odlayıb özü ilə bərabər havaya sovurur. Bəli, məhəbbət nələr, nələr elətdirməz! Dilinə olan məhəbbət deyilmidir ki, Rusiya təbəəsi iki polyakı, iki fini öldürəsən rusca danışmaz. Əcəba, polyak rusca, nemescə bilmirmi? Bəlkə firəngcə də bilir! Lakin hamısından artıq öz dilini sevir. Öz dilinin aşiqidir. Polyak bilir ki, bir millətin yaşaması dili ilədir. Dil yoxluğu millət yoxluğudur. Bu gün Polşa hər nə olursa olsun, madam ki, polyak dili vardır, Polşa dili də olacaqdır.

Sevgili oxucularım! Millətlərin qan və od içində çalışdığı belə bir həngamədə "dil" məsələsi ilə vaxt keçirməyimə çaşıb məni qınamayın. Mən görürəm ki, bizi o qan və od dənizindən qurtarmaq istəyənlərin çoxu hələ özgələrin dil və adət əsiridirlər. Bunlar öz əsirlikləri ilə bərabər, bizi də əsirlikdən qurtarmamaq, yalançı pəhlivanlıqda bulundurmaq istəyirlər. Bəlkə deyirsiniz ki, "dil"in millətpərvərliyə nə dəxli var? Bir kişi türkcə bilə-bilə qəsdlə danışmaz, amma ürəkdən millətpərvər olar. Belə ikiüzlülər bəlkə ola bilsin. Lakin, mən inanmıram ki, dilini sevməyən millətini sevsin. Çünki dil millətin tək nişanıdır, millət sevgisinin birinci əlamətidir. Dilini sevməyənin ürəyində millətpərvərlik duyğusu aramaq istiotdan bal dadı gözləməyə oxşar. Milli dilində danışmaq istəməyənin millətpərvərlikdən dəm vurması yalançılığın təzə modasından özgə bir şey ola bilməz" [9, s.203].

Bütün bunların hamısı, xalqın öz dilinə biganəliyi maarifçi pedaqoqu hiddətləndirirdi. O, haqlı olaraq inana bilmir ki, dilini sevməyən, millətini sevsin. Yazıçı "Yazımız, dilimiz, ikinci ilimiz" adlı məqaləsində yazırdı: "Atalarımız müsəlmanlığı ərəb hərfləri ilə və ərəb dili ilə öyrənmək istəyib, böyük zərərlərə, fəlakətlərə düçar oldular. "Düşün, sonra iman gətir" qaydasını buraxıb "gözünü,

beynini yum, ərəb dili ilə, ərəbə müqəllidlik ilə iman gətir" – üsulunu təqib etdilər. Bu yol ilə həm özlərini, həm də bizi bədbəxt etdilər" [9, s.166]. Ö.F.Nemanzadə xalqına səslənirdi ki, "Dili məhəbbətin başlanğıcı bilək! Dilimizə ən dərin eşq və məhəbbətlə sarılaq. Bunun xatirini heç bir xatirə dəyişməyək. Millət düşüncəsini yenə milli dil ilə ürəklərə birləşdirək. Yeri düşəndə deyirik ki, camaatımız oxumur, oxumaq istəmir. Bunu demək doğru deyildir. Hansı açıq dil ilə əsərlər yazıb camaatı oxumağa alışdırırıq ki, camaatdan şikayət eyləyək, onlara nə verdik ki, nə istəyək? Bir-iki para yazarlarımız, ha qışqırırlar ki, "Qoymayın millət geri qaldı!". Lakin millətin əsl geri qalmasına səbəb olan yazımızın, dilimizin izahı üçün, türkcəmizin işlənməsi üçün heç çalışdılarmı?" [8, s.198].

Ö.F.Nemanzadə yazır ki, "Dünyada heç bir millət tapılmaz ki, öz yazısı və ədəbiyyatı ola-ola öz dilini buraxıb özgə dili təlim eləsin? Dünyada heç bir millət özgələrinin morfologiya qaydalarını nə cürə ki, var, eləcə qəbul edib, öz dilinə doldurmamışdır. Ancaq dünyada bircə biz hamıdan "ağıllı", "qanacaqlı" çıxıb özgələrin başlarındakı sarıqları ilə bərabər ayaqlarının tozlarını da qəbul edib gözlərimizə sürmə eləmişik" – deyir. Həmçinin, o qeyd edir ki, bu üsuldan ölümdən qaçan kimi qaçmalıyıq. "Türklər nə qədər ki, türklükdən, Türküstandan uzaq düşüb, əsrlərcə ərəb hökuməti və dini, fars ədəbiyyatı, nüfuzu altında qaldılar, o qədər türklərini və türk dilini itirdilər" [9, s.163].

Ömər Faiq Nemanzadə Azərbaycan dilinin ərəb, fars sözləri ilə ağırlaşdığını göstərirsə, Əliqulu Qəmküsar da təəssüflə bu dillərlə yanaşı rus dilinin də dilimizə nüfuz etdiyini göstərərək yazırdı:

Hər kəs ki, gedir rus dilini qılmağa təhsil,
Az-maz qonuşur türki lisanın bir-iki il,
Bəs ki qarışır bir-birinə sonra bütün dil,
Kim zənn edəcəkdir bu müsəlman gərək olsun
[6, s.27].

Ömər Faiq qeyd edir ki, "Məhəbbətlərimizin ən üst qatına dil məhəbbətini çıxarmalıyıq. Ana dilini sevmək hamımızın ən birinci müqəddəs borcu olmalıdır. Biz özümüzü bilməsək, öz dilimizi bəyənməsək, kim bizə hörmət edəcək və nədən ötrü də etsinlər. "Heç düşünmürük ki, biz özümüzü istəməyəndə özgələrin bizi istəmələrini ummaq dəlilikdir" [9, s.203].

Böyük pedaqoqun 1914-cü ildə "Sədayi-həqq" qəzetində dərc olunan "Dil məsələsi" ilə bağlı publisist yazısında oxuyuruq: "Dil barəsində arabir yazılır. Hərə

ortalığa bir fikir atır, yenə məsələ əvvəlki dairəsində qalır. Camaatımızın anlamadığı, başa düşmədiyi bir dildə yazanların sayı gün-gündən artır. Bircə bunu bilməli ki, bu yazıçıların qəliz ibarələr işlətməkdə fikirləri nədir? Bu məsələ məni artıq dərəcədə həvəsləndirir. Çünki camaatımızın gələcəyi üçün bu da lazımlı və həlli vacib işlərdən biridir. Buna görə qələm sahiblərinə rast gəldikdə bu məsələ barəsində söhbət açıram, rəylərini bilmək istəyirəm. Belə söhbətlərin nəticəsi olaraq düşünürsən ki, qəliz ibarə işlədənlərin və osmanlı dili ilə yazanların çoxusu əqidə və məsləklə iş görmürlər. Məhz "belə yazıblar, yazırlar, biz də onlara baxıb yazırıq" demək xahişindədirlər. Bir çoxları türk dilini birləşdirmək istəyirlər. Buna görə də, osmanlı dilini ümumi bir dil sayır və bu dildə də kitab, qəzet, jurnallar yazıb Azərbaycan türklərinə verirlər. Halbuki, bunların özlərinə məxsus gözəl, asan və möhkəm dilləri var".

Ana dili və onun məktəblərdə tədrisi ilə bağlı mübarizə aparan və ana dilinin incəliyini, təmizliyini, sadəliyini xalqa sevdirməyə çalışanlardan biri də repressiya qurbanı Hüseyn Cavid olmuşdur. Dövrünün görkəmli maarifçilərindən olan Hüseyn Cavid də özündən əvvəlki pedaqoqların dil haqqında fikirlərinə əsaslanaraq, demokratik ideyalı müasirlərinin görüşləri ilə səsləşən fikirlər irəli sürür, ana dilinə xüsusi əhəmiyyət verir, onun məktəblərdə tədris edilməsi uğrunda mübarizə aparır və bu sahədə əməli iş görürdü. Hüseyn Cavid yaxşı dərk edirdi ki, xalqın savadlanması, elmə, maarifə yiyələnməsi, ictimai-siyasi hadisələri düzgün şəkildə anlaması üçün ana dili güclü bir silahdır. O, hər bir xalqın müstəqilliyini qoruyub saxlaması, yaşaması, təlim-tərbiyəsi işinin müvəffəqiyyətlə nəticələnməsi üçün ana dilini tədrisdə mühüm şərt hesab edirdi. "Ana dili məhv olarkən xalq artıq yox olur" – deyə hər bir xalqın müstəqilliyini saxlaması üçün dili əsas şərt hesab edən K.Uşinskinin bu ideyasını qəbul etmişdir.

Hüseyn Cavidə görə, gözəl ədəbi dili ancaq yazıçı, jurnalist və mühərrirlər yaratmırlar. Onu bütün xalq yaradır. Ona görə də, xalqın mövcud olması, başqa xalqlar arasında tanınması üçün Hüseyn Cavid xalqı dilinə və ədəbiyyatına ehtiramla yanaşmağa, başqa təsirlərdən qorumağa çağırır, xalqın bu sahədə olan nöqsanlarına acıyır. Maarifpərvər yazıçı heysiyyətə, mühitə qapılaraq kor-koranə, başqa-başqa xalqların "lisanlarını", adət-ənənələrini təqlid edərək öz dilinə, adət-ənənəsinə biganə qalmağı kəskin tənqid edirdi. Böyük sənətkar xüsusilə şeir, sənət dilinin obrazlılığına, canlı və təsirli olmasına fikir verir, onu korlayanları istehza ilə qarşılayırdı.

Ədibə görə, hər bir xalq öz ana dili vasitəsilə tərbiyə olunur, həyatı, dünyanı dərk edir. Ana dilinə xor baxmaq, vətən övladlarının mənəviyyatını zəhərləmək

xalqı yox etmək deməkdir. Bu cəhətdən Hüseyn Cavidin “Həsb-hal” adlı məqaləsi xüsusilə maraq doğurur. O, həmin məqalədə darülfünun qurtarmış “bəzi əfəndilər müstəsna olmaq şərtilə” ziyalıları nəzərdə tutaraq yazırdı: “Rusca oxumuş, türk dilində müəllimlik edən arxadaşlardan birisinin məktubundan bir parça: “Əfəndim, mən istəyirəm getmək iyunun on beşində mineralnı sulara, hansı ki, olar çox mənfəətli məndə olan cüzi naxoşluğa. …bəy də gedəcəkdir mənilə bərabər, ancaq qalmaq üçün orada iyirmibeş gün hərgah siz də istərsiniz gəlmək, olar mənim üçün çox yaxşı və çox xoşbəxtlik…”. İlk nəzərdə insan, bu cümlələrin türk dilində olduğuna əsla şübhə etməz, çünki hər kəlməsinə diqqət etsə, düzgüncə türk sözləri olduğunu təsdiqdən özünü alamaz. Lakin cümlələrdəki ahəngə, o qarışıq mübtəda-xəbərlərə bir musiqişünas sameəsilə qulaq versə, dərhal “xaxol” ruhilə düşünülmüş, türk kəlmələrilə vücuda gəlmiş bir əcibə olduğunu anlar. Bu hal, bu qarışıqlıq yalnız bəzi müəllimlərə məxsus deyildir. Şəhərlərdə iqamət edən, ruscaya azacıq aşina olan tüccar və kəsbəni dəxi ifsad etməkdədir. Elmsiz, saf bir köylünü (kəndli) qonuşdurunuz, onunla həsbi-hal ediniz, eyicə diqqət edəcək olursanız, şəhərlilərə nisbətən onların türk ləhcəsinə, türk ruhuna daha yaxın, daha munis bulursunuz” [2, s.210].

Hüseyn Cavidin ana dilinin təbliği ilə bağlı vətənpərvər çıxışları da az deyildir. Cavidi oxuyan hər bir vətəndaşda xalqa, vətənə dərin məhəbbət hissi doğur, onda öz vətənini, xalqını, ən başlıcası, ana dilini qorumaq hissi daha da artır. Şair-pedaqoqun əsərləri, məktub və məqalələri vətənpərvərlik alovu ilə alışıb yanır. O, ümumiyyətlə, inkişaf üçün maariflənməyi, mədəniləşməyi yeganə yol hesab edirdi. Hüseyn Cavid də əqidə dostları kimi məktəblərimizdə ana dili təlimini müdafiə edənlərdən biri olmuşdur. Cavid əfəndi XIX əsrin sonu – XX əsrin əvvəllərində milli məktəblərimizdə ana dilinə dərs saatlarından cəmi bircə saat vaxt ayrıldığına, qalan dərslərin rus dilində tədris edilməsinə qəti etirazını açıqlayaraq yazırdı: “Ana dili nə qədər lazım isə, hökumət dili də (rus dili nəzərdə tutulur – K.C.) o qədər vacibdir. Lakin Əli aşını, Vəli aşına qarışdırmamalı. “Qorodskoy” məktəblər başqa, milli məktəblər daha başqa bir şeydir. Burada yalnız iki sual nəzərə çarpır: məktəbdə məqsəd nədir? Və kimlər hansı məktəblərə getməlidirlər? Elm hər dildə vacibdir. Elmdə təəssüb yoxdur. Ancaq bir para şəxslər vardır ki, nəzəri-diqqətə almaq faydasız olmaz. Elmdə edilən istifadə yalnız mənəviyyata münhəsir (məhdud – K.C.) deyil. …Ən əvvəl məktəbdə məqsəd yazıb-oxumaqdır ki, ibtidai məktəblər bunun üçündür və hər millətin bütün əfradına (fərdlərinə – K.C.) vacib bir məsələdir. …Hər gün üç dərs rusca, bir dərs türkcə oxunsa, o yarım yanlış türkcədən heç bir fayda hasil olmaz. İki gün içində tamam unudular gedər. O qarışıq

yazılar, o pərişan imlalar, o qəliz kəlmələr ilə əsla bir şey anlaşılmaz. …Bəzi hər gün üç dərs türkcə, bir dərs rusca oxudulursa, bir iş sahibi, ticarət və sənaətcə lazım olan işlərini beş-üç kəlmə yazıb söyləşmək ilə yoluna qoya bilər. Fəqət rus dilindən kiçik bir xatirə qalır ki, yavaş-yavaş zaman qulağını buraraqdan öyrənməyə məcbur edər” [“Həqiqət qəzeti”. 5 yanvar, 1910, № 4].

Məktəblərdə ana dilinə belə ögey münasibət bəsləndiyini görən Hüseyn Cavid məktəb şagirdlərinin “tarixlərindən, köklərindən xəbərsiz” qalacaqlarını belə ifadə edirdi: “…Bir çox məktəb şagirdləri az bir zamanda özlərini unudurlar. Özlərini, sözlərini bilməyirlər. Tarixlərindən, köklərindən xəbərsiz qalırlar. Bu da bir millət üçün çox böyük qüvvət, çox böyük tədənnidir (geri getmə mənasında – K.C.). Dilsiz bir millət yaşamaz, çapıq münqəriz (aradan çıxmış – K.C.) olur. Bir millətin lisanı, mövcudiyyətinin ən parlaq bürhanıdır” [“Həqiqət qəzeti”. 5 yanvar, 1910, № 4].

“Növhə” adlı şeirində H.Cavid qanımız, canımız sayılan ana dilini müəllimlərimiz tərəfindən “vətən yavrularına” mükəmməl, tam mənimsətməyi məsləhət görür. Şair xalqımızın tərəqqisində, maarif və mədəniyyətinin inkişafında, habelə cəhalətə, durğunluğa qarşı mübarizədə ən mükəmməl vasitə olan doğma dilimizin tədrisinə, inkişafına biganə olanları açıq-aşkar tənqid edir, onları vətən dilini öyrənməyə səsləyir:

Ögrətdi bilmirəm bizi kim bu cəhalətə?
Vəhşilik irs olub bu gün əbnayi-millətə.
Mötad ediblər yaxşı bizi xabi-qəflətə.
Biz millətin ayılmağı qaldı qiyamətə,
Baislərin Xuda özü versin cəzasını.

Həll eyləmək qabaqca gərək tez bu müşkili,
Bilsin vətən cocuqları əvvəl vətən dili.
Gəlməz nəvayə görməsə bülbül çəmən güli,
Təsdiq edər danışdırsan hər bir aqili,
Hər millət öz dilində tapıb müddəasını
[3, s.122].

Şübhəsiz ki, Hüseyn Cavid, Firidun bəy Köçərli və Ömər Faiq Nemanzadədən fərqli olaraq, Azərbaycan dilini başqa xalqların dilinə qarşı qoymamışdır. O, bütün dilləri öyrənib bilməyin tərəfdarı olmuşdur. Hələ İstanbulda ali təhsil aldığı illərdə

məktub və məqalələrində gənc nəslə nəsihət edərək, dil öyrənməyə xüsusi diqqət yetirməyi zəruri sayırdı. H.Cavidin özünün də rus, ingilis, alman və fransız dillərini öyrənməsi barədə maraqlı qeydləri vardır. Təbii ki, fars və ərəb dillərini hələ "Mədrəsə"də, "Məktəbi-Tərbiyə" və İranda "Talibiyyə" mədrəsəsində oxuduğu illərdə öyrənmişdir.

1904-cü il avqustun 27-si "Şərqi-Rus" qəzetində nəşr etdirdiyi "Naxçıvandan təbsirə" adlı məqaləsində Hüseyn Cavid yazırdı: "…Vətən övladı əvvəlcə vətən dili olan türk dilini bəzi mətbuatı oxumaq və öyrənmək üçün bilməlidir. İkinci, bir para hadisələrin və xəbərlərin məzmununu bilmək üçün fars dilini öyrənməlidir, üçüncü, dini məsələlərlə məşğul olanlar ərəb dilini bilməlidirlər. Dördüncü, rus dilini əsaslı bilməlidirlər. O rus dilini ki, bizim vətəndə bəzi həqiqətləri və məsələləri bilmək və dərk etməkdə ən lazımi vəsait sayılır. O dili öyrənmək və bilmək lazım və vacibdir". H.Cavid məktəblərdə ana dilinin təlimini yaxşılaşdırmaq ideyasını əsaslandırmış, təlim prosesində onun mühüm rol oynadığını göstərmişdir. O, məktəblərdə ana dili və ədəbiyyatın tədrisinə böyük əhəmiyyət verərək göstərirdi ki, biz ana dili və ədəbiyyatın tədrisini yaxşılaşdırmayınca, onu əsaslı öyrənməyincə, xalq içərisində yaymayınca, həm övladlarımız, həm də başqa xalqlar bizim dilimizdən, ədəbiyyat və mədəniyyətimizdən xəbərsiz qalacaq, ona əhəmiyyət verməyəcəkdir.

Qeyd etmək lazımdır ki, Hüseyn Cavid məktəblərdə ana dilinin tədrisini sadəcə təbliğ etmirdi. O, "Rüşdiyyə", "Aliyevo uçenie", "Səfa" və s. məktəblərdə ana dili və ədəbiyyatdan dərs deyərək bu işdə bilavasitə əməli fəaliyyət göstərirdi. Bununla əlaqədar oxuyuruq: "Səfa" cəmiyyətinin nə dərəcədə tərəqqi etdiyinə bir dəlil də indiki "Səfa" məktəbi göstərilə bilər. İbtidada yalnız acizlərinin təhti-idarəsinə baxan bir məktəb, indi hər cəhətcə vüsət tapıb Hüseyn Cavid …kimi müqtədir zatlar əlinə keçmişdir… "Səfa" məktəbi ilə şəhər məktəblərinin arasında olan fərq çox böyükdür. Çünki "Səfa" məktəbi ilə oradakılarını bilmək üçün dördüncü sinifdən buraxdığımız uşaqların şəhadətnamələri bunu isbat edə bilər. Əlbəttə, Hüseyn Cavid verən türkcələr ilə başqa türkcələrdə təvafüt olmalıdır. "…Cavid incə ruhlu bir şair olmaqla bərabər, türk dilini əruz vəzni ilə qarışdıran və bir-birindən ayrılmaz bir hala salan sənətkardır" [Yeni yol qəzeti. 12 yanvar, 1925] və onun "yaratdığı dil və üslub haralardan alınır-alınsın, nə kimi ilhamlardan doğur-doğsun, Azərbaycandakı şair və ədiblərimiz içində ən müstəsna, ən zərif və narın bir dildir. Bu dilin gələcək nəslimizə təsiri olmamış olmaz. …Bu da Cavidin Azərbaycan ədəbiyyatına ən böyük xidmətlərindən biri sayılacaqdır" [13, s.42-45].

Öz xalqını dünya miqyasında, müasir mədəniyyət dünyasında görmək istəyən Cavid təlimin ana dilində aparılmasını həyata keçirməkdə dərslik və dərs vəsaitlərinin böyük əhəmiyyətini başa düşmüş, dərsliklər tərtib etmiş, əsərlərinin bədii ifadə tərzinə böyük əhəmiyyət vermiş, bütün qabaqcıl ziyalıları, yazıçı və şairləri də Azərbaycan dilində yazmağa çağırmışdır. O, ana dilinin saflığını qoruyub-saxlamağa, bu dildə əsərlər yaratmağa təşviq edirdi. Cavid şeiri, sənət əsərini, xalqın başa düşəcəyi sadə ana dilində yazmağı tələb edərək, onu kütlələrin şüuruna təsir edən qüvvətli bir vasitə kimi qiymətləndirirdi. Bunu “Yeni iqbal” qəzeti belə təsdiqləyirdi: “Hüseyn Cavid əfəndi Qafqasiya islamlarının ən dərin düşüncəli və ən incə duyğulu, əməlpərvər, həqiqi şairidir. Onun mümkün olduğu qədər sadə türkcə kəlmələrdən düzdüyü səlis və ahəngdar səlasəti-bədiəsi, oxuyanın qarşısında məharət və lətafət, nəzakət və nəzahət, məna və hikmət, əməl və fikrət kimi pək nadir məzayayi-aliyəsi canlanaraq, son dərəcə parlaq və dilnişin lövhələr təsvir etməkdədir. Bu məziyyətlər bütün bir lövhədə ahəngdaranə bir surətdə sızılıb getdiyi kimi, onun hər bir kəlməsində, imlasında, şivəsində, lisanında və yalnız özünə xas üslubi-fəsihində belə diri-diri çırpınıb durur. Bundan dolayı biz Hüseyn Cavid əfəndinin Qafqaz müsəlmanlarının ən birinci müalipərvər bir ədib, bədii və şair süxənməraz nəzihidir-demək istərdik” [“Yeni iqbal” qəzeti. 13 avqust, 1915, № 90].

Repressiya qurbanı Yusif Vəzir Çəmənzəminli də qeyd edir ki, hər bir xalq öz ana dili vasitəsilə tərbiyə olunur, həyatı, dünyanı dərk edir. Ana dilinə xor baxmaq, vətən övladlarının mənəviyyatını zəhərləmək, xalqı yox etmək deməkdir. Y.Vəzirin də ana dili ilə bağlı vətənpərvər çıxışları az deyil. Onu oxuyan hər bir vətəndaşda xalqa, vətənə dərin məhəbbət hissi doğur, onda öz vətənini, xalqını, ən başlıcası, ana dilini qorumaq hissi daha da artır. Ədib-pedaqoqun əsərləri, məktub və məqalələri vətənpərvərlik alovu ilə alışıb yanır. O, ümumiyyətlə, inkişaf üçün maariflənməyi, mədəniləşməyi yeganə yol hesab edirdi.

Haqqında söhbət açılan şair və yazıçılardan biri də Mir Möhsün Nəvvabdır. Y.V.Çəmənzəminli yazır ki, “Cənab Nəvvab türk şairlərinin tərcümeyi-hallarını farsca yazır, türk oxucularına təqdim edir. Halbuki cənab Nəvvab türk dilini bilir və bu dildə şeirlər də yazıb” [4, s.335]. Qeyd edilir ki, köhnə məktəblərdə uşaq öz dilində oxuyub yazmır – kitablar və yazılar fars dilində olur. Təbiidir ki, bu məktəblərdən çıxanlar özləri ilə həmişə bir farslıq daşıyırlar. Bunun üçün də şairlərimiz əsərlərini fars dilində yazır, fars hərflərini təqlid edirlər və cəmiyyətimizin adi üzvləri də məktub, sənəd, ticarətə dair hesablar və qeyri şeylər yazdıqda yenə fars dilinə müraciət edirlər. Qəribə burasıdır ki, iki türk bir-biri ilə öz

dillərində danışdıqları halda, bir-birinə kağız yazdıqda fars dilində yazırlar. Ana dilimizi fars, ərəb, osmanlı qarışığından xilas etməyin yollarını axtaran Yusif Vəzir fikirlərini səkkiz fəsilə bölür. Bunlardan bir neçəsinə nəzər salaq: “I. Gərək bizim bir cəmiyyətimiz olsun ki, dilimizi farslıqdan xilas eləsin. Bu da onda mümkündür ki, cəmiyyəti fəal və kamil amillər təşkil edələr. Və hər müəllif kitabını çapa verməkdən qabaq cəmiyyətə göstərib qüsurlarını düzəltdirə. Beləliklə də, ədəbiyyatımızın iki axıntıdan da uzaq olub, osmanlı və ərəb dillərinin nüfuzu altına düşməz. Bir də ədəbiyyatımız ədəbsiz kəlmələrdən və qeyri qüsurlardan xilas olar. II. Gərək müstəid (müstəid – istedadlı – K.C.) və geniş məlumatlı münəqqidlərimiz (münəqqid – tənqidçi – K.C.) ola, qələmlərinin qüvvəsi ilə dil və ədəbiyyatımızı düz yola çıxardalar. Ədəbi dil el ədəbiyyatından götürülməlidir… O söz ki, türkdə var, onun əvəzinə qeyri söz yazmaq, danışıqda işlətmək, əlbəttə böyük xətadır. Məsələn, “su” ola-ola “ab” və ya “qan” əvəzinə “xun” demək kimi. Amma şeir ilə yazan qafiyə düzlüyünə möhtac olmayıb həmişə “arvad” əvəzinə “zən” və ya “qadın” kimi xətalardan əsərini uzaq saxlaya bilər”. IV fəsildə yazır: “Qızlarımızı mükəmməl surətdə oxutmalıdır. Onları hüquqsuzluq təzyiqindən qurtarmalıdır. Arvad elmli və əri ilə müsavi olsa milli ruhlu və tərbiyəli övladlar yetirər. Təbiidir ki, belə uşaqlar gələcəkdə öz tərbiyələri sayəsində nə farslığın və nə qeyri millətlərin nüfuzu altına düşməyib öz milli yolu ilə milli qayələrə (ideala) doğru gedər”. V fəsil. “Türk məktəblərinin (Azərbaycan məktəblərinin – K.C.) sayını artırmalıdır…”. VIII fəsildə isə deyilir: “Azərbaycan türklərinin tarixini sadə bir dildə yazdırıb nəşr etməlidir ki, camaat özünün türk olmağını bilsin. Keçmişini öyrənsin və milli vəzifələrini düşünüb gələcək üçün çarələr arasın. Yoxsa hər kəsdən soruşursan: “Sən kimsən?” Deyir: “Müsəlman”. Tahı bunu bilmirlər ki, dinimiz müsəlman dinidir, millətimizsə türk millətidir” [4, s.336].

Y.V.Çəmənzəminli “İki aləm” adlı məqaləsində ana dilinə olan ögey münasibəti “Kaspi” qəzetini vərəqlərkən də görür. Verilən suallara cavab çox tutarlıdır: “Niyə türk komitəsinin məlumatı rus dilində verilir? Cavab: Bizdə milli dil qədri bilmək qabiliyyəti hələ yoxdur. Biz o qədər ruslaşmışıq ki, Nikolaydan sonra yenə köhnə işlərdən əl çəkə bilmirik” [4, s.237].

“Niyyətin hara, mənzilin də ora” atalar sözünün mahiyyətini dərindən anlayan və “Nicatımız mədəniyyətə bağlıdır” – deyən Y.V.Çəmənzəminli qeyd edir ki, bir şəxs və ya millət üçün niyyət çox böyük şərtdir. Pedaqoq yazır: “Ana dilimizin tənəzzülü millətimizin tənəzzülüdür. Bu dili hər bir kəs sevməli, bu dildə danışmağı eyib yox, fəxr hesab etməlidir. Vətənimizin hər bir guşəsində təzə üsul ilə məktəblər açmalıdır. “Tərbiyə və təlimdə qızlar ilə oğlanlara təvavüt qoymamalıdır; ikisini də

kamil oxutmalıdır. Qızların elmini və təcrübəsini artırmalıdır ki, kişilərə möhtac olmayıb, özləri öz başlarını dolandıra bilsinlər. Həkimlik, mamalıq, müəllimlik, dərzilik, əkin və ticarət işlərilə arvadları tanış eləsək, milli dövlətimiz artar. İndiki kimi arvadlar müftəxor olub, kişilərin üstə düşməzlər. Müəllimə və müəllimlər yetirmək üçün milli məktəb açılmalıdır. Belə məktəb qurtarmışlar aramızda milli toxumlar saçmağa artıq lazımdırlar".

## Nəticə / Conclusion

Bütün bu deyilənlərdən sonra belə bir nəticə çıxarmaq olar:

- Çoxcəhətli fəaliyyət dairəsinə malik olan repressiya qurbanları Firidun bəy Köçərli, Ömər Faiq Nemanzadə, Hüseyn Cavid, Yusif Vəzir Çəmənzəminli nakam ömürlərinin sonuna qədər ana dilində aparılan təlimin ictimai-pedaqoji əhəmiyyətini dərk edərək, Azərbaycan məktəblərinin ana dilində olmasını, ana dilinin tədrisinin yaxşılaşdırılmasını dövlətdən qəti şəkildə tələb etmişlər;
- Dilin saflığı, zənginliyi, ədəbi dilin yaradılması uğrunda mübarizə aparmış, nəzəri fikirlərinin həyata keçirilməsi üçün bütün fəaliyyəti boyu inamla, dönmədən əməli iş görmüşlər;
- Repressiya qurbanları pedaqoji fikir tariximizdə mühüm yer tutan, onun inkişafı yolunda silinməz iz buraxan, çoxşaxəli tarixi xidmətləri ilə metodik fikri irəli aparan şəxsiyyətlərdən olmuşlar;
- Repressiya qurbanlarının ədəbi fəaliyyətində, məktub və publisist yazılarında ana dili təlimi haqqında fikirləri, zamanı üçün əhəmiyyətli olan dərslikləri və s. kimi ümumi pedaqoji istiqamətlər gələcəkdə də öyrənilməyə layiqdir.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Cavid H. (1910). Naxçıvana nə lazım? "Həqiqət" qəzeti. 5 yanvar, № 4.
2. Cavid H. (1985). Seçilmiş əsərləri. Dörd cilddə. IV cild. Bakı, Yazıçı. 320 s.
3. Cavid H. (2005). Əsərləri. Beş cilddə. I cild. Bakı, Lider nəşriyyat. 288 s.
4. Çəmənzəminli Y.V. (2005). Seçilmiş əsərləri. Üç cilddə. III cild. Bakı, Avrasiya press. 440 s.
5. Hüseynzadə Ə. (1907). İntiqad ediyoruz, intiqad olunuyoruz. "Füyuzat" jurnalı. 27 iyul, № 23, s.51-52.
6. Qəmküsar Ə. (2006). Seçilmiş əsərləri. Bakı, Şərq-Qərb. 168 s.
7. "Molla Nəsrəddin" jurnalı. (1906-1931).
8. Nemanzadə Ö.F. (1992). Seçilmiş əsərləri. Bakı, Yazıçı. 536 s.
9. Nemanzadə Ö.F. (2006). Seçilmiş əsərləri. Bakı, Şərq-Qərb. 352 s.
10. "Tərcüman" qəzeti. (1900). № 1.
11. "Yeni iqbal" qəzeti. (1915). 13 avqust, № 90.
12. Ədəbiyyatımızda Cavid. (1925). "Yeni yol" qəzeti, 12 yanvar.
13. Zeynallı H. (1926). Hüseyn Cavidin yazdığı "Peyğəmbər" haqqında mülahizələrim. "Maarif və mədəniyyət" jurnalı, № 9, s.42-45.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 95-103
https://dx.doi.org/10.48445/TAIIJ.2021.63.40.009

**M E T O D İ K A**

# Əfsanə və rəvayətlərin uşaqların mənəvi inkişafında rolu, əhəmiyyəti və tədrisi məsələləri

***Çinarə Rzayeva***
Filologiya üzrə fəlsəfə doktoru, AMEA Naxçıvan Bölməsi. Azərbaycan.
E-mail: cinarerzayeva@yahoo.com.tr
https://orcid.org/0000-0003-0655-9342

**XÜLASƏ**
Müasir dövrümüzdə milli kimliyimizi, folklorumuzu qoruyub saxlamaq xüsusilə zəruridir. Uşaqlar ana dilinin incəliyini, saflığını və gözəlliyini lap körpəlikdən anlamalıdır. Analar dilin gözəlliyini beşik başında oxuduqları laylalar, bayatılar, əzizləmələr vasitəsilə uşağın ruhuna hopdurur. Məqalədə uşaqların mənəvi zənginliyinin artması və onların mükəmməl şəxsiyyət kimi yetişməsində əfsanə və rəvayətlərin rolu geniş araşdırılır. Bir çox təhlillər aparılaraq əfsanə və rəvayətlərin mənəvi əhəmiyyəti, tərbiyəvi cəhətləri müəyyən edilir. Həmçinin məqalədə əfsanə və rəvayətlərin tədrisinə verilən önəm və onların daha yaxşı mənimsənilməsi üçün müasir təlim metodu və üsullardan necə istifadə edilməsi məsələləri də araşdırılır. Tədqiqatlar zamanı bir daha məlum oldu ki, uşaqların həyatında əfsanə və rəvayətlərin rolu danılmazdır. Həmçinin məqalədə bu nümunələrin uşağın milli ruhda böyüməsinə, yaradıcılıq qabiliyyətlərinin formalaşmasına göstərdiyi təsir də qeyd olunur.

**AÇAR SÖZLƏR**
folklor, əfsanə və rəvayətlər, uşaqlar, inkişaf

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 09.02.2021
qəbul edilib: 22.02.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 95-103
https://dx.doi.org/10.48445/TAIIJ.2021.63.40.009

METHODS

# The role, importance and teaching of myths and legends in the spiritual development of children

***Chinara Rzayeva***
PhD in Philology, Nakhchivan Branch of ANAS. Azerbaijan.
E-mail: cinarerzayeva@yahoo.com.tr
https://orcid.org/0000-0003-0655-9342

**ABSTRACT**
In today's world the preservation of national identity, and in particular of the folklore is very important. Children need to be aware of infancy tenderness, fragility, purity and beauty of the native language. Mothers at the cradle try to absorb the beauty of the language into the spirit of the child with the help of lullabies, bayatis and caressing rhymes. Position of preserving this heritage is primarily dependent on the mothers, and then on teachers. The article also focuses on the role of legend and legendin increasing the spiritual wealth of children and their growth as perfect individuals. The article investigates the importance given to the development of folk examples in as well as ways to better use of modern methods in its teaching. Many studies have investigated the spiritual significance and educational value of legend and legendin. Research has once again established that the role of valuable tales in children's lives is immense and undeniable. The article also notes the special influence of.

**KEYWORDS**
folklore, legends and myths, children, development

**ARTICLE HISTORY**
Received: 09.02.2021
Accepted: 22.02.2021

## Giriş / Introduction

Hər bir xalqın folkloru onun mənəvi kimliyi, söz varlığı, keçmişi, həyata baxışı, yaşayış tərzi barədə məlumat əldə etməyə imkan yaradır. Çünki folklorumuzda xalqımızın milli sərvəti cəmləşib. Folklor nümunələri təkcə keçmişimizi yaşadan xəzinə deyil, həmçinin mühüm tərbiyəvi əhəmiyyət daşıyan yaddaş kodudur. Zəngin folklor materiallarının tərkibində uşaq folkloru xüsusi yer tutur. Bu folklor nümunələri uşaqların mənəvi inkişafında, onların düzgün formalaşması və sağlam böyüməsində mühüm rol oynayır. Bunlarla yanaşı, uşaqların diqqətini çəkən janrlardan biri də əfsanə və rəvayətlərdir. Folklorun epik növünə aid olan bu janrlar xalqın tarixini, dünyagörüşünü, təfəkkürünü özündə yaşadır. "Əfsanə janrı bir formal struktur hadisəsi olmaqla, məzmununu reallıqdan alır. Bu baxımdan, mətndə əks olunan məzmun formanı həm şərtləndirir, həm də onu hərəkətə gətirir" [3, s.6].

Digər janrlar kimi bu janr da uşaqlar üçün maraqlıdır. Belə əhəmiyyətli əfsanə və rəvayətlərin bir neçəsinə nəzər salaq:

"Təmənnalı yaxşılıq" əfsanəsinin uşaqlar üçün tərbiyəvi əhəmiyyəti çox böyükdür. Aşağıda həmin əfsanəni tam şəkildə verib, sonra onun tərbiyəvi əhəmiyyətini izah edək:

"Şərur düzündə öz zəhmətilə güzəran keçirən bir qoca əkinçi yaşayırdı. Yazın ılıq nəfəsi duyulurdu. Qoca xışı yenicə qoşub bir-iki cız əkin etmişdi. Gördü ki, bir quzğun caynağına aldığı hacıleyləyi sal bir daşa çırpdı. Quzğun leyləyin üstünə bir də şığımaq istədi. Ancaq qocanı görüb, havada bir neçə dövrə vurdu. Ona qədər qoca özünü hacıleyləyə çatdırdı. Baxdı ki, leyləyin qanadının və qıçının biri sınıb. Axşam evə dönəndə hacıleyləyi də gətirdi. Bir müddət dava-dərmanla yaralı quşun qanadını və qıçını müalicə etməklə məşğul oldu. Hacıleyləyin qanadı və qıçı sappasağ oldu. Qoca əkinçi buna çox sevindi. O, hacıleyləyi gətirib çölə buraxdı.

Aradan xeyli keçmişdi. Qoca əkinçi şuma toxum səpirdi. Bir də gördü ki, budur ha, hacıleylək gəldi, onun başı üstündə çırpınıb qanad çaldı. Axırda da yerə bir toxum salıb getdi. Qoca bildi ki, xeyirli şeydi. Onları səliqə ilə torpağa basdırdı. Vaxt-vədə gəlib keçdi. Bu toxumdan iri qarpızlar əmələ gəldi. Qoca qarpızlardan birini kəsdi. Baxdı ki, qan qırmızı olan bu qarpızların beçə balı kimi şirinliyi var.

Qoca xeyli fikirləşəndən sonra dedi:

– Bu ölkənin şahı çox əzazil bir adamdır. Bunun birini onsuz bazara çıxarıb satsam, dərimə saman təpər.

Bunu qabaqcadan hiss edən qoca bağban tağdan bir-iki qarpız üzdü, məcməyiyə qoyub üstünə yaylıq örtdü və şaha hədiyyə apardı.

Şah əkinçinin hədiyyəsinə heyrətlə baxırdı, nə olduğunu bilmirdi. Qarpızı kəsəndə içindən süfrəyə bir ətək qızıl töküldü.

Qocanı heyrət bürümüşdü ki, bu necə olan şeydi?

Şah dedi:

– Bu sirdən məni agah et!

Qoca əkinçi hacıleylək əhvalatını danışdı.

Şah əmr edib dedi:

– Sənə üç gün möhlət verirəm, hər necə olur-olsun, həmin hacıleylək quşunu tutub mənə gətirməlisən.

Ağır cəzadan qorxan qoca əkinçi tələ qurdu, tor qayırdı. Çox çətinliklə hacıleyləyi tutub şaha gətirdi. Şah hacıleyləyin əvvəl qanadının birini, sonra da qıçının birini öz əli ilə sındırdı. Quşa xüsusi yer ayırdı. Onu böyük qayğı ilə sağaltmağa başladı. Quşun qanadı və qıçı gözəl xidmət nəticəsində sağaldı. Şah quşu əlləri üstə alıb havaya uçurdu. Hacıleylək bir an içərisində uçub görünməz olub, çox-çox uzaqlara uçdu. Şah hər gün pəncərədə oturub quşun yolunu gözləyirdi. Quş həqiqətən bir səhər qayıtdı və ağzında bir neçə toxum gətirdi. Quşun güllü bağçaya atdığı toxumu bir-bir yerdən yığdılar.

Şahın əmri ilə bağçanı tərtəmiz etdilər. Qızılgül kollarını çıxarıb kənara atdılar. Əvəzində torpağa quşun gətirdiyi toxumu əkdilər. Bir neçə gündən sonra bağçanı qaratikan kolu ağzına götürdü. Qaratikanı nə qədər kəsdilər, atdılar, kökünü kəsə bilmədilər.

Şaha agah oldu:

– Qoca bağbanın quşa etdiyi yaxşılıq təmənnasız, onunku isə, təmənnalı yaxşılıq idi. Bunu bilən quş hər kəsə öz payını çatdırıb” [3, s.164].

Bu əfsanədə uşaqlar yaxşılığın nəticəsinin mükafat, pisliyin nəticəsinin isə pislik olduğunu görür və dərk edir ki, yaxşılıq etmək lazımdır. Həm də kiməsə pislik edib, sonra yaxşılıq etmək də müsbət nəticələnmir. Burada şahın etdiyi yaxşılıq yox, pislik idi. Təmənna umduğuna görə yaxşılıq etmiş kimi göründü. Uşaqlar belə janrlar vasitəsi ilə yaxşılığın nə olduğunu bir daha dərk edir. Unutmayaq ki, yaxşılıq “bəziləri üçün, daha doğrusu əksəriyyət üçün bu söz sadəcə sənə ehtiyacın olduğu halda uzadılan ələ qarşılıq, qısacası, nəyəsə qarşılıq verməyə duyulan mənəvi ehtiyac, çox az saylı insanlar üçün isə, istər maddi, istərsə də mənəvi qarşılıq güdmədən, sadəcə içindən gəldiyi üçün, heç kəsə bildirməyə, nümayiş etdirməyə çalışmadan, əksinə, hətta yaxşılıq etdiyin insanın belə özünü

səndən asılı, bəlkə də aciz hiss edə bilməsi ehtimalına qarşı bunu o insandan belə gizlədərək, ən azı bəlli etməməyə çalışılaraq edilən bir əməldir”.[1]

Bu məqamda bununla bağlı atalar sözləri yada düşür:

Yaxşılıq eləyib bir şey umursansa, etməsən yaxşıdır.
***
Yaxşılıq itməz.
***
Yaxşılıq yerdə qalmaz.
***
Yaxşılıq elə ki, başına gəlsin.
***
Yaxşılıq edən yaxşılıq görər
[4, s.411].

İnsan təfəkkürünün məhsulu olan bu janrın tədrisini də bir sıra üsullarla maraqlı etmək mümkündür. Uşaqlara əfsanələr haqqında məlumat verəndən sonra, bir neçə nümunə göstərmək lazımdır ki, onlar əfsanənin mahiyyətini anlaya bilsinlər. Sonra uşaqlara hər hansı bir canlının, əşyanın, dağın və s. adını verib ona bununla bağlı əfsanə yaratmaq da tapşırılsa, düşünürük ki, müsbət nəticələr əldə edilmiş olar. Bu zaman uşaq gözü önündə gördüyü və ya xəyal etdiyi bir şey haqqında öz ağlından, ürəyindən keçənləri, öz təfəkkürünə uyğun hər hansısa bir ideyanı, fikri söyləyərək əfsanə yaradacaqdır. Bu həm uşaqlarda söz ehtiyatını artıracaq, həm də onların təfəkkürünü, düşüncəsini inkişaf etdirəcəkdir. Bir neçə əfsanəyə nəzər salaq:

“Deyirlər ki, qədim zamanlarda yer üzündə iki div var imiş. Bu divlərdən biri Məğribdə, o birisi Məşriqdə yaşayırmış. Bunlar qolda, qüvvətdə bir-birindən geri qalmazmış. Hər ikisi öz igidliyindən dəm vurub “mənəm-mənəm” deyərmiş. Onlar bir-birinin haqqında çox eşidibmiş, amma heç vaxt görüşməyiblərmiş. “İki qoçun başı bir qazanda qaynamaz!” – deyib, Naxçıvanda görüşmək qərarına gəlirlər.

Uzun səfərdən sonra onlar üz-üzə durub vuruşmağa başlayırlar. Vuruşları çox çəkir, heç biri üstün gələ bilmir. Bu minval ilə xeyli vuruşurlar, di gəl ki, bir şey çıxmır. Divlər qurşaq tuturlar, yenə bir-birini yıxa bilmirlər. Axırda toppuz vuruşuna keçirlər. Sən demə, bu divlərdən biri qadın imiş, o biri kişi. Amma bu məsələdən kişi divin xəbəri yox imiş. Toppuz vuruşu da çox bərk gedir. Birinci,

[1] https://nihatatakishiyev.wordpress.com/2015/03/10/yaxsiliq-n%C9%99dir/

ikinci vuruşda toppuzlar göydə çox toqquşur. Üçüncü vuruşda toppuzu bir-birinin başına endirə bilirlər. Qadın divin toppuzu kişi divin başın haçalayır, kişi divin toppuzu da necə bərk dəyirsə, qadın div uşaq salmalı olur. Həm də zərbələrini bərk vurduqlarından bir-birindən aralı düşürlər. Kişi div öz əməlindən peşman olur, yaralı-yaralı başını qaldırır ki, qadın divi görsün, amma qadın div çox aralı düşübmüş. Divlərin vuruşu göylərə xoş getmir. Hər iki divi Tanrı daşa döndərir. Üstündən xeyli keçəndən sonra divlər iki dağa dönüb aralıdan bir-birinə baxırlar. O vaxtdan kişi div "Haça dağ", qadın div isə "Ağrı dağ" adı ilə tanınır. Ağrı dağın yanında balası da var".[2]

Uşaqlar bu əfsanə vasitəsi ilə iki dağın adını öyrənmiş olur. Öyrəndikləri bu dağ adları onlarda maraq oyadacaq, gələcəkdə bu mövzuda elmi araşdırmalarını aparacaqlar. Fikrimizcə, dağın şəklini uşaqlara elektron lövhədə göstərməklə, daha yaxşı nəticələr əldə etmiş olarıq. Sonra uşaqlara "Bununla bağlı siz necə əfsanə yaradardınız?" – sualını verə bilərik.

Quşlarla bağlı hər hansı bir əfsanə danışırıqsa, onunla bağlı bir sıra slaydlar hazırlamaq, yaxud əyani vasitələrdən istifadə etməklə, uşaqlara bu əfsanəni daha yaxşı mənimsətmiş olarıq. Bu mövzu ilə bağlı olan əfsanələr kiçik yaşlı uşaqlar üçün xüsusi ilə maraqlıdır. Bu əfsanələrdə yaş həddinə uyğun elə mövzular seçilməlidir ki, uşağın diqqətini cəlb etsin və o, mövzunu dərk etməkdə çətinlik çəkməsin. Quşlardan danışarkən onlarla bağlı əfsanələri xatırlamaq yerinə düşər. "Şanapipik quşu" əfsanəsi bu mənada maraqlı ola bilər:

Şanapipik əvvəllər gəlin imiş. Bir dəfə başını yuyurmuş. Bu vaxt onun qayınatası içəri daxil olur. Gəlin utanır. Allaha yalvarıb deyir:

– Ay Allah, qayınatam saçlarımı gördü, mən xəcalətdən onun üzünə baxa bilmərəm, məni ya daş elə, ya da quş. Gəlin quşa çevrilir. Darağı başında qalır, şanapipik olur. Şanapipik çöldə yaşasa da, abadlıqdan çox uzağa getmir, axı onun gözü istəkli ərində, doğma evində qalıb… [3, s.170].

Bu əfsanənin tərbiyəvi əhəmiyyəti nədədir? – sualına belə cavab verə bilərik. Burada gənclərin böyüyə hörməti, öz yerini, hərəkətini bilməli olduğunu görürük. Yəni, anlayırıq ki, hər kəsin yanında istədiyimiz kimi davrana bilmərik. Böyük-kiçik bilinməli, kişi-qadın məsafəsi qorunmalıdır. Burada gəlinin utanıb Allaha yalvarması ilə quş olması hər kəsi bir çox yöndən düşündürməlidir.

Tədris prosesində bir əfsanənin bir neçə variantını nəql etməklə də, uşaqların diqqətini cəlb etmək mümkündür. Bu, uşaqlarda dərin düşüncə yaradır, onların fikir

[2] https://az.wikisource.org/wiki/A%C4%9Fr%C4%B1da%C4%9F_%C9%99fsan%C9%99si

və təfəkkürləri daha da zənginləşir. Məsələn, ay və günəşlə bağlı iki ayrı-ayrı əfsanəyə diqqət yetirək:

*I variant:*

“Belə rəvayət edirlər ki, bir kişi ova çıxır. Əlinə bir şey düşmür. Axır gəlib kiçik bir gölün kənarına çıxır. Görür ki, gölün o tayında gözəl bir qız əyləşib gölə tamaşa edir. Qız o qədər gözəl imiş, şövqündən ovçu ona baxa bilmirmiş. Axır ovçu birtəhər ona yaxınlaşıb soruşur ki, sən kimsən? Qız cavab verir ki, mənim adım Günəşdir. Ovçu ilə Günəş bir az söhbət edirlər, axşamın qaranlığı ətrafı bürüyür. Ovçu Günəşə təklif edir ki, onlara qonaq getsin. Günəş razı olur. Onlar birlikdə ovçunun evinə gəlirlər. Ovçu qonağı böyük hörmətlə qarşılayır. Günəş ayrıca bir otaqda yatır. Sabah açılır, hamıdan qabaq qonaq durur. O, həyətə çıxan vaxt ətraf nura boyanır. Bu zaman ev yiyəsi də yuxudan oyanır. Günəşə baxanda gözləri qamaşır. Ovçu Günəşə yaxın gedə bilmir. Bu vaxt Günəş öz gözəlliyindən utanıb, yenidən otağa qayıdır. Ovçu öz qonağının gözəlliyi haqqında qonşulara danışır. Bildirir ki, ona yaxın düşmək çətindir. Qonşuluqda olan bir kişi deyir. Mən onu tuta bilərəm. Günəş yenə ovçunun evində qalır. Səhər ovçu və onun qonşusu Günəşi görmək və tutmaq üçün bayırda gözləyirmişlər. Günəş çölə çıxan kimi yenə aləm nura boyanır. Ovçunun qonşusu görür ki, doğrudan da ona yaxın düşmək mümkün deyil. Ondan süzülən işıq ox kimi adamın gözünə sancılır. Axırda qonşu təngə gəlib onu yayı-oxu ilə vurur. Bu ox Günəşi sinəsindən yaralayır. Günəş yaralı-yaralı qaçır. Günəş göyün üst qatına qalxır və öz donunu soyunur. Donundakı qan izləri qurşaq şəklində göyün üzündə yağışdan sonra görünür. Ovçu tutduğu işdən peşman olur və bir at minib onu axtarmağa gedir. Ancaq ona çata bilmir. Deyillər, həmin ovçu Ay imiş, qonaq isə aləmə nur saçan, dünyaya gözəllik verən, həyat verən Günəş imiş”.

*II variant:*

“Deyillər Ay və Günəş bacı qardaş imiş. Bir gün onların anaları yuxa bişirmək üçün hazırlıq görürmüş. Anası Ayı çağırır ki, get oxlovu gətir. Ay oxlovu gətirmir, deyir:

– Günəş gətirsin.

Günəşlə Ay bir-biri ilə savaşır. Bu zaman ana sacı külləyirmiş. Nə qədər təpinir ki, savaşmanı qurtarsınlar, ancaq onlar eşitmir. Ana acıqlı-acıqlı durur və Ayın üzünə bir sillə vurur. Günəş qorxusundan əsim-əsim əsir. Ay tutduğu işdən utanır. Hər ikisi evdən qaçırlar. Deyillər, Günəşin günahı olmadığı üçün o gündüz, Ay isə utandığından gecə gəzməyə çıxır. Ana isə vicdan əzabı çəkir və heç birinin üzünə diqqətlə baxa bilmir” [3, s.223-225].

Bu variantlılıq sanki daha çox tapmacaları xatırladır. Həm o janrı tədris edəndə, həm də bu janrı variantlı verməklə, uşaqları bir qədər çox düşündürmüş oluruq. Çünki variantlılıq olan janrlar uşaqların daha çox düşünməsinə səbəb olur. Əfsanənin məzmununa əsasən, onun tərbiyəvi əhəmiyyətli olmasını görürük. Uşaqlar edilən pisliyin nəticəsinin, etdiyin pis əməlin peşimançılığının ömür boyu sürməsini görür və nəticə çıxardırlar ki, həyatda elə işlər görməlisən ki, ondan heç bir zaman peşimançılıq çəkməyəsən.

Hər nümunə özlüyündə dərin mənaya, tərbiyəvi əhəmiyyətə malikdir. Əsas məsələ odur ki, bu əhəmiyyətli tərəfi ortaya çıxarıb düzgün şəkildə izahını verəsən. Ona görə də nümunələr hər zaman yerində deyilməlidir. Hər nümunəni istənilən zaman söyləməklə, müsbət nəticə əldə etmək çox çətindir. Yaxşı olar ki, əfsanələri tədris etməklə yanaşı, hər yaranan nümunənin gerçək yaranma səbəbi də izah edilsin. Yəni, həqiqətdə quşların, dağın, Günəş və Ayın yaranmasını elmi yolla izah etmək lazımdır. Daha sonra xalq dilində yayılanları söyləyib, uşaqlarda müəyyən fikir yaratmaqla da onların düşüncə diapazonunu və yaradıcı təfəkkürünü inkişaf etdirmək olar.

**Nəticə / Conclusion**

Məqalədə folklorun maraqlı janrlarından biri olan əfsanələrdən bir neçəsini nümunə kimi verib, onun uşaqların tərbiyəsində, mənəvi inkişafında əhəmiyyətini izah etməyə çalışdıq. Fikrimizcə, bu nümunələrlə əfsanələrin uşaqların həyatındakı rolunu araşdırıb müəyyən edə bildik. Bu janrın əsas müsbət cəhəti onun uşaqların marağına səbəb olmasındadır. Yəni uşaqlar yorulmadan, bezmədən, həvəslə, səbirlə əfsanələrə qulaq asır. Belə olduğu halda, əfsanələr vasitəsilə uşaqların dünyagörüşünün artırılmasında müsbət addımlar atılmış olur. Uşaqların marağına səbəb olduğu üçün bu janr vasitəsi ilə onlara bir çox tərbiyəvi əhəmiyyətli fikirləri, uşağın tərbiyəsi üçün önəmli olan nüansları çatdıra bilərik. Aparılan təhlillər bir daha göstərdi ki, uşaqların özlərinin müəyyən əfsanə və rəvayət yaratmaları onların təfəkkürünü inkişaf etdirir, yaradıcılıq qabliyyətlərini ortaya çıxardır. Bu da onu deməyə əsas verir ki, folklor janrlarının uşaqların mənəvi inkişafında rolu danılmazdır. Buna görə də folklor materiallarını uşaqlara sevdirməli və onları gələcək nəsillərə çatdırmaq üçün qorumalıyıq.

## İstifadə olunmuş ədəbiyyat / References

1. Azərbaycan folkloru antologiyası. (2005). IX kitab. 267 s.
2. Əliyev R. (2014). Azərbaycan şifahi xalq ədəbiyyatı. Bakı, 350 s.
3. Pirsultanlı S.P. (2009). Azərbaycan türklərinin əfsanələri. Bakı, Azərnəşr. 430 s.
4. Yaqubqızı M. (2013). Atalar sözləri. Bakı, Nurlan. 476 s.
5. https://az.wikisource.org/wiki/A%C4%9Fr%C4%B1da%C4%9F_%C9%99fsan%C9%99si
6. https://nihatatakishiyev.wordpress.com/2015/03/10/yaxsiliq-n%C9%99dir/

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 104–111
https://dx.doi.org/10.48445/TAIIJ.2021.90.46.010

**UŞAQ ƏDƏBİYYATI**

# Ali məktəblərdə uşaq ədəbiyyatı mövzusunda seçmə fənlərin tədrisində M.T.Sidqi irsindən istifadənin rolu

***Nurlana Əliyeva***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Naxçıvan Dövlət Universiteti. Azərbaycan.
E-mail: n.eliyeva@nu.edu.az
https://orcid.org/0000-0001-9698-5825

**XÜLASƏ**
Ali məktəblərin filoloji yöndəki fakültələrində tədris olunan fənlər içərisində uşaq ədəbiyyatının özünəməxsus yeri və rolu vardır. Hər bir xalqın ədəbiyyatı onun mənəvi ruhunun, mədəniyyətinin, varlığının göstəricilərindən biri və əsasıdır. Ədəbiyyat zaman-zaman Azərbaycan xalqının da çoxcəhətli mədəniyyəti və dünyagörüşünü əks etdirən mötəbər mənbələrindən biri olmuşdur. O, həm də, dövrün, cəmiyyətin güzgüsüdür. Xalqımızın tarixi dəyəri, dünya xalqları içərisində yeri, milli-mənəvi özəllikləri onun ədəbiyyatında əks olunaraq uzun və maraqlı inkişaf yolu keçmişdir. Həmin inkişaf prosesində qazandığı uğurlarla, özəl keyfiyyətlərlə Azərbaycan ədəbiyyatı Şərq, eləcə də dünya ədəbiyyatında öz izini buraxmış, özünəməxsus mövqeyə malik olmuşdur. Bu mənada uşaq ədəbiyyatı da unudulmamalıdır.

**AÇAR SÖZLƏR**
M.T.Sidqi, uşaq ədəbiyyatı, tədris, Naxçıvan ədəbi mühiti

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 19.01.2021
qəbul edilib: 17.02.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 104–111
https://dx.doi.org/10.48445/TAIIJ.2021.90.46.010

CHILDREN'S LITERATURE

# The role of the use of M.T. Sidgi's heritage in the teaching of elective subjects on children's literature in higher education

***Nurlana Aliyeva***
PhD in Philology, Associate Professor, Nakhchivan State University. Azerbaijan.
E-mail: n.eliyeva@nu.edu.az
https://orcid.org/0000-0001-9698-5825

**ABSTRACT**
Children's literature has a special place and role among the subjects taught in the philological faculties of universities. The literature of each nation is one of the indicators and the basis of its spiritual spirit, culture and existence. From time to time, literature has been one of the authoritative sources reflecting the multifaceted culture and worldview of the Azerbaijani people. Literature is also a mirror of the time and society. The historical value of our people, its place among the peoples of the world, its national and spiritual features have been reflected in its literature and have come a long and interesting way. With its successes and special qualities in the process of development, Azerbaijani literature has left its mark on the literature of the East, as well as the world, and has had a unique position. In this sense, children's literature should not be forgotten.

**KEYWORDS**
M.T.Sidgi, children's literature, teaching, Nakhchivan literary environment

**ARTICLE HISTORY**
Received: 19.01.2021
Accepted: 17.02.2021

## Giriş / Introduction

Bütün tarixi zamanlarda uşaqların tərbiyə olunma işi diqqət mərkəzində dayanan məsələlərdən biri olmuşdur. Uşaq ədəbiyyatı bu tərbiyənin əsas vasitəçisi kimi uşaqların dünyagörüşlərini dolğunlaşdıran, onların estetik-ədəbi zövqlərini formalaşdırıb inkişaf etdirən əvəzsiz mənbələrdəndir. Bu da məlumdur ki, uşağın hiss və duyğuları, mənəvi baxımdan inkişafı, düşüncə dərəcəsi, nitq mədəniyyəti və s. durğun vəziyyətdə qalmır, zaman keçdikcə inkişaf edib dəyişir. Bütün uşaqların dərketmə qabiliyyəti eyni deyil. Bu məsələləri nəzərə alaraq qeyd edək ki, uşaq əsərlərinin yaranması kimi onun tədrisi məsələləri də xüsusi məsuliyyət tələb edir.

Ümumşərq ədəbi-bədii mühitin uğurlarında öz payı olan, zəngin və qədim ənənələrə, məzmun və ideya-məna tutumuna malik olan, mənsub olduğu xalqın ədəbi-bədii təfəkkürünü əks etdirən Azərbaycan uşaq ədəbiyyatı örnəklərinin bir hissəsi Naxçıvan ədəbi mühitində yaranmışdır. Milli zəmində yaranmış zəngin irsə dayanan bu mühitlə bağlı olan ədəbi-bədii əsərlər ənənəvi ədəbiyyatımızın xüsusiyyətlərinin inkişafında müəyyən rol oynamış, onun maraqlı, bütün zamanlar üçün aktual hesab edilən örnəklərinin zənginləşməsinə öz töhfəsini vermişdir. Naxçıvanda yaranan uşaq ədəbiyyatı Azərbaycan uşaq ədəbiyyatının əsas qütbünü təşkil edir. Bu ədəbi örnəklərdə söz sənətinin incəliklərinə bələd olan Azərbaycan pedaqoji fikrinin görkəmli nümayəndəsi, Azərbaycanda ilk “Pedaqogika” dərsliyinin müəllifi, məşhur müdərris, Ordubadda “Əxtər”, Naxçıvanda “Tərbiyət” məktəblərinin çox dəyərli müəllimi, şair, nasir Məhəmməd Tağı Sidqinin də özünəxas mövqeyi vardır.

Naxçıvanda yaşayıb yaradan yazıçıların yaradıcılığı Azərbaycan uşaq ədəbiyyatının mühüm bir hissəsini səciyyələndirəcək dərəcədə yetərli olan bir mənbə kimi diqqət çəkir. Etiraf etmək lazımdır ki, tarixin müxtəlif mərhələlərində çətin və məsuliyyətli bir prosesə qoşulan həmin sənətkarların yaradıcılığı ümumi şəkildə Azərbaycan ədəbiyyatını tamamlayaraq zənginləşdirir. Bu mənada, uşaq ədəbiyyatının tədrisində bu ədəbiyyatın müəlliflərindən biri kimi tanınan Naxçıvan ədəbi mühitinin yetirməsi Məhəmməd Tağı Sidqinin irsindən faydalanmaq yerinə düşər. Xüsusilə də uşaq ədəbiyyatı mövzusunda seçmə fənlərin tədrisi zamanı bu qaynaq maraqlı materiallar verə bilir.

Uşaq ədəbiyyatı, doğrudan da, mühüm əhəmiyyətə malikdir. Onun dəyərinin əsasını məktəb, təlim-tərbiyə, yeni nəslin ədəbi zövqünün formalaşması təşkil edir. Gələcəkdə böyük həcmli və dərin ideyalı əsərləri anlamaq üçün, sözsüz ki, uşaqların müxtəlif ədəbi örnəklərlə maarifləndirilməsi, onların ədəbi-estetik zövqünün

formalaşdırılması vacib məsələlərdəndir. Məhəmməd Tağı Sidqinin uşaqları yaxşı tanıması, onların arzu və düşüncələrini, yaş səviyyələrini bilməsi maraqlı uşaq əsərlərinin yaranmasına zəmin yaratmışdır. Bundan başqa, Məhəmməd Tağı Sidqi uşaq oxusu üçün də tədris materialı hazırlamışdır.

Uşaq ədəbiyyatının tədrisinə onun yaranma mövzusu ilə bağlı məsələlərdən başlamaq lazımdır. Bu mənada, Azərbaycanda əsası şifahi xalq incilərinə söykənən uşaq ədəbiyyatının elm kimi yaranmasının XIX yüzilliyə aid edilməsinin həmin tarixi zamanda xalqımızın həyatında təhsil və mədəniyyət sahəsində nəzərə çarpacaq dərəcədə inkişafla bağlı olması haqqında məlumatlara müəyyən qədər yer verilməlidir. Sözsüz ki, bu prosesdə mətbuat orqanlarının, bir sıra xeyriyyə təşkilatlarının, kitabxanaların, təhsil ocaqlarının rolunu unutmaq olmaz. Ona görə də öyrətmə prosesində bu məsələyə də diqqət yönəltmək vacibdir. Ümumiyyətlə, uşaqların təlimi uşaq ədəbiyyatının formalaşmasında əsas hesab edilir. Maraqlıdır ki, ədəbiyyatın tədrisi də bir elm kimi XIX əsrə aid edilir. "Ədəbiyyatın tədrisi metodikasının bir elm kimi formalaşması, əsasən, XIX əsrlə bağlıdır. Lakin Azərbaycan ədəbiyyatının özü kimi, onun tədrisi tarixi də qədimdir. Ədəbiyyatın tədrisi metodikasının bir elm kimi formalaşmasına təsir göstərən ilk müəllim xalq olmuşdur. Qədim dövrlərdə zəngin və rəngarəng Azərbaycan folkloru valideynlər tərəfindən şifahi yolla tədris edilmiş, bu işdə onlar bəlkə də ilk müəllimlər olmuşlar. Analar laylalarla körpələrini yatırmış, bayatı və nəğmələri onlara təlqin etmiş, mənəvi qida vermişlər" [2, s.3]. Buradan belə nəticə çıxır ki, ədəbiyyatın tədrisi məhz uşaq ədəbiyyatının öyrədilməsindən başlamışdır.

Uşaq ədəbiyyatı örnəklərinin, ilkin olaraq, yeni üsula önəm verən məktəblərə aid dərsliklərdə öz əksini tapması qeyd olunmalıdır. Məlumdur ki, Azərbaycan ədəbiyyatının çox maraqlı, önəmli və aktual bir istiqaməti olan uşaq ədəbiyyatının tarixi, ümumiyyətlə, Azərbaycan ədəbiyyatının tarixi qədər qədim deyildir. Araşdırmalar göstərir ki, bu ədəbiyyatın əsas örnəkləri, xüsusi ilə yazılı ədəbiyyatın özül örnəkləri XIX yüzillikdə meydana çıxmışdır. Lakin peşəkar uşaq ədəbiyyatının yaranması XX yüzilin əvvəlinə aid edilir. Məlumdur ki, XX yüzilin əvvəlində yeni məzmun və ideyaya malik dərsliklərin yazılması əsas məsələlərdən biri kimi qarşıya qoyulmuşdur. Bu sahədə mətbuatın da xidməti danılmaz idi. Təsadüfi deyildir ki, dövrün mətbuatı haqqında "buluddan sıyrılıb çıxan ulduzlar" kimi bənzətmə məşhurlaşmışdır. Uşaq ədəbiyyatının tədrisində aşağıdakı materiallar əsas yer tutur:

1. Azərbaycanlı müəlliflərin uşaq mövzusunda yazdığı əsərlər;
2. Uşaq ədəbiyyatı mövzusunda tərcümə əsərləri.

XX yüzilin əvvəlində qeyd olunan yuxarıdakı mənbələrdən tarix, coğrafiya, astronomiya, əxlaq, etik qaydalar və s. haqqında təlim-tərbiyənin vəhdətini əsaslandıran, dövrü üçün ən mükəmməl materiallar seçilib dərsliklərə salınırdı. Həmin dövrdə yazılan nəsihətamiz mənzum hekayələr, didaktik məzmunlu şeirlər, məktəb şərqiləri, təmsillər uşaq ədəbiyyatını zənginləşdirməyə xidmət edirdi.

Uşaq ədəbiyyatına xas olan bir sıra nümunələr Naxçıvan ədəbi mühitində yaranmışdır ki, bu mühit mövzu ilə əlaqəli maraqlı və orijinal qaynaqlardan biri hesab edilir.

Naxçıvan ədəbi mühitinə xas olan yazarların yaradıcılığında uşaq ədəbiyyatı üçün zəngin material verən faktların tədris mövzularına salınması, bir tərəfdən, ümumazərbaycan uşaq ədəbiyyatı ilə bağlı problemlərin üzə çıxması üçün yararlıdırsa, digər tərəfdən, indiyə qədər sosializm prinsipləri baxımından yanaşılan və ya diqqətdən yayınıb layiqli qiymətini almayan, halbuki uşaq ədəbiyyatı kimi möhtəşəm bir sahənin formalaşıb təşəkkül tapmasında müəyyən rolu olan sənətkarlara, o cümlədən Məhəmməd Tağı Sidqinin uşaq ədəbiyyatının tədrisindəki fəaliyyətinə bugünkü prizmadan yanaşmaq, tarixi şəxsiyyətlərin yazdıqlarını çağdaş müstəviyə gətirmək baxımından da əhəmiyyətlidir.

1892-ci ildə Ordubadda "Əxtər" məktəbi açılmış və Məhəmməd Tağı Sidqi onun ilk müəllimlərindən olmuşdur. Ədibin həyatında məktəbdarlıq işi əsas mərhələ təşkil edir. O dövrün ziyalıları məktəbi millətin nicat yollarından biri kimi dəyərləndirirdilər. Mətbuatda məktəb haqqında yüksək fikirlər formalaşaraq inkişaf etdirilirdi. Təsadüfi deyildir ki, "Kəşkül" qəzeti məktəbi "insan fabrikası" adlandırırdı: "Məktəb və təlimxana demək, bir növ, "insan fabrikası" deməkdir ki, onun bir qapısından daxil olan nadan uşaq o biri qapısından kamil bir insan olaraq çıxır" [4, s.14].

Məhəmməd Tağı Sidqinin uşaq ədəbiyyatı örnəklərindən olan "Elmin şərafəti", "Məktəbdə", "Dərsə diqqət", "Nümuneyi-əxlaq", "Nəsihətnamə" və s. əsərləri xüsusi ilə maraq doğurur. Həmin əsərlərdə Məhəmməd Tağı Sidqinin ifadəsi ilə deyilsə, "xırdaca" uşaqlara nəsihət, məsləhət xarakterli sözlərlə tərbiyə verilir, onların elmə, biliyə, məktəbə marağı artırılır. Bu baxımdan, M.T.Sidqinin "Elmin şərafəti" əsəri diqqət çəkir:

Bu indiki vəqt bir zamandır,
Elm əsridi, elm fərzi-candır,
Bielm olanın işi yamandır,
Var elmdə, hər nə var, qızlar
[3, s.20].

Tədris prosesində əsərin öyrədilməsi zamanı çağdaş dövrümüzdə elmin inkişafı məsələlərinə də toxunmaq faydalı olar.

Məhəmməd Tağı Sidqi elmlərə yiyələnməklə yanaşı, dünyanın ən mütərəqqi dini olan İslamın ideya-mənəvi kitabı "Quran"ın öyrənilməsini də vacib hesab edirdi:

"Quran" dilinizdə əzbər olsun,
Hikmət sizə zibi-zivər olsun,
Elmilə gözüz münəvvər olsun,
Zülmətdən olun kənar, qızlar
[3, s.20].

Bu əsər müasir dövrümüzlə də səsləşir. Belə ki, sovet dövründə ədəbi əsərlərdə heç bir mövqeyi olmayan dini mövzular hazırkı dərsliklərdə də müəyyən qədər yer tutur. Bundan başqa, dindən irəli gələn tərbiyə məsələlərindən bəhs edərkən, bayrağımızdakı yaşıl rəngin dinlə bağlılığından da danışmaq yerinə düşər. Belə ki, yaşıl rəngin müsəlmanlıq rəmzi olması bir daha yada salınmalıdır.

Məhəmməd Tağı Sidqi uşaq ədəbiyyatı mövzusunda yazdığı əsərlərində uşaqlara elmin zülmətə qalib gələrək onu yox etməsinə, insanın qəlbini işıqlandırmasına, gözünü dünyaya açmasına inandırır. O zaman – qızların kütləvi şəkildə təhsilinin olmadığı zamanda bu məqsədlə məktəb açan və qızların savada yiyələnməsini zəruri hesab edən şair elmi, biliyi onların mənəvi bəzəyi kimi dəyərləndirirdi:

Hər qız ki ülumə etsə rəğbət,
Axırda yəqin tapar səadət,
Yox elmdən özgə bir şərafət,
Elm ilədir iftixar, qızlar
[3, s.20].

Bu əsərdəki "indi elm zamanıdır", "elmsiz insanın işi yamandır", "hər nə varsa, elmdə var", "insan elmlə zülmətdən kənar olar", "insan elmlə səadət tapar", "elmdən yüksək şərafət yoxdur", "iftixar elm ilədir" fikirləri ilə Məhəmməd Tağı Sidqi uşaqların mənəvi baxımdan inkişaf və zənginləşməsində əhəmiyyətli rol oynamışdır.

M.T.Sidqinin uşaq ədəbiyyatı irsi tədris olunarkən onun oğluna yazdığı "Məhəmmədəliyə nəsihət" əsəri də unudulmamalıdır. Müəllif övladına müraciət edərək bütün vətən övladlarına ürəyindən keçən xoş arzularını bildirir. Həmin

müraciətdə də elmə, ədəb və tərbiyəyə, dərsə düzgün münasibət formalaşdırılır, uşaqları vaxtlarını boş keçirməməyə, ondan səmərəli istifadə edərək yazıb-oxumaqla məşğul olmağa çağırır:

Yetişibdir zamani-elmü ədəb,
Mənzilin eylə guşeyi-məktəb.
Dəmbədəm məktəb ilə ol dəmsaz,
Qış, həm yaz həm oxu, həm yaz
[3, s.21].

Məhəmməd Tağı Sidqi "Məhəmmədəliyə nəsihət" əsərində elmin bütün dünyanı abad etməsindən, onun insanı cəhalətdən qurtaran ən dəyərli bir vasitə olmasından danışaraq uşaqların bu istiqamətdə çalışmasını arzulayır:

Dinü dünyanı elm edir abad,
Özünü eylə cəhldən azad.
Ruzigarın keçirmə qəflətlə,
Elm təhsil elə diqqətlə
[3, s.21].

Əsərdəki əsas ideya budur: "Dini də, dünyanı da abad edən elmdir", "elm insanı cəhalətdən azad edir". Tədris prosesində diqqəti bu ideyalara çəkmək məqsədəuyğun hesab edilir.

Nasir Naxçıvanda yeni tipli məktəbin formalaşması naminə gərgin çalışdığı kimi, o zaman məktəb üçün zəruri olan dərslik və dərs vəsaitlərinin, tədris üçün mətnlərin hazırlanması prosesinə də diqqət edirdi. Onun əsərləri əməksevərliyin, zəhmətkeşliyin təbliğində böyük əhəmiyyətə malikdir. Şair əsərlərində uşaqların ustadlarını da unutmamasını, onlara ehtiramla yanaşmasını tərbiyə edir, məktəblilərin təlim-tərbiyəsində müəllimlərin rolunu qiymətləndirir. O, "Məktəbdə" adlı şerində məktəbin bir xoşbəxtlik ocağı olduğunu, insaniyyətin ən mühüm əlamətlərinin məktəbdən başlandığını göstərir.

Əsərləri ilə uşaqların şüurunda vətəndaşlıq və vətənpərvərlik hissi oyadan, gənc nəslin gələcəyinin elm, mərifət və tərbiyə ilə bağlılığını düşünən M.T.Sidqinin uşaq ədəbiyyatı mövzusundakı əsərləri öyrədilərkən onun məktəbin, elmin əhəmiyyətindən bəhs etməsi xüsusi olaraq vurğulanmalıdır. Maarifpərvər şairin uşaq əsərləri Azərbaycanda yeni üsullu məktəblərin fəaliyyəti dövründə yazılmışdır. Onun bu

əsərləri müəllifinin pedaqoji fikirləri ilə yaradıcılığının bir-birini tamamlamasını göstərir.

Məhəmməd Tağı Sidqinin yaradıcılığında elm, məktəb və tərbiyə mövzusu qabarıq şəkildə əks olunur. Bədii əsərlərində həmin mövzudakı fikirlər fəlsəfi xarakter daşıyır. Ədibin pedaqoq olması bədii əsərlərinin mövzu-ideya istiqamətinə mühüm təsir göstərmişdir. "Maarifçi şair və yazıçı olmaqla yanaşı, M.T.Sidqi həm də tanınmış alim-pedaqoq, əxlaq nəzəriyyəçisi və görkəmli məktəbşünasdır" [1, s.14]. Onun əsərlərinin əsas ideyasını təlim-tərbiyə məsələlərində əsas yer tutan xüsusiyyətlərin təbliği təşkil edir.

## Nəticə / Conclusion

Məhəmməd Tağı Sidqinin maarifçi-realist ədəbiyyatın yaranmasında iştirakı və əsl xalq müəllimi kimi fəaliyyəti Azərbaycanın təhsil tarixində parlaq səhifələrdəndir. Onun yaradıcılığında uşaqlar üçün çox sayda mövzular əks olunsa da, məktəb, təhsil və elmə çağırış əsas yerdə dayanır.

Beləliklə, maarifçi şairin nəzm əsərləri təsdiq edir ki, XIX yüzilin sonu, XX yüzilin əvvəlində uşaq poeziyası maarifçi şeirə daha çox yer verən ədəbi qaynaq kimi maraqlıdır və bu mənbənin tədrisi böyük tərbiyəvi əhəmiyyətə malikdir.

## İstifadə edilmiş ədəbiyyat / References

1. Abdullayev A.S. (1966). Azərbaycan dilinin tədrisi tarixindən. Bakı, Maarif. 330 s.
2. Qafarova S., Gərayzadə E. (2010). Azərbaycan ədəbiyyatının tədrisi tarixi (dərs vəsaiti). Bakı, Mütərcim. 136 s.
3. Sidqi M.T. (2004). Əsərləri (toplayanı, tərtib edəni və müqəddimənin müəllifi İ.Ə.Həbibbəyli). Bakı, Çaşıoğlu. 279 s.
4. Tağıyev Ə. (1993). Azərbaycanda məktəb tarixi. Bakı, Maarif. 113 s.
5. Aslanov V. (2002). Azərbaycan dilinin tarixinə dair tədqiqlər. I cild. Bakı, 152 s.
6. https://naxcivanxeberleri.com/cemiyyet/31148-mhmmd-tagi-sidqi yaradicilig-inda-maarifcilik-ideyalarinin-tbligi.html

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 112–122
https://dx.doi.org/10.48445/TAIIJ.2021.10.76.011

**UŞAQ ƏDƏBİYYATI**

# Qədim dövr Azərbaycan ədəbiyyatında uşaq mütaliəsi nümunələri (N.Gəncəvinin “Xəmsə”si əsasında)

***Pərixanım Soltanqızı (Hüseynova)***
Filologiya üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Dövlət Pedaqoji Universiteti. Azərbaycan.
E-mail: huseynovaperixanim1962@gmail.com
https://orcid.org/0000-0001-9391-6162

**XÜLASƏ**
Məqalədə N.Gəncəvinin yaradıcılığı əsasında qədim dövr Azərbaycan ədəbiyyatında uşaq mütaliəsi nümunələri araşdırılır. Tədqiqatın əsas obyekti şairin “Xəmsə”sidir. Burada “Yaralı bir uşağın dastanı”, “Ağlın gözü işıqlanmış qəlb evinin çırağından”, “Sultan Səncər və qarı”, “Oğlum Məhəmmədə nəsihət” (“Sirlər xəzinəsi”), “Bəhramın qoca çobanın evinə yetişməsi” (“Yeddi gözəl”), “Qibtli Mariyanın hekayəsi” (“İskəndərnamə”) və s. hekayələr uşaq mütaliəsi nümunələri kimi tədqiq olunur. Ağıl, bacarıq, fərasət, ədalət, əməyə və vətənə məhəbbət, dövlətçilik, xeyirin şər üzərində qələbəsi və s. motivlər elmi təhlilə cəlb edilir. Tədqiq olunan uşaq mütaliəsi nümunələrinin yeniyetmə və gənclərin mənəvi-əxlaqi tərbiyəsində rolu araşdırılır. Elmi polemika aparılır. Müəllifin elmi qənaətləri və mülahizələri ədəbi sitatlar üzərində təhlil edilir.

**AÇAR SÖZLƏR**
poetika, “Xəmsə”, ağıl, bacarıq, elm, humanizm, obraz, bədiilik

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 16.11.2020
qəbul edilib: 13.01.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 112–122
https://dx.doi.org/10.48445/TAIIJ.2021.10.76.011

CHILDREN'S LITERATURE

# The examples of children's reading in ancient period of Azerbaijan literature (On the base of "Khamsa" by N.Ganjavi)

***Parikhanim Soltangizi (Huseynova)***
PhD in Philology, Associate Professor, Azerbaijan State Pedagogical University. Azerbaijan.
E-mail: huseynovaperixanim1962@gmail.com
https://orcid.org/0000-0001-9391-6162

**ABSTRACT**
In this article the examples of children's reading are researched of ancient time of Azerbaijan literature on the base of creation of N.Ganjavi. The main object of investigation is the poet's "Khamsa". In here the stories "Yarali bir ushaghin dastani", "Aghlin gozu ishiglanmish qelb evinin chiraghindan", "Sultan senjer ve Kari", "Oghlum Mahammade nasihet" (Sirler khezinesi – the Treasury of mysteries), "Behramin qoca chobanin evine yetishmesi" (Yeddi Gozel – Seven Beauties), "Gibtli Mariyanin hekayesi" (İskendername) are investigated as a children's reading. Cleverness, honesty, love to the labour and land, governmentality, the victory and etc motives have been analyzed scientifically. The role of the examples of children's reading are researched in the moral bringing-up of the adolescents and young people. It has been carried out scientifical polimics. The scientific research of the author are carried literary examples.

**KEYWORDS**
poetics, "Khamsa", cleverness, ability, science, humanism, artistical, image

**ARTICLE HISTORY**
Received: 16.11.2020
Accepted: 13.01.2021

**Giriş / Introduction**

Nizami Gəncəvi özünəqədərki Şərq, eləcə də Yunan elm və mədəniyyətini yaradıcı şəkildə öyrənərək mənimsədi. Öz novatorluğu sayəsində lirik və epik şeirə yeni istiqamət verdi. Sənətin ağıl və zəhmətlə vəhdətini tərənnüm etdi. Nizami yaradıcılığı humanizmliyi ilə seçildi. Onun "Xəmsə"sinin təsiri ilə bir çox qələm sahiblərinin "Xəmsə"ləri yarandı. Əmir Xosrov Dəhləvi, Hafiz, Arif Ərdəbilli, Əssar Təbrizi, Məhəmməd Füzuli kimi sənətkarlar Nizami yolunu davam etdirdilər.

Nizami Gəncəvinin "Xəmsə"sində təlim-tərbiyə məsələləri, insanın yüksəlişi, kamilliyi, dövlətçilik ənənələri, vətənə, əməyə məhəbbət, xeyirxahlıq kimi motivlər mühüm yer tutur. Bu amillər nəinki böyüklərin, habelə uşaqların, yeniyetmə və gənclərin tərbiyəsində də təsiredici rol oynayır. Dahi şairin "Sultan Səncər və qarı", "Kərpickəsən kişinin dastanı", "Zalım padşahla Zahidin dastanı", "Nuşirəvan və bayquşların söhbəti", "Süleyman və əkinçi", "Oğlum Məhəmmədə nəsihət", "Ağlın gözü işıqlanmış qəlb evinin çırağında", "Bəhramın qoca çobanın evinə yetişməsi", "İki filosofun dastanı", "Qibtli Mariyanın hekayəsi", "Payız yetişdi", "Sözün tərifi" və digər mənzum hekayə və şeirləri qədim dövr Azərbaycan ədəbiyyatında uşaq mütaliəsinə aid olan ən gözəl nümunələrdir.

"Ağlın gözü işıqlanmış qəlb evinin çırağından" qəsidəsində insanın əməklə ucalması, elm, bilik qazanmağın ancaq zəhmət hesabına mümkünlüyü tərənnüm olunur.

Qəsidənin məzmunu belədir: İnsanın yüksəlişi əməklə bağlıdır. Var-dövlət uğrunda vuruşmaq, məhz bundan ötrü şahmara dönüb xəzinənin üstündə ilan kimi qıvrılaraq yatmağın mənası yoxdur. Əgər işinlə, zəkanla zülmətlərə yol açsan, əməlinlə tarixlərdə, yaddaşlarda yaşayacaqsan. Aləmin şahı olub ucalmaq istəyirsənsə, gecələr ay kimi ayıq ol ki, bütün sirlər sənə əyan olsun.

Əgər xəznə ilanısan, halqa olma qapıda sən?
Viranlıqdır xəznələrin şahmarına əsil məskən.
Səhv elədim, ilan olma, lap cənnətin ilanı da,
Ki, haqqında pis söz yazıb, verməsinlər səni bada.
Gecə aytək oyaq ol ki, sirlər əyan olsun sənə,
Əgər aləm görən aysan, ya da şahsan bu aləmə.
Əgər cənnət istəyirsən, özün parla gövhər kimi,
Gecələri işıqlandır öz nurunla qəmər kimi
[1, s.35].

"Yaralı bir uşağın dastanı" ("Sirlər xəzinəsi") şeirində şair ağlın, kamalın, uzaqgörənliyin nəticəsinin xeyirli işlə tamamlandığını bədii lövhələrlə canlandırır. Həmyaşıdları ilə gəzməyə çıxan uşaqlardan biri sürüşüb yıxılır və ayağı sınır. Yoldaşları bu bəladan xilas olmaq üçün çarə axtarırlar. Uşağın biri – onu özünə dost biləni bu iş üçün atasının yanında xəcalətli qalmamaq məqsədilə uşağı quyunun lap dibində gizlətməyi təklif edir. Lakin bu uşağın düşməni olan digər bir uşaq öz ağlı, fərasəti, uzaqgörənliyi ilə yoldaşlarına qalib gəlir. Düşünür: "Bu sirr gizlində qalmaz, mən ki həmin uşağın bir düşməniyəm – demək, bu işi eşidənlər, yəqin ki, məndən biləcək". Yoldaşlarından gizlin uşağın atasını bu işdən xəbərdar etməklə həm düşməninin həyatını xilas edir, həm yoldaşlarını düşdükləri vəziyyətdən qurtarır, həm də özünü yarana biləcək şübhələrdən azad edir. Düşmən uşaq haqlı idimi? Əlbəttə. Əgər dostunun təklifi ilə uşaqlar razılaşsaydılar, ayağı qırılan uşaq quyunun dibində həyatı ilə vidalaşmalı olacaqdı. Çünki ayağı sındığından quyudan çıxa bilməyəcəkdi. Onun haray dolu fəryadını da eşidən olmayacaqdı. Ağıl, fərasət insanın gövhəridir. Bu amillər insanı ucaldar, onu qaranlıqlarda işıqlandırar. Şair gənclərə nəsihət edir: "Hər kəsin ağlı, bacarığı, fərasəti olarsa, fələyin min bir oyunundan baş açar, ona qalib gələr, əks halda, fələyin girdabına qurban gedər".

"Leyli və Məcnun" poemasında yer alan "Oğlum Məhəmmədə nəsihət" şeirində şair göstərir ki, elm, ağıl, səbir, hünər insanların bir-birinə zəncirvari bağı, uğurlu gələcəyidir. Elmin xəzinəsinə bələd olan kəs dünyanın işlərindən arif olar. Çətinliklərlə üzləşən zaman kədərlənmə, nəticə əldə etməyə tələsmə, "ciyər yırtsa da qəmin peykanı, bunun üçün yaranmış səbrin qalxanı. Nə qır, yaxşı dürrü, nə boş yerə saç". Şair oğluna əsli olanı özünə dost seçməyi məsləhət görür. Burada Nizami xalqın hikmət xəzinəsinə üz tutur:

Zatı pis uzatsa yaxşılıq əli,
"İtirməz əslini kimsə" məsəli.
Yadından çıxmasın, görsən bədgövhər
Əqrəbi öldür ki, yetirər zərər
[1, s.312].

Şair nadan dostla heç bir xeyirli iş alınmadığını, gələcək bəlalardan qorunmaq üçün belələrindən uzaq durmağın faydalı olduğunu göstərir, elm, bilik öyrənməyi təlqin edir: "Elm öyrənməkdən heç vaxt utanma, kim ki, elm öyrənməyi heç zaman özünə ar bilməz, sudan dürr, daşdan da gövhər çıxardar. Öyrənməyi ar bilən həyatda heç nə əldə edə bilməz". Məhəmmədə həyatda comərd, xeyirxah, alicənab olmağı,

yaxşı işlər ilə xalqına xeyir verməyi tövsiyə edir. Oğluna Məhəmməd peyğəmbərin adını daşımasını unutmamağı, bu adı şərəflə daşımağı nəsihət edərək deyir:

Adın xoş gülüdür əbədiyyətin,
Məhəmməd isminin möhürüsən mətin.
Adına yaxşılıq sikkəsini çal,
Böyük şöhrət qazan, göylərə ucal
[1, s.311].

“Sultan Səncər və qarı” hekayəsində qoca bir qarı Sultan Səncərin yaxasından tutaraq, onun ədalətsizliyini, etdiyi zülmləri qorxmadan üzünə söyləyir. Sultan Səncərin zalım, qəddar şah olduğunu, dövlətində rüşvətxorluğun, özbaşınalığın baş alıb getdiyini, yetimlərin, ağ saçlarına hörmət olunmayan əlsiz-ayaqsız qocaların çörəyinin əlindən alındığını, onları evsiz-eşiksiz qoyduğunu bir-bir anladır. Hətta kefli bir darğanın sərxoş halda onu təpikləri altında əzməsini, qatili ondan xəbər almasını deyərək, Sultan Səncəri ədalətə, düzlüyə çağırır:

Ey şah! Dada çatmasan, olurkən qəlbim kabab,
Qiyamətin günündə çəkilər səndən hesab.
Ah, səndə nə ədalət, nə mərhəmət görürəm?
Mən səndə sonsuz zülm və əziyyət görürəm.
Rəiyyətə hər zaman kömək etməli padşah,
Səndən xarlıqdır gələn, bizə ol bundan agah
[1, s.58].

Qarı ona xatırladır ki, özü Allahın qulu ola-ola, Allahın qullarına zülm edir. Buna görə axirət dünyasında ondan haqq-hesab istəyəcəklər. Bununla şair demək istəyir ki, Allahın qulu istər şah olsun, istər nökər, bir gün hər kəs bu dünyadan köçəcək, yalnız onun xoş əməlləri, xeyirxah işləri qalacaq. Bununla da o, insanları yaxşı işlər görməyə, xeyirxah olmağa çağırır.

Sultan Səncər qarının sözlərindən nəticə çıxartmır. Ölkəsində baş alıb gedən zülm və ədalətsizliyin qarşısını almaq əvəzinə, onu daha da şiddətləndirir. Əməllərinə görə o, cəzasız qalmır.

Xorasanı alandan sonra o, Sultan Səncər,
Bu sözü asan bilib çəkdi çox böyük zərər.

Bu misralarda böyük Nizami Sultan Səncərin Xorasanı əldən verdikdən sonra Qaraxana əsir düşdüyü tarixi hadisəni xatırladır.

"Zalım padşahla Zahidin dastanı"nda isə padşah Zahidin sözlərindən ibrət götürərək dəyişir və ədalətli şaha çevrilir. Boynuna kəfən salıb hüzuruna gələrək, onun eyiblərini üzünə söyləyən qocanın kəfəninin onun boynundan çıxarılmasını əmr edir:

Çıxarın onun kəfənini boynundan,
Ətirli xələt verin, qoy sevinsin bu insan.
Əl çəkib zalımlıqdan o bir adil şah oldu,
Rəiyyətini sevib, dərdindən agah oldu.

"İki filosofun dastanı"nda mənəm-mənəmlik iddiasında olan bir mülkə iki ortaq həkimin arasındakı kəskin ədavəti bədii lövhələrlə canlandırır:

Mənlik olan yerdə sənlik şam yanmadı,
Birdir iki olsa haqq kimsə onu dinləməz.
Bir bədəndə iki baş yaramaz, birini kəs!
Bir qında iki qılınc qərar tutub durarmı?
Məclisdə iki Cəmşid bir taxta oturarmı?
İki tamahkar ağıl, hey güc verdi sözünə
[3, s.64-56].

Söhbət kəskinləşir, ortada ədavət qızışır. Oturduqları evi satışa çıxardırlar. Bu da baş tutmayanda hiyləgərliyə əl atırlar. Qərara gəlirlər ki, bir qabda şərbət hazırlayıb içsinlər. Kim elmlidir, bacarıqlıdır, qalib odur. Birinci iddiaçı şərbətə zəhər qatıb məslək yoldaşına verib deyir: "Canpərvər şərabdır, al! Zəhər deyil, şərabdır, al, iç. Məndən razı qal". Cavabdeh şərbətdəki zəhəri ayırd etsə də, halını pozmadan onu şəkər kimi qəbul edir. Çünki o, nuskiya otunu qaynadıb öncədən içmiş, zəhər deyən yeri tiryəkləmişdi. Tiryək zəhərin təsirini bir anda məhv edir. Yanan pərvanə yenidən qanadlanır. Yolüstü bağçadan bir gül üzüb, ofsun oxuyur. Zəhərdən daha güclü, daha təsirli ofsunlu gülü rəqibi əlinə alan kimi qorxudan bağrı yarılıb, həyatı ilə vidalaşır.

Nizami poetikləşdirdiyi bu dastanda folklor motivlərindən qaynaqlanmışdı. Daha çox nağıllarda, dastanlarda işlənən hiyləgərlik, paxıllıq, çəkişmə, nadanlıq, ağıl, fərasət, xeyir və şər qüvvələr burada öz əksini tapır. Sonda ağıl və fərasət şərə qalib gəlir.

"Xosrov və Şirin" poeması məhəbbət mövzusunda yazılsa da, burada eşqin təsiri ilə insanın tərbiyələnməsi, dəyişməsi, kamilləşməsi əsərin əsas ideyasını təşkil edir. Şairin də burada əsas məqsədi, insanı pis əməllərdən çəkindirib ədalətli, xeyirxah insana çevirməkdir. Poemada Xosrovun Şirinə olan məhəbbətinin təsiri nəticəsində dəyişməsi təsvir olunur. Xosrovun dəyişməsi oxucunun da tərbiyəsində öz müsbət rolunu oynayır, ona insani keyfiyyətlər aşılayır. İnsanın ucalığı, eşqin və əməyin qalibiyyəti yeniyetmə və gənclərin mənəvi-əxlaqi tərbiyəsində mühüm rol oynayır. Bununla yanaşı, Zahid Xəlilin, Füzuli Əsgərlinin qeyd etdikləri kimi, "Xosrov və Şirin" məhəbbət dastanı olsa da, buradakı bəzi məqamlar uşaqların mənəvi tərbiyəsində əsas rol oynaya bilir. Şair bu əsərində də alleqoriyadan məharətlə istifadə edərək, bitkiləri insan kimi danışdırmış, uşaqlara da maraqlı təsir bağışlayan gözəl təbiət mənzərələri, bu mənzərələrlə uyarlılıq təşkil edən hadisə və əhvalatları sənətkarlıqla qələmə almışdır" [5, s.52].

N.Gəncəvi "Leyli və Məcnun" poemasında öz eşqi ilə dünyaya səs salan azad məhəbbətin, insan azadlığının tərənnümçüsü olan gənc məktəbli obrazlarını yaratmışdır. Elə bir obraz ki, bütün dini ehkamlara və feodal qayda-qanunlara meydan oxuyaraq, onları dağıtdı və bütün bəşəriyyətə sübut etdi ki, eşq nəinki bütün dini ehkamlardan, hətta qayda-qanunlardan da ucadır. Elm, əql, iradə, səbr də həqiqi eşq qarşısında acizdir. Gənc məktəbli Leyli də aşiqindən geri qalmadı, axıtdığı göz yaşları ilə təmsil etdiyi qadın hüquqsuzluğuna qarşı üsyan etdi. Doğru yolda olduğunu ölümü ilə sübut etdi. 14-15 yaşlı bu məktəbli gənclər – oğlan və qız, Şərq ədəbiyyatında dildən-dilə düşüb əbədiləşərək, aşiqlərə örnək oldular. Bu ilahi eşqi müasir dövrümüzdə isə İlhamla Fərizə yaşadı.

N.Gəncəvinin müəllifi olduğu "Yeddi gözəl" poemasında yalan, hiylə, zülm, işgəncə qətiyyətlə pislənir, naləsi ərşə qalxan insanların yurd-yuvasız qalmasının səbəbkarı olan vəzirlərin bəd əməlləri ifşa edilir. Müəllif öz əməllərinin arxasında gizlənərək törətdikləri faciələri, günahsız axıdılan qanları şahların zülmü kimi tanıdan bu tipli vəzirlərin obrazını ümumiləşdirmiş, onları "Yeddi gözəl" poemasında Bəhram Gurun vəziri Rastü-Rövşənin simasında ifşa etmişdir. "Bəhramın qoca çobanın evinə yetişməsi" hekayətində belə nəql edilir: Bəhram müharibə etməyə hazırlaşanda görür ki, nə qoşunu var, nə xəzinəsi. Qəlbini ovutmaq üçün təkbaşına ova çıxır. Ovda susuzlayır. Uzaqdan ətrafa ucalan tüstünü görüb, su içmək üçün tüstü gələn tərəfə atını çapır. Sürülərin otladığını, ağacdan itin başı aşağı asıldığını görüb, çobana yaxınlaşır. Çoban vaxtsız gələn qonağını mehriban qarşılayır, onu süfrəyə dəvət edir. Şah bildirir ki, itin ağacdan niyə asıldığını deməyincə, onun süfrəsindən çörək kəsməyəcək. Çoban bu sirdən qonağını agah edir. Məlum olur ki, vaxtilə öz

etibarı ilə fərqlənən, sürünü vəhşi heyvanlardan qoruyan, sonra isə bir dişi canavara aşiq olduğu üçün ağlını itirən it, sürünü qurda yem etmiş, sahibinin etibarını eşqinə qurban vermişdi. Sürünün getdikcə azaldığını görüb, bu sirrin üstünü açan çoban köpəyi bu üsulla cəzalandırmışdı. Çoban şaha deyir:

Xəyanət işləmiş o, əmanətə,
Satır əminliyi min xəyanətə,
Günahkarla belə rəftar etməsən,
Kimsə deməz sənə: "afərin, əhsən".

Bəhram Gur çobanın sözündəki hikməti, mənanı anlayır. Çoban öz əməli ilə hökmdara ibrət dərsi verir: "xəyanətkar cəzasız qalmamalıdır". Geri qayıdan Bəhram vəzirini divana çəkir, ondan haqq-hesab tələb edir.

Vəzir inandığım, gözüm, canımdır,
Hər zaman sürünü qoruyanımdır.
Desin: ölkə niyə bir viranədir?
Belə bərbadlığın əsası nədir?

Bəhram Gur zindandan gətirtdiyi siyahılara baxarkən, vərəqlərdən boylanan bir cümlə onun diqqətini cəlb edir: "Padşah ölüm kəsir, vəzir bağışlar". Vəzirin xəyanətləri bir-bir üzə çıxır. Şah vəziri ölüm hökmü ilə cəzalandırır, ölkəsində ədaləti bərpa edir, çobanı isə saraya çağırır.

Şair qələmə aldığı bu hekayətdə şahı çobanın vasitəsilə tərbiyə edir. Onu məsuliyyətə çəkir. Eyş-işrətə uyub, ölkəsini Rastü-Rövşən kimi xəyanətkar, zülmkar vəzirlərə etibar etməyin aqibətini göstərir.

"Qibtli Mariyanın hekayəsi və onun kimyagərliyi" ("İsgəndərnamə") hekayəsində Qızıl iksiri Ərəstundan öyrənən Qibtli Mariya iksir alimi tək şöhrət qazanır. Bu elmlə ölkəsini xəracdan, borcdan qurtarır. Xəzinəsini doldurur, var-dövlətini artırır, qoşunda nə qədər süvari varsa, atlarının nallarını qızıldan düzəltdirir.

Çoxu bu sarayda yeyib gəzərdi,
Hətta eşşəyin də palanı zərdi.
Qızıl bəzəklərin yox idi həddi,
İtin də zənciri qızıldan idi
[2, s.56].

"Payız yetişəndə" şeiri qədim dövr ədəbiyyatında uşaq oxusunun təbiət mövzusunda yazılmış ən gözəl nümunələrindən biridir. Şeir məktəbəqədər və kiçik yaşlı məktəblilər üçündür. Uşaqlar burada iki fəsillə – yay və payızla tanış olurlar. Artıq yay fəsli sona yetib, payız yetişib. Payızın gəlişi ilə bağların əhval-ruhiyyəsi dəyişib. Bağlar yaşıl yarpaqsız və meyvəsiz qalmış, cəh-cəh vuran quşlar da lal olmuş, reyhanın şux yarpaqları tökülmüşdür. Nizami oxucularının gözü qarşısında yay fəslində təbiət necə olursa, onu canlandırır. Həm də payızın yetişməsilə təbiətin libasının necə dəyişdiyini təsvir edir:

Əsdi xəzan yeli, payız yetişdi,
Bağların əhvalı tamam dəyişdi.
Küləklər taladı bağçanı, bağı,
Söndü al güllərin yanar çırağı.
Arxlar kənarında otlar sapsarı,
Töküldü reyhanın şux yarpaqları.
Sanki ağaclıqda odlar qalandı,
Əlvan yarpaqları alışdı, yandı.
Oxuyan quşlar da lal olmuş çoxdan,
Yelin ayağına dolaşır xəzan.
Güllərin yerini tikanlar almış,
Yarpaqsız, meyvəsiz bağlar boş qalmış.

Beləliklə, uşaqlar bu nəzm əsərində hər iki fəsil haqqında geniş məlumat əldə edirlər.

N.Gəncəvi "Sözün tərifi"ndə sözün faydalı və mənalı olmasından, onun hikmətindən bəhs edir, yerində deyilmiş sözün söz sahibinə nüfuz gətirməsindən söhbət açır. Hətta Nizaminin adı ilə bağlı olan "danışmaq gümüşdürsə, susmaq qızıldır" kəlamı el məsəlinə çevrilib. Böyük şairin söz haqqında fikirləri yeniyetmə və gənclərə bir örnəkdir.

Sözün də su kimi lətafəti var,
Hər sözü az demək daha xoş olar.
İncitək sözlər seç, az danış, az din,
Qoy az sözlərinlə dünya bəzənsin.

Söz qasidi hər yolu hey özbaşına gedər,
Sözün gördüyü işi kimsə görməz bu qədər.
Sözdən başqa yuxarı başda oturan yoxdur,
Mülkün dövləti yalnız onundur, danan yoxdur.

Şairin qida haqqında fikirləri də ibrətamizdir. O, acgözlüyü, tamahkarlığı pisləyərək, gözütox olmağı təlqin edir. Çox yeməyin insana min bir dərd gətirdiyini söyləyən şair suyun saflığını nümunə göstərərək, hətta onun da artıq içilməsinin insana bəladan başqa fayda vermədiyini göstərir:

Bir inci saflığı varsa da suda,
Artıq içiləndə dərd verir o da.

Tədqiqatçı alim Bilal Həsənli qeyd edir: "Nizaminin uşaq mütaliəsi nümunələri olan əsərlərinin təhlili göstərir ki, ədib insana yeni münasibətini ifadə etmiş, həyatda xeyirlə şərin mübarizəsində insanı mübarizəyə, real həyat mövqeyi tutmağa səsləmiş, haqqın, ədalətin qələbəsinə dərin inam ifadə etmişdir" [4, s.80].

Vaxtilə orta məktəb proqramı, dərslik və dərs vəsaitləri olmadığı zamanlarda Nizami yaradıcılığı şagirdlərə təlim, tərbiyə, mənəviyyat, əxlaq kimi keyfiyyətlər aşıladığına görə, məktəbdə tədris olunurdu. İndi də Nizami irsi məktəbdə öyrədilir.

## Nəticə / Conclusion

Dahi N.Gəncəvinin əsərləri ümumbəşəri xarakteri ilə tanınır. Bu bəşərilik Nizami yaradıcılığının insanlara mənəviyyat və əxlaq aşılamasındadır. Bu nöqteyi-nəzərdən şairin poemaları içərisində gənclərin tərbiyəsi üçün vacib olan bir çox materiallar vardır. Məqalədə kiçik süjet xətləri olan hekayələrdən istifadə etməklə onların şagird mütaliəsi üçün münasib olduğu vurğulanmışdır. N.Gəncəvi həm də dünyada tərbiyəçi şair kimi tanınır. Müəllimlər öz pedaqoji fəaliyyətində tez-tez Nizami yaradıcılığına, onun hikmətlə dolu söz dəryasına müraciət edirlər. Buradan məqalənin həm də didaktik əhəmiyyəti aydın görünür.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Azərbaycan ədəbiyyatı tarixi. (2007). VI cilddə, II cild. Bakı, Elm. 632 s.
2. Gəncəvi N. (2004). İskəndərnamə. Bakı, Lider. 256 s.
3. Gəncəvi N. (2004). Sirlər Xəzinəsi. Bakı, Lider. 264 s.
4. Həsənli B. (2015). Azərbaycan uşaq ədəbiyyatı. Bakı, Müəllim. 522 s.
5. Xəlil Z., Əsgərli F. (2007). Uşaq ədəbiyyatı. Bakı, ADPU. 490 s.
6. Səfərli Ə., Yusifli X. (1998). Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı. Ozan. 632 s.
7. Soltanqızı P. (2015). Klassik və müasir ədəbiyyatın aktual məsələləri. Bakı, Elm və təhsil. 224 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, № 1 (267), 123-133

**AZƏRBAYCAN UNİVERSİTETLƏRİ**

# ADPU-nun Filologiya fakültəsi ötən əsrin 20-ci illərində

***Yaqub Babayev***
Filologiya elmləri doktoru, professor. Azərbaycan Dövlət Pedaqoji Universiteti.
Azərbaycan. E-mail: ymbabayev@hotmail.com
https://orcid.org/0000-0002-2220-1378

**XÜLASƏ**
Məqalədə Azərbaycan Dövlət Pedaqoji Universitetinin Filologiya fakültəsinin XX əsrin 20-ci illərindəki həyatı və keçdiyi inkişaf yolundan söhbət açılır. Göstərilir ki, ADPU Azərbaycanın ikinci dünyəvi istiqamətli milli ali təhsil ocağı, həm də dünyəvi təmayüllü ilk milli ali pedaqoji tədris müəssisəsidir. Təhsil ocağı 1921-ci ildə fəaliyyətə başlamış, 100 il ərzində böyük uğurlar qazanmışdır. Məqalədə ADPU-nun ilk fakültələrindən olan Filologiyanın yaranmasında qarşıya çıxan çətinliklər nəzərə çatdırılır, bu çətinliklərin aradan qaldırılması üçün görülən işlər izah olunur, fakültənin müəllim və tələbə kontingenti barədə məlumat verilir. Həmçinin fakültədə pedaqoji, elmi-pedaqoji istiqamətdə görülən işlərdən, ictimai-mədəni tədbirlərdən bəhs olunur. Qeyd olunur ki, fakültənin ötən əsrin 20-ci illərindəki həyatı, bu dövrdə görülən işlər onun sonrakı inkişafı üçün bir baza rolunu oynamışdır.

**AÇAR SÖZLƏR**
Azərbaycan Dövlət Pedaqoji Universiteti, Filologiya fakültəsi, 20-ci illər, məktəb, maarif, təhsil tarixi, pedaqoji fikir

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 18.01.2021
qəbul edilib: 24.02.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Pedaqogika üzrə fəlsəfə doktoru, dosent Bilal Həsənli.

TEACHING OF AZERBAIJANI LANGUAGE AND LITERATURE
2021, NO. 1, VOL. 267, 123-133

**AZERBAIJANI UNIVERSITIES**

# Faculty of Philology of ADPU in the 20s

***Yaqub Babayev***
Doctor of Philological Sciences, Professor. Azerbaijan State Pedagogical University. Azerbaijan. E-mail: ymbabayev@hotmail.com
https://orcid.org/0000-0002-2220-1378

**ABSTRACT**
The article talks about the life of the Faculty of Philology of the Azerbaijan State Pedagogical University in the 1920s and its development. It is noted that ASPU is the second secular national higher education institution in Azerbaijan. It is also the first national higher pedagogical institution with a secular orientation. The educational institution was established in 1921 and has achieved great success for 100 years. The article highlights the difficulties encountered in the establishment of Philology, one of the first faculties of ASPU. The work done to overcome these difficulties is explained. Information is given about the teacher and student contingent of the faculty. Also, the work done at the faculty in the pedagogical, scientific and pedagogical direction, socio-cultural events are discussed. It is noted that the life of the faculty in the 20s, the work done during this period played a fundamental role in its further development.

**KEYWORDS**
Azerbaijan State Pedagogical University, faculty of Philology, 20s, school, education, history of education, pedagogical thought

**ARTICLE HISTORY**
Received: 18.01.2021
Accepted: 24.02.2021

## Giriş / Introduction

Azərbaycanın mötəbər ali təhsil ocaqlarından biri olan Azərbaycan Dövlət Pedaqoji Universiteti bu il 100 illik yubileyini təntənəli şəkildə qeyd etməyə hazırlaşır. 1921-ci ildə fəaliyyətə başlayan ali tədris müəssisəsi 100 il ərzində xalqımızın pedaqoji fikir tarixində, məktəb və maarif həyatında son dərəcə əhəmiyyətli rol oynamış, uğurlu işlər görmüşdür. Respublikanın tədris ocaqları üçün peşəkar pedaqoji kadrların hazırlanmasında, məktəb və maarif həyatımızın yüksəlişində, yeni həyat uğrunda mübarizədə ADPU-nun müstəsna rolu olmuşdur. Bundan əlavə, universitet respublika elmi mühiti üçün elmi və elmi-pedaqoji kadrların hazırlanmasında da böyük uğurlara imza atmışdır. Azərbaycanda bir sıra peşəkar müəllimlər, pedaqoji sahədə tanınan mütəxəssislər, habelə görkəmli alimlər, elm xadimləri məhz bu ali məktəbin məzunu olmuşlar. Yüz il ərzində ADPU-nun yetirdiyi pedaqoji, elmi-pedaqoji kadrların sayı minlərlədir. Görkəmli alimlərin, sənət adamlarının sayı da kifayət qədər çoxdur. Hələ 1924-cü ildə Ali Pedaqoji İnstitutun ilk məzun buraxılışı münasibətilə keçirilən tədbirdə Nəriman Nərimanov yenicə fəaliyyətə başlayan tədris ocağının əhəmiyyətini, bütün Şərq coğrafiyasındakı dəyərini nəzərdə tutaraq deyirdi: "Azərbaycan Şərq üçün bir məktəbdir, yəni Şərq hazırkı halında qalarsa, biz ona hər cəhətdən müəllim olacağız. Beş ildən sonra Türkiyə, İran, Əfqan üçün bizim müəllimlərimiz elm-fənn meydanında hazır olacaqlar" [2, s.111].

İlk dəfə "Ali Pedaqoji İnstitut" adı ilə təsis edilən bu ali pedaqoji təhsil müəssisəsinin ilk üç fakültəsindən biri Tarix-ədəbiyyat fakültəsi olmuş, çox keçmədən bu iki ixtisas ayrılmış və Ədəbiyyat şöbəsi müstəqil fakültəyə çevrilmişdir. Əlbəttə, biz bu gün məktəb və təhsil tariximizi hərtərəfli mənada tədqiq etməli, öyrənməli, indiki və gələcək nəslə təqdim etməli, tanıtmalıyıq. Bunun üçün onun həm ayrı-ayrı detallarını, həm də bütöv sistemini öyrənməyə, araşdırmağa ehtiyac vardır. Təbii ki, detallar öyrənilmədən həmin sistemi yaratmaq və bütövləşdirmək mümkünsüzdür. ADPU-nun Filologiya fakültəsinin 20-ci illər, yəni ilkin təşəkkül mərhələsini araşdırıb müəyyən etmək də deyilən vacib detallardan biridir. Məqalənin aktuallığını şərtləndirən ilk növbədə göstərilən bu məziyyətdir.

## Filologiya fakültəsi necə yarandı?

Azərbaycanda Ali Pedaqoji İnstitutun yaradılması ilə bağlı ilk əməli təşəbbüs və ideya Azərbaycan Xalq Cümhuriyyətinə məxsusdur. Belə ki, hələ 1919-cu ildə AXC

hökuməti Maarif və Dini Etiqad naziri olan Həmid bəy Şahtaxtinskiyə (1880-1944) Azərbaycanda ali pedaqoji təhsil-tədris müəssisəsi yaratmaq üçün layihə hazırlamağı tapşırdı. Əslində, bu işin təşəbbüskarlarından biri də elə xalq təhsilinin yaxşı mütəxəssislərindən olan, nüfuzlu ziyalı kimi tanınan H.Şahtaxtlı özü idi. Verilən tapşırıq əsasında o, belə bir layihə üzərində işləməyə başladı. Lakin 1920-ci ilin 28 aprelində baş verən bolşevik işğalı AXC-nin süqutuna səbəb olduğundan milli hökumət bu ideyanı gerçəkləşdirə bilmədi. Ali Pedaqoji İnstitutun ilk direktoru olmuş (1921-1924) Fətulla bəy Əziz oğlu Rzabəyli (1885-1968) də 1924-cü ildə ali məktəbin ilk məzun buraxılışı ilə bağlı çıxışında Azərbaycanda Ali Pedaqoji İnstitut təsis etməyin ilk təşəbbüskarının AXC və H.Şahtaxtlı olduğunu etiraf edərək deyir: "Müsavat hökuməti zamanı möhtərəm yoldaşım Həmid Şahtaxtlı tərəfindən dəxi ideyası meydana atılan Türk Ali Pedaqoji İnstitutun müxtəsər tarixçəsini bitirərək, gələcək ali pedaqoji institutunu təsvirimdə canlandıraraq qurduğum projesini bir kaç kəlmə ilə tərsim etmək istərdim: Xəzər dənizi sahilində mövcud Şərqin qapısı olan birinci türk sosialist şura cümhuriyyətinin coğrafi vəziyyətinə görə şu müqəddəs binanın müəzzəm bir elm xəzinəsi olacağına qəlbimlə və ruhumla iman etmişəm" [1, s.30].

Azərbaycanda sovet hökuməti qurulandan az sonra yenidən bu təşəbbüs ortalığa atıldı. 1921-ci ilin iyun ayına qədər yaradılmış komissiya ali məktəbin layihəsi üzərində işi başa çatdırdı. Onun Əsasnamə və Nizamnaməsini hazırladı. Əsasnamə və Nizamnamədə ali təhsil ocağının strukturu, məqsədi, vəzifələri və hüquqları müəyyən edilirdi. İyun ayının 13-də Azərbaycan Xalq Maarif Komissarlığının Kollegiyası layihəni müzakirə və təsdiq etdi, baxılmaqdan ötrü Komissarlar Şurasına göndərdi. Onu da deyək ki, bu ali peadaqoji təhsil müəssisəsi kişilər üçün nəzərdə tutulmuşdu. Ona görə də **Azərbaycan Dövləti Türk Zükur** (Kişi-red.) **Ali Pedaqoji İnstitutu** adlanırdı. Azərbaycan Xalq Komissarlar Şurası 26 avqust 1921-ci il tarixli 66 saylı dekreti ilə "Azərbaycan birinci Dövlət Ali Pedaqoji İnstitututu təsis edilməsi haqqında" sənədi təsdiq etdi. Sənəddə deyilirdi: "İşbu sənənin 1 iyulundan etibarən, Bakı şəhrində 2-ci dərəcəli Şura məktəbləri üçün hökumət Türk lisanında müəllimlər hazırlaya biləcək Azərbaycan birinci Dövlət Ali Pedaqoji İnstitutut təsis edilsin və bu dekretin nəşrindən sonra bilatəxir institutun təşkilatına başlanılsın". Dekreti Xalq Komissarlar Şurasının sədri N.Nərimanov, Xalq Maarif Komissarı D.Bünyadzadə, Xalq Komissarlar Şurası işlər müdiri Şirvani və katib R.Tahirov imzalamışdılar.

Hökumət dekretindən sonra Maarif Komissarlığının İctimai İşlər üzrə Tərbiyə müdiri Azad Əmirovun göstərişi ilə (1414 nömrəli mandat) institutun təşkili üçün ayrıca komissiya yaradıldı. Əvvəlcə komissiyaya Fəthullah Rzabəyli, Həbib bəy

Mahmudbəyov və Rəhim Cəfərov daxil idilər. F.Rzabəyli sədr, o zaman bir illik kurs bitirən Əli Abbas Vəlixanlı isə katib idilər. Az sonra Abdulla Şaiq Talıbzadə, Məhəmməd Əfəndizadə və Sadıq Hüseynzadə də komissiyanın işinə cəlb edildilər.

İlk növbədə institut üçün bina tapmaq məsələsi həll edilməli idi. Bu işdə o zaman Bakı Maarif Şöbəsinin Məktəb İşləri müdiri vəzifəsində çalışan Ağa Əli Raqib də komissiyanın işinə yaxından köməklik göstərirdi. "Lebedinski" küçəsindəki köhnə "Turgenev" məktəbinin binası institut üçün ayrıldı və təmir edildi. Noyabr ayının 1-nə qədər həm bütün təşkilati, həm də təmir işləri başa çatdı. Tələbə qəbulu prosesinə başlanıldı. Nəhayət, bütün hazırlıqlar başa çatandan sonra 1921-ci il, noyabr ayının 15-də təhsil məbədinin qapısı ilk dəfə tələbələrin üzünə açıldı və tədris ocağı fəaliyyətə başladı. Bu, Azərbaycan xalqının tarixində yeni tipli ilk ali pedaqoji təhsil-tədris müəssisəsi idi. Azərbaycanda ilk ali pedaqoji məktəb – **Azərbaycan Dövləti Türk Zükur Ali Pedaqoji İnstitutu** belə yarandı.

Onu da deyək ki, institut ilk dəfə cəmi 6 tələbə ilə fəaliyyətə başlamışdı. Yəni ilk dəfə buraya qəbul olunan tələbə kontingentinin sayı cəmi 6 nəfər idi. Həmin tələbələr bunlardır: Rəhimzadə Əbdulhəsən, Musaxanlı Atababa, Axundzadə Vəli, Süleymanzadə Mahmud, Mustafazadə Ağaveys, Adilzadə Əbdulməsur.

Görkəmli ziyalı, bacarıqlı təşkilatçı Fətullah bəy Rzabəyli Azərbaycan Dövləti Türk Zükur Ali Pedaqoji İnstitutunun ilk direktoru (1921-1924), tanınmış pedaqoq Həbib bəy Mahmudbəyov isə onun müavini təyin edildilər. 20-ci illərdə F.Rzabəylidən sonra Ali Pedaqoji İnstitut Bakı Dövlət Universitetinin tərkibinə daxil edilənə qədər (1927-1930) onun rektorları Məhəmməd Əfəndiyev (1924), Həbib bəy Mahmudbəyov, Şərif Manafov və Cəlil Məmmədzadə (1925-1927) olmuşlar.

İnstitutun ilk müəllim heyəti isə aşağıdakılardan ibarət idi:

1. Abdullah Şaiq Talıbzadə – məşhur Azərbaycan ədibi, ədəbiyyat müəllimi;
2. Məhəmməd Əfəndiyev – Leninqrad (indiki Sankt-Peterburq-red.) darülfününunu bitirmiş riyaziyyat müəllimi;
3. Həmid Şaxtaxtinski – Odessa darülfününunu bitirmiş ruhiyyat (piskoloji) müəllimi;
4. Mühəndis Sadiq Hüseynov – Darmştad (Almaniya) Politexnikumunu bitirmiş kimya müəllimi;
5. İsmayıl Novruzi – İstanbul darülfününunu bitirmiş fizik və təbiət müəllimi;
6. Fəthullah Rzabəyli – Odessa darülfününunu bitirmiş təşrih və fizioloji müəllimi;
7. V.V.Pismennaya – Leninqrad Ali Pedaqoji İnstitutunu bitirmiş rusca müəlliməsi.

Siyahıdan göründüyü kimi, A.Şaiq ali təhsil ocağının ilk dil-ədəbiyyat, V.V.Pismennaya isə rus dili müəllimləri olmuşlar. Yəni onlar institutun ilk filoloq-müəllimləri idilər. 1922-ci ildə gənc türkoloq, dilçi və ədəbiyyatşünas, 1918-ci ildə Budapeşt universitetini bitirmiş Bəkir Çobanzadə Bakıya dəvət olundu. O, həm Bakı Dövlət Universitetində, həm də Ali Pedaqoji İnstitutda mühazirə və seminar məşğələləri aparırdı.

İnstitutda təhsil müddəti 3 il idi. Birinci kursda, əsasən, ümumi və nəzəri, ikinci və üçüncü kurslarda isə ixtisas və tətbiqi fənlərin tədrisi nəzərdə tutulurdu. Tədris ilinin akademik müddəti (sənəyi-tədrisiyə) 40 həftə müəyyənləşdirilmişdi. İxtisas sinifləri bu qruplara ayrılırdı. Başqa sözlə desək, institutun nəzdində üç şöbə (fakültə) fəaliyyət göstərirdi. Həmin şöbələr bunlar idi:

- ✓ Tarix-ədəbiyyat;
- ✓ Təbiət-coğrafiya;
- ✓ Fizika-riyaziyyat.

İstər Tarix-ədəbiyyat, istərsə də digər şöbələrdə ixtisas fənlərindən əlavə fəlsəfə, pedaqogika, elm-i tərbiyə (didaktika), siyasi iqtisad, ictimaiyyat, Şura qanuni-əsası (hüquq), rus dili və s. fənlər də tədris edilirdi.

1923-1924-cü illərdə türk ədəbiyyatı üzrə tanınmış alimlər – İsmayıl Hikmət və Tofiq Hikmət, həmçinin fars ədəbiyyatı üzrə mütəxəssis Mirzə Möhsün İbrahimov müəllim kimi instituta dəvət olundular və filologiya fənlərindən dərs deməyə başladılar. İ.Hikmət İstanbul, M.M.İbrahimov Paris Universitetinin məzunları idilər. İ.Hikmət, əsasən, türk və Azərbaycan ədəbiyyatı fənlərini, M.M.İbrahimov isə fars dili və fars ədəbiyyatı tarixi fənlərini tədris edirdilər. İstanbul darülfünunun məzunlarından Məhiyəddin adlı gənc, alman dili müəllimi B.Qarbulum, Kiyev darülfünunun məzunu, antropologiya və rus ədəbiyyatı müəllimi Davud Şərifli, Derped darülfününunu bitirmiş alman dili müəllimi T.Qəribli də 1923-1924-cü tədris ilində müəllim kimi tədris ocağına dəvət olunanlar sırasında idilər.

O zaman Azərbaycan ədəbiyyatı tarixinə dair Firidun bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı tarixi materialları" adlı əsərindən başqa heç bir sistemli mənbə və tədqiqat əsəri, tədris materialı mövcud deyildi. F.Köçərlinin adı çəkilən dəyərli əsəri 1925-1926-cı illərdə nəşr olundu. Lakin bu kitab da Azərbaycan ədəbiyyatı tarixini tam şəkildə əhatə etmirdi. Burada yer alan sənətkarlar daha çox XVIII-XIX əsrlərdə yaşayıb-yaradan şairlərimiz idilər. Bu sahədəki boşluğu və ehtiyacı görən İ.Hikmət bir neçə il ərzində 2 cilddən ibarət "Azərbaycan ədəbiyyatı tarixi" adlı fundamental, əhatəli və dəyərli dərslik meydana gətirdi. Bu, F.Köçərlidən sonra həmin sahədə ikinci böyük təşəbbüs idi. Adı çəkilən ədəbiyyat tarixində

İ.Hikmət yazılı ədəbiyyatda bizim ədəbiyyat tariximizi XIII əsrdən başlandığını qeyd edirdi. Yəni onun tarixini 5 əsr əvvələ çəkirdi. İlk sistemli ədəbiyyat tarixi dərsliyimiz olan "Azərbaycan ədəbiyyatı tarixi" 1928-ci ildə 2 cilddə nəşr edildi. Burada İ.Hikmət ədəbi şəxsiyyətlərlə bağlı oçerkləri tarixi-xronoloji ardıcıllıqla vermişdı. Ədəbiyyat tariximizi isə folklordan başlayıb, XVII əsrə qədər ocerkçilik prinsipi ilə elmi şəkildə tədqiq və təhlil etmişdir.

1925-1926-cı tədris ilindən etibarən, Tarix-ədəbiyyat bölməsi 2 müstəqil şöbəyə ayrıldı: Tarix-ictimaiyyat və Filologiya. İki müstəqil şöbənin (fakültənin) yaradılmasında məqsəd, təbii ki, tədrisin keyfiyyətini daha da artırmaq, ixtisas fənlərinin sayını və saatlarını çoxaltmaq, keyfiyyəti yüksəltmək idi. Artıq bu illərdə Filologiya şöbəsində həm tələbələrin sayı artmış, həm də təlim-tədris işlərinə bir sıra yeni və görkəmli filoloq-mütəxəssislər cəlb edilmişdi. Bu illərdə Filologiya şöbəsində çalışan ədəbiyyat müəllimlərindən B.V.Çobanzadəni, İ.Hikməti, N.İ.Aşmarini, Y.V.Çəmənzəminlini, H.Zeynallını, Ə.Haqverdiyevi, A.Ş.Talıbzadəni, M.K.Ələkbərlini, A.Musaxanlını, M.M.İbrahimovu və b.-nı göstərmək mümkündür.

Ali Pedaqoji İnstitutda filoloji ab-havanı, tədrisi və təhsili daha da münbit, maraqlı, məhsuldar və səmərəli etməkdən ötrü, 1924-cü ildən etibarən Rusiyanın elm mərkəzlərindən bir sıra görkəmli filoloq-alimlər ali məktəbə dəvət olundular. Onlar Bakıya gəlib müəyyən müddət burada qalır və Tarix-ədəbiyyat şöbəsində mühazirələr oxuyur, səmərəli məşğələlər aparırdılar. Həmin alimlərdən akademiklər N.Y.Marrı, V.V.Bartoldu, A.N.Samoyloviçi, İ.İ.Meşşaninovu, habelə nüfuzlu professorlar Ə.S.Übeydulini, P.K.Juzeni və b.-nı göstərmək olar. Əlbəttə, belə bir faydalı təşəbbüs yeni filoloqlar, filoloji təmayüllü hazırlıqlı pedaqoqlar nəslinin yetişməsinə kifayət qədər müsbət təsir göstərirdi.

1924-cü ildə haqqında danışdığımız təhsil ocağında 1 ümumi hazırlıq sinfi və 6 ixtisas sinfi fəaliyyət göstərirdi. İxtisas siniflərindən 2-si ədəbiyyat, 2-si riyaziyyat, 2-si isə təbiət sinifləri idi. Tələbələrin ümumi sayı 100-ə çatmışdı. Üçüncü ədəbiyyat şöbəsində (ədəbiyyat ixtisasının III kursunda) 6, ikinci ədəbiyyat şöbəsində (ədəbiyyat ixtisasının II kursunda) 9 tələbə var idi.

Ədəbiyyat şöbəsində ilk illərdə ixtisasla bağlı aşağıdakı fənlər tədris edilirdi: Lisan tarixi (dil tarixi), onun şəkilləri, xüsusiyyətləri, ədəbiyyat tarixi, üsul-i tədris, sərf və nəhv (morfologiya və sintaksis), üslubiyyat (stilistika), izahlı qiraət, nəzəriyat-i ədəbiyyə (ədəbiyyat nəzəriyyəsi), asar-i atiqə (ədəbiyyat tarixi, tarixi abidələr) və hürufiyat təhriyyatı (əlifba məsələləri). 1925-1926-cı illərdə tədris proqramında bir sıra dəyişikliklər edildi. Göstərilən ixtisas fənlərindən əlavə ədəbiyyat şöbəsində bəzi başqa məcburi fənlər də keçilirdi.

Bir məsələni də qeyd etmək lazım gəlir. 1921-ci ildə Bakıda həm də ayrıca qadınların ali təhsil alması üçün Ünas (Qadın-red.) Ali Pedaqoji İnstitutu təsis edildi. Lakin çox keçmədən həmin ali məktəb Azərbaycan Dövləti Türk Zükur Ali Pedaqoji İnstitut ilə birləşdirildi. Eyni zamanda tələbələrin pedaqoji praktika keçməsi üçün institutun nəzdində nümunə məktəbi yaradıldı. Bu nümunə məktəbinə A.Şaiq rəhbərlik edirdi. Ona görə də ona "Abdulla Şaiqin Nümunə Məktəbi" də deyilirdi. Ədəbiyyat ixtisasında praktika dərslərinin necə keçirilməsi barədə Ali Pedaqoji İnstitutun Türk ədəbiyyatı tarixi və üsuli-tədris müdərrisi İsmayıl Hikmət bunları yazırdı. Bu gün bizim üçün xüsusi maraq kəsb etdiyindən biz onun yazısından müəyyən parçanı nisbətən geniş şəkildə nəzərə çatdırırıq: *"Nümunə dərsi verəcək olan ədəbiyyatçı verəcəyi dərsin konspektini hazırlamaq üçün sinif müəllimi ilə müzakirə ediyor və hazırladığı konspekti məsudə halında üsul tədrisi müəllliminə göstərərək tədqiq və islah edildikdən, izahati-lazimə alındıqdan sonra yüzünü ağartaraq hazırlayır və müəyyən zamanda konspekt üzrə dərsini veriyordu.*

*Dərslər nəhayət bulduqdan sonra iştirak edən bütün ədəbiyyatçılar institutun sair şöbələri əfəndilərindən arzu edənlər xaricdən dərsə iştirak edən müəllim, mürəbbi və maarif adamlarından istəyənlər, nümunə məktəbi sinif müəllimi və üsuli-tədris müəllimi hazır bulunduqları halda verilən nümunə dərsinin tənqidi və münaqişəsi yapılıyor. Dərs əsnasında görülən əksiklər söylənıyor, konspektin quruluşuna, tətbiq edilmiş, dideksiyona, üsula, müəllimin hərəkətinə, sairəyə dair iyi və fəna cəhətlər göstəriliyordu. Bu tənqidatın hazırlanacaq olan digər ədəbiyyatçılar üzərində iyi və ibrətli təsirlər buraxacağı pək təbiidir.*

*Ədəbiyyatçılar gördükləri üsuliyyatın mövcudluğuna, ümumiliyinə rəğmən, verdikləri nümunə dərslərində müvəffəqiyyət göstəriyorlardı. Bunda da sırf şəxsi qeyrətlərinin həvəs və məslək aşiqinin böyük əsərləri (təsirləri-red.) vardı. Bu da gələcək üçün böyük ümidlər verə bilir. Verilən nümunə dərsləri arasında ikinci dərəcəli məktəblərdə tarix, ədəbiyyat dərsi, qiraət və izah dərsləri, fikrin və bədii qiymətin izahı, əski və yeni ədəbiyyatın ayrılıq nöqtələrinin izahı kimi mühümcə cəhətlərə fazlaca əhəmiyyət veriliyordu. Bilxassə verilən dərslərin elmi bir quruluşla təqib və tətbiqinə nəzər olunurdu"* [1, s.50-54].

Praktika (sınaq) dərslərinin sayı 12 idi.

1924-cü ilin iyun ayında Ali Pedaqoji İnstitutun ilk buraxılışı oldu. Bununla bağlı təntənəli tədbir keçirildi. İnstitutun ayrıca salnaməsi buraxıldı. Salnamə belə adlanırdı: **"Ali Pedaqoji İnstitutun salnaməsi" (Bakı, 1924)**. Salnamənin üstündəki izahatda yazılırdı: ***"Azərbaycan Dövləti Türk Ali Pedaqoji İnstitutu üç sənəliyi və ilk məzunları dolayısı ilə nəşr olunur".*** Salnamədə institutun 3 illik fəaliyyəti

dövründə görülən işlər geniş şəkildə işıqlandırılırdı. Burada N.Nərimanovun, M.Quliyevin və başqa görkəmli şəxslərin ilk buraxılış münasibətilə kollektivə, tələbələrə müraciətləri, təbrikləri, ürək sözləri də yer almışdı. "E." imzalı bir müəllif öz yazısında ilk məzunları "ön manqa", A.Şaiq "Nümunə məktəbi"nin II sinif tələbəsi Nəsir Fətəliyev isə onlara həsr etdiyi şeirində onları "ilk fatehlər" adlandırmışdı.

İlk buraxılışda məzunların sayı 28 nəfər idi. Bunlardan Tarix-filoloji şöbəni bitirənlərin payına cəmi 5 nəfər düşürdü. Həmin tələbələr bunlardır: Bağırzadə Məhəmməd (Gəncə), Hüseynzadə Surxay (Şuşa), Şərəfəddin Seyidaləm (Türküstan-Daşkənd), Şahverdili Teymur (Lənkəran qəzası), Musaxanlı Atababa (Bakı). Bu məzunlardan A.Musaxanlı müəllim kimi institutda saxlanıldı və filologiyaya aid müəyyən fənlərdən dərs deməyə başladı.

Təhsil ocağında ədəbiyyatla bağlı iki dərnək – Ədəbiyyat (sədr Atababa Musaxanlı) və Dram dərnəyi (sədr Şamil Vəzirzadə) fəaliyyət göstərirdi. Dərnəklərin işində bir məhsuldarlıq və fəallıq hiss olunurdu. Məsələn, Ədəbiyyat dərnəyi 1924-cü il ərzində 14 iclas keçirmiş, "Örnək" adlı divar qəzeti çıxarmış (həmin ildə qəzetin 12 nömrəsi çıxmışdı), müxtəlif ədəbi və pedaqoji mövzularda 3 mühazirə hazırlamış və onun müzakirəsini keçirmiş, tarixi abidələri görmək üçün səyahətlər təşkil etmişdi. Dram dərnəyi isə il ərzində 4-5 teatr tamaşası hazırlamışdı. Teatrın aktyor truppasına tələbələrdən ibarət həvəskar heyət cəlb edilmişdi.

1925-1926-cı tədris ilində Ali Pedaqoji İnstitutun fakültələrinin strukturunda bəzi dəyişikliklər edildi. Tarix-filoloji şöbə iki müstəqil – Tarix-ictimaiyyat və Tarix-ədəbiyyat şöbələrinə ayrıldı. Tarix-ədəbiyyat şöbəsinin dekanı İsmayıl Hikmət təyin olundu. Bu vaxta qədər Tarix-filoloji şöbənin dekanı prof. Ə.S.Übeydulin idi. Şöbə ayrılandan sonra o, Tarix-ictimaiyyat şöbəsinin dekanı təyin edildi.

1923-1924-cü tədris ilində institutu 28, 1924-1925-ci tədris ilində 27, 1925-1926-cı tədris ilində isə 56 nəfər tələbə bitirmişdi. Onların sayı ümumilikdə 111 nəfər təşkil edirdi. Həmin müəllim-pedaqoq məzunlardan 25 nəfəri dil-ədəbiyyat müəllimlərinin payına düşürdü.

1924-1925-ci tədris ilində bir sıra fənn proqramlarında müəyyən dəyişikliklər edildi. Eyni zamanda ali məktəb 4 illik tədris planı ilə işə başladı. Türk ədəbiyyatı tarixi, Azərbaycan ədəbiyyatı tarixi və Cahan (Dünya) ədəbiyyatı fənlərinə verilən saatların miqdarı artırıldı. Mövzularda xeyli dəyişikliklər edildi. Azərbaycan ədəbiyyatının tarixini nə vaxtdan başlamaq məsələsində də bir müəyyənlik hasil olundu. Əlbəttə, bu işlərdə şöbənin dekanı İ.Hikmətin xüsusi rolu və əməyi var idi.

1926-cı ildə Ali Pedaqoji İnstitutun 5 illik yubileyi təntənə ilə qeyd edildi. Elm-tədris məbədinin bu müddətdəki fəaliyyətini canlandıran "Beş yıllıq. Ali Pedaqoji İnstitutu tarixçəsi" (Bakı, 1926) adlı kitab nəşr olundu. Bu kitabda Tarix-ədəbiyyat şöbəsinin dekanı İ.Hikmətin, institutun türkoloji və lisaniyyət (dil) müəllimi B.Çobanzadənin, fars dili və ədəbiyyatı müəllimi M.M.İbrahimovun da məqalələri dərc olunmuşdur. Onlar tarix-ədəbiyyat şöbəsinin həm uğurları, həm buradakı nöqsanlar, həm də görülməli olan işlər barədə ətraflı məlumat vermişlər.

Ali Pedaqoji İnstitutun ötən əsrin 20-ci illərindəki müstəqil fəaliyyəti 1927-ci ilə qədər davam etdi. Azərbaycan SSR XKS-nin 16 iyun 1926-cı il tarixli "Ali pedaqoji institutların yenidən təşkili haqqında" adlı qərarı ilə 1927-ci ildə tədris ilinin əvvəlindən etibarən Ali Pedaqoji Zükur (Kişi) və Ali Pedaqoji Ünas (Qadın) institutları Bakı Dövlət Darülfünununun Pedaqoji fakültəsinə birləşdirildi. Tarix-ədəbiyyat şöbəsi də həmin fakültənin tərkibində fəaliyyət göstərdi. Bu proses 1930-cu ilə qədər davam etdi. 1930-cu ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutu hökumətin rəsmi qərarı ilə yenidən BDU-nun tərkibindən ayrılıb müstəqil ali məktəb kimi fəaliyyət göstərməyə başladı. Pənah Qasımov instituta direktor, B.B.Komarovski direktor müavini, dosent Ə.Nəzmi isə Dil-ədəbiyyat kafedrasına müdir təyin olundu. Çox keçmədən M.Ə.Hüseyn, M.H.Rəfili, Ə.A.Sultanlı kimi gənc, istedadlı və perspektivli alim-pedaqoqlar institutun pedaqoji heyətinə cəlb edildilər.

## Nəticə / Conclusion

Azərbaycan Dövlət Pedaqoji Universiteti Azərbaycan xalqının çoxəsrlik tarixində yaradılmış ikinci milli dünyəvi ali təhsil ocağıdır. Ondan əvvəl təsis edilmiş milli dünyəvi təhsil müəssisəsi isə 1919-cu ildə, yəni Azərbaycan Xalq Cümhuriyyəti dövründə yaradılmış Bakı Dövlət Universitetidir. ADPU həm də bizim ilk ali pedaqoji maarif məbədgahımız, hal-hazırda milli pedaqoji kadrlar hazırlayan maarif ocaqlarının flaqmanıdır. Təhsil müəssisəsi yarandığı 100 il ərzində ölkə üçün minlərlə pedaqoji, elmi-pedaqoji kadr, səriştəli mütəxəssis hazırlamışdır.

Filologiya fakültəsi ADPU-nun ən mühüm, tələbə kontingenti çox olan ixtisas fakültələrindən biri olmuşdur. Fakültə ali məktəb yarandığı ilk vaxtlardan onun əsas şöbələrindən biri kimi fəaliyyət göstərmişdir. İlk yaranış çağında fakültə bir sıra problemlərlə üzləşməli olmuşdur. Belə ki, o zaman institutda dərs deyəcək ixtisas sahibləri, mütəxəssislər çatışmırdı. Ona görə də fakültəyə xarici ölkələrdən, məsələn, Türkiyədən də mütəxəssislər dəvət olundu. 20-ci illər Filologiya fakültəsinin

həyatında mürəkkəb, keşməkeşli, lakin əlamətdar bir dövr olmuşdur. Ədəbiyyatşünaslığa, dilçiliyə, pedaqogikaya və s. elmlərə dair ilk milli ali məktəb dərsliklərimiz məhz 20-ci illərdə meydana gəlmişdir. O dövrdə diqqətəlayiq, səmərəli bir elmi-pedaqoji, tədris-metodiki ənənənin bünövrəsi qoyulmuşdur. Sağlam təməl üzərində qurulmuş həmin ənənə bu gün də davam edir.

**İstifadə edilmiş ədəbiyyat / References**

1. Ali Pedaqoji İnstitutun salnaməsi. (1924). Bakı, Xalq Maarif Komissarlığı, Azərbaycan Dövlət Xalq nəşriyyatı. 62 s.
2. Ali Pedaqoji İnstitutun salnaməsi. (2020). Latın əlifbası ilə təkrar nəşrə hazırlayan: Rüstəmov Fərrux. Bakı, Elm və təhsil.
3. Azərbaycan Ali Pedaqoji İnstitutu. Beş yıllıq. (1926). Bakı, Azərbaycan Dövlət Xalq nəşriyyatı, “Qızıl Şərq” mətbəəsi.
4. Azərbaycan Ali Pedaqoji İnstitutu. Beş yıllıq. (2020). Latın əlifbası ilə təkrar nəşrə hazırlayan: Rüstəmov Fərrux. Bakı, Elm və təhsil.
5. “Azərbaycan arxivi” məcmuəsi. (1978). Bakı, № 1-2 (16-17).
6. “Kommunist” qəzeti. (1921). 26 avqust.
7. Rüstəmov F. (2019). Azərbycan Dövlət Pedaqoji Universitetinin rektorları. Bakı, Elm və təhsil. 304 s.
8. Rüstəmov F. (2021). Azərbycan Dövlət Pedaqoji Universitetinin inkişafının ikinci mərhələsi (1930-1946). Bakı, Elm və təhsil. 188 s.

AZƏRBAYCAN DİLİ VƏ ƏDƏBİYYAT TƏDRİSİ
2021, №1 (267), 134–139

**N Ə Ş R L Ə R**

# Fonetika və fonologiya: yeni araşdırmalar işığında

***Əbülfəz Quliyev***
Filologiya elmləri doktoru, professor, AMEA-nın müxbir üzvü.
AMEA-nın Naxçıvan bölməsi, İncəsənət, Dil və Ədəbiyyat İnstitutu
E-mail: ebulfezamanoglu@yahoo.com

XX əsrin ortalarından etibarən, Azərbaycan dilçiliyi tədricən dirçəlməyə başlamışdı. Dilimiz, xüsusən də onun qrammatik sistemi ölkəmizdə öncə ali məktəb səviyyəsində tədris məqsədilə öyrənilirdi. 1960-cı ildən başlayaraq isə bu iş akademik səviyyədə həyata keçirilməyə başlandı. 1974-cü ildə ümummilli lider Heydər Əliyevin təşəbbüsü ilə ali məktəb filoloqlarının hazırladığı 4 cildlik "Müasir Azərbaycan dili" dərsliyi "Azərbaycan Respublikasının Dövlət Mükafatı"na layiq görüldü. Bu hadisə Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutunda qeyd olunan istiqamətdə işlərin canlanmasına təkan verdi. Belə ki, az sonra həmin İnstitutda üç cilddə hazırlanması nəzərdə tutulmuş "Müasir Azərbaycan dili" kitabının birinci cildi (1978) işıq üzü gördü. Qeyd edək ki, bu cilddə dilçiliyimizin bir neçə bölməsi – fonetika, leksikologiya, semasiologiya, frazeologiya və leksikoqrafiya bölmələri tədqiq olunmuşdur. Kitabda dilimizin səs quruluşunun öyrənilməsinə isə sadəcə 78 səhifə ayrılmışdır.

Müstəqillik illərində dövlət dili statusu qazanmış doğma dilimizin – milli-mənəvi dəyərimizin qloballaşma şəraitində qorunması, istifadəsi, eyni zamanda öyrənilməsi istiqamətində Dövlət Proqramı hazırlanaraq uğurla həyata keçirilmişdir. Dövlət Proqramının bölmələrində qeyd olunduğu kimi, dövlət orqanları akademiyanın Nəsimi adına Dilçilik İnstitutunda elmi tədqiqatları genişləndirmək məqsədi ilə diqqət və qayğını daha da artırmışdır. Məhz buna görə də, Dilçilik İnstitutunda son illərdə orfoqrafiya məsələləri, terminologiya məsələləri, qrammatika problemləri, funksional-praktik dil məsələləri elm adamlarının yaradıcı fəaliyyətində prioritet vəzifə halını almışdır.

Bu yaxınlarda "Elm" nəşriyyatında çap edilmiş dördcildlik akademik qrammatikanın "Müasir Azərbaycan dili" kitabının birinci cildi bu baxımdan diqqət cəlb edir. Təxminən

700 səhifədən ibarət olan bu kitabda Azərbaycan dilinin fonetika, funksional fonetika, fonologiya, orfoqrafiya, orfoepiya, qrafika, eyni zamanda morfonologiya, fonosemantika, fonoüslubiyyat, fonosintaksis məsələləri dilçilik elminin son nailiyyətləri əsasında akademik səviyyədə tədqiq və təhlil edilmişdir. Bu sanballı elmi əsərin elmi məsləhətçisi akademik İsa Həbibbəyli, elmi redaktoru isə akademik Möhsün Nağısoyludur.

Məlumdur ki, XX əsrin 50-60-cı illərində Azərbaycanın görkəmli dilçi-alimi Bəkir Çobanzadənin yetirməsi prof. Əbdüləzəl Dəmirçizadə, daha sonralar isə professorlar Ağamusa Axundov, Aydın Ələkbərov, Fəxrəddin Veysəlli və Firudin Cəlilovun dilimizin səs quruluşunun öyrənilməsi sahəsində apardıqları tədqiqatlar milli dilin fonetik və fonematik sisteminin əsaslı tədqiqi üçün baza rolunu oynamışdır.

Kitabın ön sözündə (akademik Möhsün Nağısoylu) də qeyd edildiyi kimi, “Müasir Azərbaycan dili” kitabının I cildində Azərbaycan dilçiliyində ilk dəfə olaraq, fonetika, fonologiya, prosodiya (intonasiya və vurğu), morfonologiya, fonosemantika, fonoüslubiyyat, fonosintaksis, yeni orfoqrafik və orfoepik normalar, onların prinsipləri və s. konkret dil materialları əsasında təsvir və tədqiq olunur. Bütün bu problematik məsələlər izah və şərh olunarkən, həmin məsələlərə yalnız ənənəvi planda deyil, həmçinin funksional-qrammatik cəhətdən yanaşılır.

Akademik araşdırma fonetika və fonologiya məsələlərinin geniş tədqiqi ilə seçilir. Məhz bu mühüm amil nəzərə alınaraq, tədqiqata Dilçilik İnstitutunun Müasir Azərbaycan dili şöbəsinin əməkdaşları ilə yanaşı, Azərbaycanda fonetika və fonologiya sahəsində tanınmış dilçilər də cəlb olunmuşdur.

Kitabın giriş hissəsində Azərbaycan dilinin inkişaf tarixi və Azərbaycan dili fonetik strukturunun tədqiqi məsələləri (prof. Qəzənfər Kazımov) zəngin dil materialları əsasında geniş şəkildə araşdırılmışdır. Sonuncu bölmə isə, sanki kitabın mövzusu, onun elmi yeniliyi və elmi əhəmiyyəti haqqında mötəbər opponent rəyini xatırladır.

Əsərdə diqqəti cəlb edən bölmələrdən biri də “Fonetika haqqında ümumi məlumat” fəslidir (prof. Mübariz Yusifov). Fonem, səs məfhumu geniş anlayışdır. Ona görə də bu bölmədə səsin əmələ gəlməsi, yaranma yolları və digər bu kimi məsələlər yeni aspektdə işıqlandırılmışdır. Bu bölmədə ilk dəfə olaraq fonetikanın fizioloji, akustik, təsviri, tarixi, müqayisəli, təcrübi (və ya eksperimental), semantik, funksional fonetika kimi növləri və fonomorfologiya haqqında da sistemli şəkildə məlumat verilmişdir. Məlumdur ki, danışıq səsi fonem anlayışı ilə sıx bağlı bir dil vahididir. Məhz buna görə də kitabda səs və fonem əlaqələri dilçilik elminin yeni nailiyyətləri işığında araşdırılmışdır. Bu bölmədə diqqəti cəlb edən digər cəhət də ondan ibarətdir ki, fonetika məsələlərinin tədqiqinə dil tarixi və türkologiya, oğuz dilləri kontekstində yanaşılmışdır. Müəllifin fonemin müəyyən olunması məsələsində aşağıdakı fikri də diqqəti cəlb edir: "…fonem müstəqildirsə, onun

özünün daxilində müəyyən bir məna xüsusiyyəti gizlənir. Fonem müstəqil deyilsə, onun semantik mühiti də yoxdur. Başqa sözlə, o səslər fonemdir ki, onlar semantik mühitə malikdir. Semantik mühitə malik olmayan səs fonem yox, variant (və ya variasiya) səciyyəli hesab edilməlidir".

Kitabın "Azərbaycan dilinin funksional fonetika və fonologiyası" (prof. Fəxrəddin Veysəlli) bölməsində də danışıq səsi və fonem münasibətlərindən, fonem nəzəriyyəsindən bəhs olunur. Xüsusi tədqiqat əsəri təsiri bağışlayan və təxminən 140 səhifədən ibarət olan bu bölmədə dilimizin səs sisteminin ümumi dilçilik, dünya dilləri kontekstində araşdırılması tədqiqatın elmi əhəmiyyətini daha da artırır. Kitabın bu bölməsi önəmli elmi-nəzəri məsələləri əhatə edən aşağıdakı əsas başlıqlara ayrılır: "Azərbaycanda fonetikanın tədqiqi tarixinə qısa baxış", "Tələffüz üslubları və tələffüz normaları", "Fonetikanın ümumi məsələləri", "Fizioloji fonetika", "Dil səslərinin funksional aspekti və ya fonologiya", "Fonem qarşılaşma və korrelyasiyaları", "Fonemlərin manifestasiyası və heca", "Cümlə fonologiyası", "Prosodiya və intonasiya". Müəllifin funksional fonetika və fonologiya əlaqələrinə aid bu əsəri, əslində Azərbaycan dili fonemlər sisteminin struktur-semantik məsələlərinin tədqiqinə həsr olunmuşdur. Çünki prof. Q.Kazımovun da qeyd etdiyi kimi, "Fonologiya, yəni danışıq səslərinin funksional cəhəti fonetik vahidləri sistem şəklində öyrənir. Funksional cəhət dil səslərinin fonoloji mövqeyi, digər səslərlə əlaqə və münasibəti, leksik, fonetik və sintaktik mövqeyinin araşdırılması ilə bağlıdır". Təsadüfi deyildir ki, prof. F.Veysəllinin yazdığı bölmənin bir hissəsi elə "Dil səslərinin funksional aspekti və ya fonologiya" adlanır. "Danışıq səsi və fonem anlayışı" (dos. Elşad Abışov) və "Fonem və onun funksionallığı" (prof. Qara Məşədiyev) bölmələri də mövzusuna görə yuxarıdakı bölmənin davamı səciyyəsindədir. Bu bölmələrdə də real dil faktları və Azərbaycan dili materiallarına istinad çoxdur.

"Saitlər sistemi (vokalizm)" (filologiya üzrə fəlsəfə doktoru Zülfiyyə Quliyeva), "Samitlər sistemi (konsonantizm)" (prof. Aydın Ələkbərov, dos. Aytəkin Ələkbərova) adlı bölmələrdə öncə Müasir Azərbaycan ədəbi dilində fonoloji səpkidə mübahisəli sait və samit fonemlərin sayı məsələsinə aydınlıq gətirilir. Daha sonra sait və samitlərin təsnifat prinsipləri ilə bağlı Azərbaycan dilçiliyindəki fikir ayrılığından bəhs edilir və bildirilir ki, fizioloji təsnifat hamı tərəfindən qəbul edilmiş universal səciyyə daşıyır. Kitabda sait və samitlərin təsnifat prinsipləri cədvəl şəklində təqdim edilir. Eyni zamanda, Azərbaycan ədəbi dilindəki sait və samit fonemlərin hər birinin ayrılıqda səciyyəvi xüsusiyyətləri göstərilir.

Kitabın "Fonetik hadisələr və əvəzlənmələr" bölməsi mərhum akademik Ağamusa Axundovun "Azərbaycan dilinin fonetikası" kitabı əsasında hazırlanmışdır. Burada, xüsusilə türk dillərinin spesifik xüsusiyyəti olan ahəng qanunu, onun ifadə imkanları geniş

dil materialları əsasında tədqiq olunmuşdur.

Kitabda "Heca" (dos. Qüdrət Cəfərov) və "Vurğu" (dos. Elmira Əhmədova) bölmələri də dilçilik elminin son nailiyyətləri səviyyəsində qələmə alınmış, müxtəlif dövrlərdə Azərbaycan dilində fonetika məsələlərindən bəhs edən tədqiqatlarda vurğu, onun funksiyaları, növləri, sözdə vurğunun yeri və s. kimi məsələlərdən danışılmışdır. Daha sonra kitabda digər tədqiqatlarda rast gəlinməyən vurğunun orfoepik və orfoqrafik funksiyası, vurğunun fonetik aktuallaşma funksiyası və s. barədə ətraflı məlumat verilmiş, giriş hissədə isə Azərbaycan dilçiliyində vurğunun tədqiqi vəziyyəti haqqında bəhs edilmişdir. Vurğunun funksiyalarından bəhs olunarkən, onun fonetik aktuallaşma və orfoepik, orfoqrafik funksiyaları, vurğunun növləri, sözdə vurğunun yeri, şəkilçilərdə və köməkçi nitq hissələrində, köməkçi sözlərin vurğu qəbul etməyən şəkilçiləşmiş formalarında, alınma sözlərdə vurğu və s. məsələlər bu məqalədə dərin tədqiqata cəlb olunmuşdur.

Kitabın "Yazı. Əlifba. Qrafika" adlı hissəsində (dos. Aytən Bəylərova) yazının bir-birini şərtləndirən üç komponentindən – əlifba, qrafika və orfoqrafiya məsələlərindən bəhs olunmuşdur. Bu hissədə tarix boyu istifadə olunan yazı növləri, əlifbanın yaranma tarixi, qədim əlifbalar, türk və Azərbaycan xalqlarının istifadə etdiyi əlifbalar, qrafika haqqında məlumatlar verilmiş, əlifba ilə orfoqrafiyanın əlaqəsi, yad əlifbalardan istifadənin dilin orfoqrafiyasına mənfi təsiri kimi məsələlər də araşdırılmışdır.

"Ortaq türk əlifbası" bölməsində (filologiya üzrə fəlsəfə doktoru Elçin İbrahimov) türk dünyasının birliyi və bütövlüyü üçün önəmli olan ortaq dil və əlifba problemindən bəhs edilir. Türk dünyasının hər bir sahədə aktual olan məsələlərinin düşüncədə birləşməsi bütün türk xalqlarının anlaya biləcəyi bir türkcə ilə mümkün ola bilər. Elə buna görə də türk xalqları arasında ortaq ünsiyyət dilinin formalaşdırılması günümüzdə çox böyük əhəmiyyət kəsb edir. Bunun üçün isə ortaq əlifba, ortaq imla prinsipləri, lüğət tərkibi (sözlük), ortaq terminologiya yaradılması, ortaq dərsliklərin hazırlanıb nəşr edilməsi qarşıda duran mühüm vəzifələrdəndir. Müəllifin də qeyd etdiyi kimi, 1991-ci ildə Ankara şəhərində türk dünyası elm adamlarının iştirakı ilə 34 hərfdən ibarət ortaq əlifba layihəsi qəbul edilmişdir. Təqdirəlayiq haldır ki, bölmənin sonunda alimin bu problemin həlli istiqamətində 10-15 maddədən ibarət təklifləri də öz əksini tapmışdır.

Bildiyimiz kimi, prof. Əbdüləzəl Dəmirçizadənin Azərbaycan dili fonetikasının öyrənilməsində mühüm xidmətləri olmuşdur. Bu səbəbdəndir ki, kitab müəlliflərinin əksəriyyəti öz yazılarında prof. Ə.Dəmirçizadənin bu sahədəki xidmətlərini xüsusilə qeyd etmişlər.

Kitabın "Azərbaycan dilinin fonetik üslubiyyatı" bölməsində (dos. Nərgiz Hacıyeva) "üslubi fonetika" adlanan kateqoriyanın funksiya və ifadə vasitələrindən bəhs edilir.

Təsadüfi deyildir ki, Azərbaycan dilçiliyində fonetik üslubiyyat, üslubi fonetika barədə ilk dəfə prof. Ə.Dəmirçizadə məlumat vermişdir. Bu bölmədə Azərbaycan dilinin fonetik üslubiyyatının nəzəri məsələləri, onun fonosemantika ilə qarşılıqlı əlaqəsi, morfonologiyada fonetik üslubiyyatın rolu, fonetik üslubi kateqoriyaları ilk dəfə olaraq üzə çıxarılmış, fonetik-üslubi kateqoriyalarda fonetik ifadə vasitələrinin qarşılıqlı əlaqəsi, fonetik-üslubi ifadə vasitələrinin dilin bir sıra bölmələri üzrə tədqiqi, tələffüzün geniş mənada işlənmə xüsusiyyətləri və intonasiyanın komponentlərinin üslubi xüsusiyyətləri tədqiq olunmuşdur.

Kitabın "Orfoepiya və orfoepiya anlayışı" (dos. İntizar Salehova) bölməsi fonetik normanın bir qolu olan orfoepik (ədəbi tələffüz) normalara həsr olunmuşdur. Müəllif orfoepiya anlayışının elmi izahı üzərində geniş dayanmış və təsadüfi deyildir ki, bu məsələnin tədqiqinə 50 səhifə həsr edilmişdir. Kitabın bu bölməsində dilçilikdə tez-tez rast gəlinən orfofoniya və orfoepiya məsələsinə də toxunulmuş, orfofoniya orfoepiyanın tərkib hissəsidir qənaətinə gəlinmişdir. Orfoepik qaydaların müəyyənləşməsində tələffüz üslubları və tələffüz şəraiti mühüm rol oynayır. Buna görə də yazıda onlara geniş diqqət ayrılır, səslərin tələffüz qaydalarının tələffüz şəraitinə uyğun müəyyənləşdirilməsi məqsədəuyğun hesab olunur və araşdırma bu istiqamətdə aparılır. Bu mövzunun davamı "Orfoepiya normaları" (prof. İsmayıl Məmmədov) bölməsində də verilmişdir. Burada orfoepiya ilə orfoqrafiyanın əlaqələrindən, vaxtilə düzgün yazı qaydaları tərtib olunarkən, fonetik prinsipə əsaslanılmasından və fonetikanın hər iki sahəsinin yaxınlığından bəhs edilir. Orfoepiyanın prinsip və normalarını elmi əsaslar üzrə şərh edən müəllif, həmçinin alınma sözlərin tələffüz qaydalarından da daha geniş şəkildə bəhs etmişdir.

Kitabda fonetika ilə sıx bağlı olan "Orfoqrafiya" bəhsini prof. İsmayıl Kazımov və filologiya üzrə fəlsəfə doktoru Şəlalə Qasımova yazmışdır. Məlumdur ki, son illər istər elmi mühitdə, istərsə də sosial şəbəkələrdə orfoqrafiya qaydaları qızğın müzakirə olunur, məqalə və məruzələrdə, müxtəlif tipli yazılarda hər kəs öz düşüncə və mülahizələrini ortaya qoyur**.** Azərbaycan dilində müxtəlif illərə aid orfoqrafiya qaydaları mövcud olsa da, bu qaydaların daha da təkmilləşməyə, ayrı-ayrı müddəalarında dəqiqləşdirmə aparmağa ehtiyac vardır. Ona görə də bu bölmədə həm orfoqrafiya məsələlərinin tarixinə nəzər salınmış, bir çox alim və ziyalılardan sitatlar gətirilmiş, onlarla polemikaya girməyə çalışılmış, həm də orfoqrafiya üçün vacib olan xüsusiyyətləri, bu qaydaları formalaşdıran prinsiplərin hər biri haqqında ərtaflı məlumat verilmişdir. Azərbaycan dilinin yeni orfoqrafiya qaydaları da bu yazıya daxil edilmişdir.

Kitabın "Azərbaycan dilinin morfonologiyası" (prof. Firudin Cəlilov) bölməsində fonetika ilə morfologiya münasibətləri, "Dil və fonosemantika məsələlərinə bir baxış" (prof. Buludxan Xəlilov) bölməsində fonetika və semasiologiya münasibətləri,

“Fonosintaksis. Sintaqm – fonosintaksisin obyekti kimi” (prof. İsmayıl Kazımov) bölməsində isə fonetika və sintaksis münasibətləri dünya dilçilik elminin yeni nailiyyətləri işığında yüksək səviyyədə tədqiq edilmişdir.

Beləliklə, AMEA Nəsimi adına Dilçilik İnstitutu, onun Müasir Azərbaycan dili şöbəsinin əməkdaşlarının hazırladığı “Müasir Azərbaycan dili I cild” (fonetika və fonologiya) kitabı AMEA-nın 70 illik yubileyinə layiqli bir hədiyyədir. 700 səhifədən ibarət olan bu kitab, Azərbaycan dili fonetik sisteminin öyrənilməsi tarixində yeni tədqiqatlar işığında yazılmış ilk fundamental əsərdir. İnanırıq ki, öz aktualllığı ilə diqqəti cəlb edən “Fonetika və Fonologiya” kitabı filoloqlar, müəllimlər, doktorant və magistrant tələbələr üçün dəyərli bir töhfə olacaqdır.

## MÜƏLLİFLƏRİN NƏZƏRİNƏ

*«Azərbaycan dili və ədəbiyyat tədrisi» jurnalında dərc ediləcək məqalələr üçün texniki tələblər*

**Məqalələrin məzmunu**

Məqalələr aktual mövzulara həsr olunmalı, jurnalın məzmun və üslubuna uyğun akademik tələblərə cavab verməli, «Xülasə» (Abstract), «Giriş» (Introduction) və «Nəticə»dən (Conclusion) ibarət olmalıdır. «Xülasə»də məqalənin əsas aspektləri qeyd edilməli, «Giriş»də mövzunun aktuallığı əsaslandırılmalı, «Nəticə»də isə elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq müəllifin gəldiyi elmi qənaət, işin elmi yeniliyi, tətbiqi əhəmiyyəti, iqtisadi səmərəsi və s. aydın şəkildə verilməli, təklif və tövsiyələr irəli sürülməlidir.

**Məqalələrin strukturu və tərtib edilmə qaydaları**

1) Redaksiyaya təqdim edilən məqalələr Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının dövri elmi nəşrlərin qarşısında qoyduğu şərtlər də daxil olmaqla aşağıdakı tələblərə cavab verməlidir:

- ✓ Məqalənin adı, müəllifin adı və soyadı, vəzifəsi, elmi dərəcəsi, işlədiyi qurumun adı və ünvanı, elektron poçt ünvanı və telefon nömrəsi məqalənin titul səhifəsində yazılmalıdır.
- ✓ «Xülasə» (Azərbaycan və ingilis dillərində) eyni məzmunda olmaqla, təxminən 70-120 söz həcmində verilməlidir.
- ✓ «Açar sözlər» (Azərbaycan və ingilis dillərində) 3-5 söz və ya söz birləşməsindən ibarət olmalıdır.

2) Məqalənin mətni Microsoft Word proqramında, A4 (210x297mm) formatda, Times New Roman — 12 şriftində yığılmalı, intervalı – 1, 15, həcmi 6-10 səhifə olmalıdır.

3) Məqalənin adı və yarımbaşlıqları yalnız ilk hərfi böyük olmaqla, qalın şriftlə yazılmalıdır. Başlıq və yarımbaşlıqlardan, cədvəl və şəkillərdən (həmçinin tənliklər və düsturlardan) əvvəl və sonra bir sətir ara boşluğu buraxılmalıdır. Səhifələr ardıcıl olaraq aşağı sağ küncdə nömrələnməlidir.

4) Cədvəl və şəkillərin adı olmalı və bu ad cədvəllər üçün cədvəlin üstündə sol küncdə, şəkillər üçün şəklin altında sol küncdə yerləşdirilərək, ardıcıl nömrələnməlidir.

5) Məqalənin mövzusu ilə bağlı elmi mənbələrə zəruri istinadlar olmalı, sonda verilən «İstifadə edilmiş ədəbiyyat»da istinad olunan ədəbiyyatlar mətnin içində

[Məmmədov A. Bakı, 2010] və ya [1, s.35] kimi verilməli, sonda isə əlifba ardıcıllığı ilə nömrələnməlidir. Elmi ədəbiyyata mətndə onlayn istinad olarsa 1 qoyaraq aşağıda internet linki göstərilməlidir. Ədəbiyyat siyahısında verilən hər bir istinad haqqında məlumat tam, dəqiq və orijinalın dilində olmalıdır. İstinad olunan mənbənin biblioqrafik təsviri onun növündən (monoqrafiya, dərslik, elmi məqalə və s.) asılı olaraq verilməlidir. Elmi məqalələrə, simpozium, konfrans və digər nüfuzlu elmi tədbirlərin materiallarına və ya tezislərinə istinad edərkən məqalənin, məruzənin və ya tezisin adı göstərilməlidir. Mətndə istinad olunan bütün mənbələr, səhifə nömrələri ilə birlikdə «İstifadə edilmiş ədəbiyyat» siyahısında aşağıdakı nümunələrdə göstərilən qaydada verilməlidir:

a) *Kitablara istinad:* Adilov M.İ., Həsənov İ.C. (2012). Qloballaşma və milli mənəvi dəyərlər. Bakı, "Elm". 476 s.

b) *Jurnallara istinad:* Cəfərov Y. (2020) Sosial medianın dil xüsusiyyətləri. "Azərbaycan dili və ədəbiyyat tədrisi". № 1, Bakı: Şərq-Qərb, səh.11-26.

c) *Toplularda məqaləyə istinad* (konfrans, simpozium və digər): "Azərbaycan iqtisadiyyatında keçid dövrünün başa çatması: təhlil və nəticələr. Milli inkişaf modelinin formalaşması problemləri". (2010). Respublika elmi-praktiki konfransının materialları. Bakı: "Şərq-Qərb", səh.314-316.

ç) *Dissertasiyalar və avtoreferatlar:* Məmmədov H.B. (2013) Azərbaycan Respublikası müasir beynəlxalq siyasi proseslərin aktoru kimi. Elmlər doktoru dissertasiyasının avtoreferatı, Bakı: "Elm", 44 s.

d) *Müəlliflik şəhadətnamələri və patentlər*: Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР Б.И. 1988, № 4, s.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

e) *İnternet səhifələri:* İnternet səhifələrinə istinadlar tam göstərilməlidir. Məsələn: http://www.journal.edu.az

6) Məqalədə son 5-10 ilin elmi məqalələrinə, monoqrafiyalarına və digər etibarlı mənbələrinə üstünlük verilməlidir.

7) Məqalə redaksiyaya 2 formada: ya elektron poçtla (*az.dili.edebiyyat@mail.ru*), ya da məqalə çap formasında müəllifinin özü tərəfindən təqdim edilməlidir. Orijinal nüsxədə müəllif(lər)in imzası vacibdir.

## Məqalələrin qəbul edilməsi və dərci

Təqdim edilən məqalələr redaksiyada nəzərdən keçirildikdən sonra oxunuş üçün (müəllifin adı gizli saxlanılmaqla) mütəxəssislərə göndərilir. Məqalə jurnalın profilinə uyğun olduğu təqdirdə və tələblərə cavab verərsə, çapa təqdim edilir. Müəllif istəsə, ona məqaləsinin qəbul edilməsi barədə sənəd verilə bilər. Məqalələr növbəlilik prinsipi ilə dərc edilir.

## Müəlliflik hüquqları

Jurnalda dərc edilən məqalələrdə müəlliflik hüququ qorunur və bu məqalələrin bütün nəşr hüquqları *«Azərbaycan dili və ədəbiyyat tədrisi»* jurnalına aiddir. Jurnalda çap edilmiş məqalələrin eyni ilə digər nəşrlərdə (məqalənin tezis şəklində dərc olunmuş variantı istisnadır) dərcinə yalnız redaksiyanın yazılı icazəsi, sitatların verilməsinə isə mənbə göstərilmək şərti ilə yol verilir. Əvvəllər çap olunmuş və ya çap olunmaq üçün başqa bir dövri nəşrə göndərilmiş əlyazmaların jurnala təqdim edilməsi müəlliflik etikasına ziddir. Yuxarıda göstərilən tələblərə cavab verməyən məqalələr qəbul edilmir. Dərc olunmuş məqaləyə görə müəllifə jurnalın bir nüsxəsinin verilməsi nəzərdə tutulur.

# FOR AUTHORS

*Requirements to the articles submitted for publication in «Teaching of Azerbaijani language and literature»*

## Content of articles

The articles should be devoted actual topics, meet the academic requirements of journal’s style and content and consist of “Abstract”, “Introduction” and “Conclusion”. The “Abstract” should mention the main aspects of the article, the “İntroduction” should contain a thesis that will assert the main argument. In the “Conclusion” the author should reinforce the importance of the main idea, emphasize his scientific contention and appreciate his topic in personally relevant ways, and it is notable to shine the scientific novelty and the benefits of the work and to offer suggestions and recommendations.

## Rules of preparing of articles and scope

1) The articles submitted for the editorial must meet the following requirements, including the conditions set out for the periodical scientific publications presented by the Higher Attestation Commission under the President of the Republic of Azerbaijan:

- ✓ Title of the article, author's name, surname, position, academic degree, name and address of the organization where he works, E-mail address and telephone number should be written on the title page of the article.
- ✓ Abstract (in Azerbaijani and English) should be approximately 70-120 words, with the same content.
- ✓ Keywords (in Azerbaijani and English) should consist of 3-5 words or phrases.

2) The text should be typed in Microsoft Word, A4 (210x297mm), Times New Roman — 12, interval – 1, 15, size 6-10 sheets.

3) The title and subheadings of the article should be written in bold, with only the first letter capitalized. Before and after the headline and subheadings, tables and figures (also equations and formulas), a single line spacing should be added. Pages should be numbered in the lower right corner.

4) The table and pictures must be named, and the name should be placed in the left hand corner above the table, and pictures name should be placed in the left-hand corner under picture.

5) There should be references to scientific sources related to the topic of the article, as well as the sources noted at the end in “used works” should be mentioned in the text as [Mammadov A. Baku, 2010] or [1, s.35], and finally numbered in alphabetical

order. If there is an online reference in the text, you should put an internet link below and number it from one. The information on each reference in the Literature List must be in full, accurate and the native language. The bibliographic description of the source should be based on its type (monograph, textbook, scientific article, etc.). The name of the article, report or thesis should be cited when referring to scientific articles, materials or theses of symposium, conference or other prestigious scientific events. All sources referenced in the text should be cited in the "Used Works or References" list, along with the page numbers, as specified in the following examples:

a) *References to books:* Adilov M.I., Hasanov I.C. (2012). Globalization and national spiritual values. Baku, "Science" p. 476

b) *References to journals:* Jafarov Y. (2020) Language features of social media. "Teaching the Azerbaijani language and literature". №1, Baku: East-West, p. 11-26.

c) *Reference to the articles in scientific events:* «End of a transitional period in Azerbaijan economy: analysis and conclusions. Problems of National Development Model Formation" (2010). Materials of the scientific-practical conference of the Republic. Baku: "East-West", p. 314-316.

d) *Dissertation thesis and abstracts*: Mammadov H.B. (2013) The Republic of Azerbaijan as an actor in contemporary international political processes. Doctoral dissertation abstract, Baku: "Science", 44 h.

e) *Copyright and Patents:* Aliev S.G., Jalalov K.Kh. A.S. 163514, USSR // B.I. 1988, No. 4, p.50 Langsam M., Savoca A. C.L. Pat. 4759776, USA, 1988.

f) *Internet pages* (references to web pages should be indicated in full): For example: http://www.journal.edu.az

6) The article should give preference to scientific materials, monographs and other reliable sources for the last 5-10 years.

7) The article should be submitted to the editorial office in two forms: by e-mail *(az.dili.edebiyyat@mail.ru)*, or in printed form by the author of the article. The original signature of the author is important.

**Acceptance and publication of articles**

After review, the presented article will be sent to experts (the author's name confidentiality is maintained) to be read out. If the article corresponds to the journal profile and meets the requirements, the printing is provided. If the author wishes, a document on his / her article acceptance may be issued. Articles are published on the principle of rotation.

**Copyright**

# К СВЕДЕНИЮ АВТОРОВ

*Технические требования к статьям опубликованным в журнале «Преподавание Азербайджанского языка и литературы»*

## Содержание статей

Статьи должны быть посвящены актуальным темам и соответствовать академическим требованиям в соответствии с содержанием и стилем журнала. Статьи должны состоять из *«Аннотация»* (Abstract), *«Введение»* (Introduction) и «*Заключение»* (Conclusion). В *«Аннотации»* должно указыватсья основные аспекты статьи, в *«Введение»* должно обосновываться актуальность темы, а *«Заключения»* должно основываться на характере области статьи. Важность приложения, научный вывод, сделанный автором, научная новизна работы, экономические выгоды и т. д. должны быть четко указано и должны быть выдвинуты предложение и рекомендации.

## Структура и правила составления статей

1) Статьи, представленные в редакцию, должны соответствовать следующим требованиям, в том числе условиям, установленным Высшей Аттестационной Комиссией при Президенте Азербайджанской Республики, для периодических научных публикаций:

   - ✓ На титульном листе статьи должны быть указаны название статьи, имя и фамилия, должность, ученая степень, название и адрес организации, адрес электронной почты и номер телефона автора.
   - ✓ Ключевые слова (на азербайджанском и английском языке) должны состоять из 3 - 5 слов или фраз.
   - ✓ Резюме (на азербайджанском и английском языке) должна составлять примерно 70-120 слов с одинаковым содержанием.

2) Текст статьи должен написан в программе Microsoft Word, A4 (210x297 мм), Times New Roman — 12, интервал — 1, 15, объем 6-10 страниц.

3) Названия статьи должен писаться с жирным шрифтом с большой буквой. До и после заголовка и подзаголовков, таблиц и рисунков (также уравнений и формул) должен быть выпущен один междустрочный интервал. Страницы должны располагаться последовательно в правом нижнем углу.

4) Таблицы и рисунки должны иметь имя и это имя для таблиц должен перемещаться над таблицей в левом углу, а для рисунков под рисунки в левом углу и последовательно пронумероваться.

5) Необходимые ссылки на научные источники, относящиеся к теме статьи, должны быть приведены в тексте как ссылки на «использованную литературу» в тексте [Мамедов А. Баку, 2010] или [1, s.35] и в конце должны быть упорядочены в алфавитном порядке. Если в тексте есть онлайн-ссылка на научную литературу, интернет-ссылка должна быть показана ниже, поставив 1. Информация по каждой ссылке в списке литературы должна быть полной, точной и на языке оригинала. Библиографическое описание справочного источника следует представить в зависимости от его типа (монография, учебник, научная статья и т). При ссылке научных статей, симпозиумов, конференций, тезисов и других престижных К сведению авторов требования к рукописям научных мероприятий следует указывать название статьи, отчета или тезиса. Все источники, на которые есть ссылки в тексте, должны быть включены в список «Использованная литература» вместе с номерами страниц в следующих примерах:

а) *Ссылки на книги:* Адилов М.И, Гасанов И.С. (2012). Глобализация и национальные духовные ценности. Баку, Наука. 476 с.

б) *Ссылка на журналы:* Керимова Ф. (2013). Необходимость использования современных методов обучения. Влияние реформирования контента на качество обучения. Азербайджанская школа. № 4, Баку: Эргунаш, стр.28-31.

в) *Ссылки на статьи в сборнике (конференция, симпозиум и т. д.):* «Конец переходного периода в экономике Азербайджана: анализ и итоги. Проблемы формирования модели национального развития». (2010). Материалы республиканской научно-практической конференции. Баку: Восток-Запад, стр.314-316.

г) *Диссертации и авторефераты:* Мамедов Х.Б. (2013) Азербайджанская Республика — современная международная политика как актер в процессе. Автобиография докторской диссертации, Баку: «Наука», стр.44.

д) *Авторские свидетельства и патенты:* Алиев С.Г., Джалалов К.Х. А.С. 163514, СССР. БИИ 1988, № 4, с.50 Langsam M., Savoca A. C.L. Патент 4759776,США,1988

e) *Ссылки на веб-страницы:* Ссылки на веб-страницы должны быть полностью показаны. Например: http://www.journal.edu.az

6) В статье предпочтение отдается научным статьям, монографиям и другим надежным источникам написанном последние 5-10 лет.

7) Статья должна быть представлена в редакцию в двух формах: либо по электронной почте ***(az.dili.edebiyyat@mail.ru)***, либо в печатном формате автором статьи. Подпись автора (ов) в оригинале обязательна.

**Прием и публикация статей**

Представленные статьи после ознокомлений в редакции отправляют (после того, как имя автора останется конфиденциальным) экспертам для прочтения. Если статья соответствует профилю журнала и требованиям, тогда предоставляется в печать. По желанию автора может быть выдан документ о его принятии статьи. Статьи публикуются по принципу очереди.

**Авторские права**

Авторские права на статьи, публикуемые в журнале защищены и все права на публикации этих статей принадлежит журналу *«Преподавание Азербайджанского языка и литературы».* Статьи, опубликованные в журнале, допускаются только с письменного разрешения редакции для других опубликованных публикаций (кроме статьи, опубликованной как тезис). А для использования цитатов можно только с одним условиям показать источника. Рукописи, отправленные для печати в другое периодическое издание или в раннем времени напечатанные в другом журнале подача в редакцию, противоречит этику авторов. Статьи, не соответствующие вышеуказанным требованиям, не принимаются. Для опубликования статьей предназначен представить автору одну копию журнала.

